# AZƏRBAYCAN MƏKTƏBİ

*Elmi-nəzəri, pedaqoji jurnal*

**2018**
**№ 1 (683)**
*(yanvar-fevral)*

**1924-cü ildən çıxır**

*Azərbaycan Respublikası Təhsil Nazirliyinin 5 may 1996-cı il tarixli Nizamnaməsi ilə təsdiq olunmuşdur.
Ədliyyə Nazirliyi üzrə dövlət qeydiyyatı № 11/3165*

*Redaksiyanın ünvanı:*
*Az1065, Bakı şəhəri,*
*Yasamal rayonu, Azad Mirzəyev küç., 236*

*Telefon/Faks*
*(012) 538-82-65*
*(012) 538-82-67*

*E-mail:*
*azarbaycan.maktabijurnali.24@mail.ru*

*Rekvizitlər:*
*Kapital Bankın Gənclik Filialı*
*h/h AZ83AIIB45810013441800004118*
*VÖEN: 9900003611*
*Bankın rekvizitləri:*
*Kod: 200189*
*m/hAZ37NABZ01350100000000001944*
*SWIFT: Bik AIIBAZ2X*

*Jurnal redaksiyada yığılıb səhifələnmiş, "Ərgünəş" FM-də (nəşriyyat-poliqrafiya müəssisəsində) çap olunmuşdur.*

**Təsisçi**
**Azərbaycan Respublikası Təhsil Nazirliyi**

**B U  N Ö M R Ə D Ə**

**LİSENZİYA № 022589**

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 538-82-65; 538-82-67**

**Redaksiyanın ünvanı: Bakı şəhəri, Yasamal rayonu, Azad Mirzəyev küç., 236. İndeks AZ 1065 Kağız formatı 70x108 1/16 Sifariş: 01**

**В этом номере**



**In this number**

# 2018-Cİ İLİN AZƏRBAYCAN RESPUBLİKASINDA “AZƏRBAYCAN XALQ CÜMHURİYYƏTİ İLİ” ELAN EDİLMƏSİ HAQQINDA AZƏRBAYCAN RESPUBLİKASI PREZİDENTİNİN SƏRƏNCAMI

1918-ci il mayın 28-də Azərbaycan xalqının həyatında misilsiz hadisə baş vermiş, Müsəlman Şərqində ilk parlamentli respublika olan Azərbaycan Xalq Cümhuriyyəti qurulmuşdur. Cəmi iki ilə yaxın yaşamış Azərbaycan Xalq Cümhuriyyəti zəngin dövlət quruculuğu təcrübəsi ilə milli dövlətçilik tarixində silinməz izlər qoymuş, xalqın qəlbində azadlıq və istiqlal duyğularını gücləndirməklə respublikanın gələcək müstəqilliyi üçün etibarlı zəmin hazırlamışdır.

2018-ci ildə Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 100-cü ildönümü tamam olur. Bu əlamətdar hadisənin dövlət səviyyəsində layiqincə qeyd edilməsi məqsədilə Azərbaycan Respublikası Prezidentinin “Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyi haqqında” 2017-ci il 16 may tarixli 2867 nömrəli Sərəncamına əsasən, Azərbaycan Respublikasının Nazirlər Kabinetinə müvafiq tədbirlər planının hazırlanıb həyata keçirilməsi tapşırılmışdır. Bu tədbirlərlə yanaşı, Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 100-cü ildönümü ilə əlaqədar ölkədə və ölkə xaricində silsilə tədbirlərin həyata keçirilməsi nəzərdə tutulmuşdur.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq qərara alıram:

2018-ci il Azərbaycan Respublikasında “Azərbaycan Xalq Cümhuriyyəti İli” elan edilsin.

**İlham Əliyev,**
***Azərbaycan Respublikasının Prezidenti***
***Bakı şəhəri,***
***10 yanvar 2018-ci il***



# AZƏRBAYCAN XALQ CÜMHURİYYƏTİNİN YÜZ İLLİK YUBİLEYİ AZƏRBAYCANÇILIQ İDEOLOGİYASININ TƏNTƏNƏSİDİR

**Nizami Cəfərov,**
***akademik, filologiya elmləri doktoru, professor, millət vəkili***

Prezident İlham Əliyevin Sərəncamına əsasən 2018-ci ilin "Azərbaycan Xalq Cümhuriyyəti İli" elan edilməsi cəmiyyətin bütün təbəqələri, xüsusən elmi ictimaiyyət arasında geniş əks-səda doğurub və böyük rəğbətlə qarşılanıb. Milli Məclisin deputatı, akademik Nizami Cəfərovun AZƏRTAC-a təqdim etdiyi analitik məqaləsində Prezidentin Sərəncamının tarixi əhəmiyyətindən bəhs olunur, Azərbaycan Xalq Cümhuriyyətinin yüz illik yubileyi fonunda azərbaycançılıq ideologiyasının formalaşması və inkişafı mərhələləri araşdırılır.

Azərbaycan Respublikası öz müstəqilliyinin iyirmi beş illiyindən sonra varisi olduğu Azərbaycan Xalq Cümhuriyyətinin yüz illiyini qeyd etməyə başlayıb, Azərbaycan Respublikasının Prezidentinin Sərəncamı ilə 2018-ci il "Azərbaycan Xalq Cümhuriyyəti İli" elan olunub.

Azərbaycançılıq ideologiyasının etnoqrafik kökləri Azərbaycan xalqının tarixinin təşəkkül dövrlərinə gedib çıxsa da, bu ideologiya XIX əsrin sonu, XX əsrin əvvəllərində formalaşıb, Azərbaycan Xalq Cümhuriyyəti illərində (1918-1920) isə ilk dəfə rəsmi şəkildə etiraf olunaraq, xalq kütlələri arasında yayılmağa başlayıb.

Məlum olduğu kimi, azərbaycançılıq ideologiyasının həm ictimai-siyasi baxımdan formalaşıb modelləşməsində, həm yeni yaranmış dövlətin məfkurəsi olaraq siyasi praktikaya tətbiqində, həm də kütləviləşməsində M.Ə.Rəsulzadənin xidmətləri kifayət qədər böyükdür. Lakin bu ideologiyanın təbii-etnoqrafik enerjisi o qədər güclü, xalqın sosial-siyasi, mədəni özünüifadə inersiyasının təzahürü baxımından o qədər vüsətli idi ki, birincisi, onu bir və ya bir neçə şəxsin istedadı (və intellekti) miqyasına sığışdırmaq imkan xaricindədir; ikincisi, XIX əsrin sonu, XX əsrin əvvəllərində onlarla elə görkəmli Azərbaycan ziyalıları yetişmişlər ki, azərbaycançılıq ideologiyasının formalaşmasını onların məfkurə mübarizələrindən kənarda təsəvvür etmək ümumən mümkün deyil və nəhayət, üçüncüsü, belə bir mühüm faktı da nəzərdən qaçırmaq olmaz ki, milli ideologiya axtarışı ehtiyacı XIX əsrin sonu, XX əsrin əvvəlləri Azərbaycan ictimai varlığının təbiətində, ruhunda idi.

Azərbaycançılıq ideologiyası XIX əsrin sonu, XX əsrin əvvəllərində formalaşdıqdan, yaxud təşəkkül tapdıqdan sonra bir əsrdən artıq mürəkkəb, ziddiyyətli, habelə mənsub olduğu xalqın iradəsini ifadə etdiyindən ardıcıl, davamlı bir təkamül yolu keçib. Bu təkamül yolunun, fikrimizcə, aşağıdakı mərhələləri var:

1) XX əsrin 20-ci, 30-cu illəri;

2) XX əsrin 30-cu illərinin sonlarından 80-ci illərinin ortalarına qədər;

3) XX əsrin 80-ci illərinin ortalarından

XXI əsrin ilk illərinə qədər;

4) XXI əsrin ilk illərindən etibarən…

Azərbaycançılıq ideologiyasının təkamülündə İlham Əliyev mərhələsi XXI əsrin ilk illərindən başlayır və bizim günlərdə həm inamla, böyük enerji ilə, həm də miqyasını genişləndirərək (və təkmilləşərək) davam edir.

Müşahidələr (və araşdırmalar) göstərir ki, müasir mərhələdə - İlham Əliyev mərhələsində azərbaycançılıq ideologiyasının təkamülünü bir sıra mühüm əlamətlər şərtləndirir ki, onlardan birincisi həmin ideologiyanın tarixinə (bu tarixin bütün yönlərilə obyektiv öyrənilib mənimsənilməsinə) elmi, ictimai-siyasi və mədəni marağın indiyə qədər görünməmiş bir şəkildə artmasıdır.

Bu gün ölkədəki iqtisadi, ictimai-siyasi və intellektual-mədəni şərait imkan verir ki, azərbaycançılıq ideologiyasının keçdiyi tarixi yol hərtərəfli, dərindən və geniş müzakirələr əsasında necə varsa, o cür araşdırılıb öyrənilsin, xüsusilə gənc nəslin Azərbaycan xalqını, Azərbaycan dövlətini müstəqilliyə gətirib çıxaran milli ideologiya, onun hansı müzakirələrdə, mübahisələrdə və münaqişələrdə formalaşdığı, eləcə də Əli bəy Hüseynzadə, Məhəmməd ağa Şahtaxtinski, Əhməd bəy Ağayev, Nəriman Nərimanov, Məhəmməd Əmin Rəsulzadə, Səmədağa Ağamalıoğlu, Səməd Vurğun, Mirzə İbrahimov, Rəsul Rza, Bəxtiyar Vahabzadə, Anar, Elçin kimi müxtəlif miqyaslı və mövqeli milli ideoloqların təfəkkür tərcümeyi-halları haqqında kifayət qədər aydın (və mükəmməl) təsəvvürləri olsun. Halbuki bu imkan əvvəlki mərhələlərdə ya yox idi, ya da müxtəlif səbəblər üzündən bu və ya digər dərəcədə məhdud olmuşdu.

Azərbaycan Prezidenti İlham Əliyevin 2014-cü il 21 yanvar tarixli Sərəncamı ilə “türk xalqlarının mədəni inteqrasiyasının məfkurə kimi təşəkkül tapmasında mühüm rol oynayan, müasir cəmiyyət quruculuğunda demokratik prinsiplərin ənənəvi dəyərlər zəminində bərqərar olmasının vacibliyini irəli sürən və müstəqil milli dövlətçiliyin nəzəri əsaslarının hazırlanmasında yaxından iştirak edən… görkəmli ictimai xadim” Əli bəy Hüseynzadənin 150 illik yubileyinin keçirilməsi müasir Azərbaycan dövlətçiliyinin (və Prezident İlham Əliyevin), ilk növbədə, milli ideologiyanın tarixinə münasibətinin göstəricisidir. Bu sözləri cənab Prezidentin bir sıra digər sərəncamları (xüsusilə, azərbaycançılıq ideologiyasının banilərindən biri olan, uzun illər adının çəkilməsi belə qadağan edilmiş Məhəmməd Əmin Rəsulzadənin yubileyinin keçirilməsi haqqındakı sərəncamı) barəsində də demək olar. Onların hər biri, bir tərəfdən, milli ideologiya klassiklərini geniş ictimai miqyasda tanıtmağa; ikinci tərəfdən, milli ictimai şüuru zənginləşdirməyə, onun polifoniyasını təmin etməyə; üçüncü tərəfdən isə, milli ideologiyanın köklərini, mənbələrini (və ümumən tarixini!) onun müasir təzahür texnologiyaları ilə üzvü vəhdətdə - bir bütöv halında təsəvvür eləməyə münbit (və rəsmi!) şərait yaradır.

Məlum olduğu kimi, istər təşəkkül dövründə, istərsə də müxtəlif təkamül mərhələlərində, xüsusilə XX əsrin 20-ci illərinin əvvəllərindən 70-ci illərinin əvvəllərinə, yəni Heydər Əliyev dövrünə qədər azərbaycançılıq ideologiyası həm ölkə daxilində, həm də ölkə xaricində (mühacirətdə) biri digərindən, demək olar ki, təcrid olunmuş halda fəaliyyət göstərib. Ölkə daxilində bu ideologiya get-gedə məhdudlaşdırılmış, hətta tamamilə unutdurulması üçün hər cür cəhdlər edilmiş, az-çox təzahürləri isə müxtəlif mənəvi-ideoloji istiqamətlərə (məsələn, liberal vətənpərvərlik) yönəldilməklə amorflaşdırılmış və ya “simasızlaşdırılmışdır”… Xaricdə (mühacirətdə) isə sosial bazası olmayan romantik

xəyallara çevrilmişdir… Bütün hallarda Azərbaycan xalqının milli ideallarının qarşısını həm adminstrativ (aqressiv!), həm diplomatik (aldatma!), həm də ekspressiv (şirnikləndirmə!) yolları ilə məhz sovet-sosialist ideologiyası kəsmiş, lakin milli idealları məhv etmək mümkün olmadığı kimi, milli ideologiyanı da sona qədər unutdurmaq, yaddaşlardan tamamilə silmək mümkün olmamışdır.

Azərbaycançılıq ideologiyasının təkamülündə İlham Əliyev mərhələsinin ikinci mühüm əlaməti Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevə, onun milli dövlət quruculuğu fəlsəfəsinə ölkə, eləcə də dünya miqyasında layiq olduğu bir ehtiramla, intellektual-analitik həssaslıqla yanaşılmasıdır. Bu, ona görə zəruridir ki, Heydər Əliyev azərbaycançılıq ideologiyasının bir-birindən əsaslı şəkildə fərqli olan təkamül mərhələlərinin lideri (müəllifi!) olmaqla yanaşı, bu gün davam edən mərhələsinin perspektivlərini də müəyyənləşdirib.

Heydər Əliyevin tarixi xidmətlərinin həm ölkə, həm də dünya miqyasında yüksək qiymətləndirilməsi, geniş təhlil (və təbliğ) olunması azərbaycançılıq ideologiyasının, Azərbaycan xalqının milli ideallarının təntənəsi deməkdir. Heç də təsadüfi deyil ki, bugünkü siyasi leksikonda "heydərəliyevçilik" anlayışı "azərbaycançılıq" anlayışının yeni tarixi şəraitdəki məzmununu (və mahiyyətini!) ifadə edir. İstər sovet dövründəki məlum (və mürəkkəb!) şərtlər daxilində, istərsə də müstəqillik dövrünün ondan heç də az mürəkkəb (və ziddiyyətli!) olmayan illərində ümummilli lider Azərbaycanı Azərbaycan və Azərbaycan xalqını Azərbaycan xalqı edəcək bütün milli mənəvi enerji mənbələrinin tam gücü ilə işləməsi üçün hər cür tədbirləri görməklə azərbaycançılıq ideologiyasını legitimləşdirə, reallaşdıra, beləliklə də, bu gün Azərbaycan Prezidenti İlham Əliyevin cəsarətlə (və qürurla!) "bizim siyasətimiz - bizim işimizdir" deməsinə əsas verə bildi.

Üçüncü mühüm əlamət, heç şübhəsiz, azərbaycançılıq ideologiyasının tərkib hissələri olan türkçülük, müsəlmançılıq və müasirliyin üzvi vəhdətdə, heç birinə digərindən daha böyük üstünlük vermədən, bir bütöv halında qəbul edilərək xalqın milli mənafeləri naminə həyata keçirilməsidir. Bu məsələ ona görə çox əhəmiyyətlidir ki, Azərbaycan xalqı müxtəlif tarixi dövrlərdə (azərbaycançılıq ideologiyasının təşəkkül tapıb formalaşdığı XIX əsrin sonu, XX əsrin əvvəllərindən başlayaraq) gah türkçülüyə, gah müsəlmançılığa, gah da müasirliyə əlahiddə üstünlük verilməsindən irəli gələn ictimai-siyasi problemlərlə üz-üzə dayanmağa məcbur olub. Bunun da mənfi nəticələrini, xüsusilə milli inteqrasiyasının, mütəşəkkilliyin süni olaraq pozulmasını, yaxud zəifləməsini tarix, yəqin ki, həmişəlik öz yaddaşına yazıb.

İlham Əliyevin siyasi-ideoloji fəaliyyətində türkçülük Azərbaycan xalqının öz mənşəyi etibarilə türk etnosundan yaranması həqiqətinin milli ictimai dərkindən başlayıb müasir türk dünyasının üzvi tərkib hissəsi olması, beynəlxalq aləmdə türk dünyasının ortaq maraqlarının cəsarətlə müdafiəsinə qədər gedir. Təsadüfi deyil ki, Azərbaycan Prezidenti türk dünyasının öndə gedən liderlərindən biri kimi böyük nüfuz sahibidir.

İslam (müsəlman) dünyasına mənsubluq da bugünkü Azərbaycanın həm mənəvi-mədəni, həm də ictimai-siyasi xarakterində bütün parlaqlığı ilə təzahür edir. İlham Əliyevin müsəlman xalqlarına qarşı müəyyən beynəlxalq dairələrdə aparılan mürtəce, antihumanist kampaniyalara dəfələrlə ən yüksək tribunalardan öz etirazını bildirməsi, Azərbaycanın bir nümunəvi müsəlman ölkəsi olaraq inkişafı buna sübutdur.

Eyni zamanda, bugünkü Azərbaycan xalqı dünyaya açıq, müasir dünyanın iqtisadi, sosial-siyasi və mədəni texnologiyalarını inamla mənimsəyən, onun (müasir dünyanın) qlobal idarəçiliyində get-gedə güclənən imkanları səviyyəsində iştirak edən xalqdır.

Türkçülük, müsəlmançılıq və müasirlik triadası bu gün Azərbaycanda klassik formulunda (və tipologiyasında) tətbiq edilməklə qalmayıb, mərhələnin (və dövrün) tələblərinə uyğun olaraq yaradıcılıqla yaşanır ki, bu da Azərbaycan dövlətinin yürütdüyü tarazlaşdırılmış, humanist və uzaqgörən (mövcud problemlərin tezliklə həllinə yönəlmiş perspektivli) siyasətin nəticəsidir.

Müxtəlif mədəniyyətlərə, dünyagörüşlərinə təmkinli dialoq əsasında hörmətlə yanaşılması, qloballaşan dünyanın çağırışlarına həssas, anlamlı münasibət, multikulturalizm azərbaycançılıq ideologiyasının təkamülündə İlham Əliyev mərhələsinin, fikrimizcə, mühüm əlamətlərindən dördüncüsü hesab oluna bilər. Nə üçün? Ona görə ki, hər hansı ideologiya, nə qədər mütərəqqi olsa da, özünü təcrid edirsə, həm tarixi (passiv), həm müasir (aktiv), həm də gələcək (perspektiv) çox müxtəlif (biri digərini inkar, yaxud təsdiq edən, yaxud da bir-birinə loyal və ya liberal münasibətlərdə olan) ideologiyalarla hesablaşmazsa, prinsip etibarilə, yaşaya bilməz.

Azərbaycan xalqı (və dövlətçiliyi) tərəfindən azərbaycançılıq ideologiyasının tətbiqi, müdafiəsi və inkişaf etdirilib təkmilləşdirilməsi dünya miqyasında çox müxtəlif (və qaynar!) ideoloji proseslər kontekstində baş verdiyi hamıya məlumdur. Bu proseslər azərbaycançılığı birmənalı inkar edə bilmədiyi kimi, birmənalı təsdiq də edə bilməz. Lakin Azərbaycan xalqının milli ideologiyasının nəinki danılmaz, hətta mübahisəsiz bir üstünlüyü var ki, onun mahiyyətində (fəlsəfəsində və ya metafizikasında) üç tamamilə humanist (və insan cəmiyyətinin təhtəlşüur, yaxud təbii bir şəkildə, “müdaxiləsiz” yaratdığı!) dəyər komponenti ifadə olunur:

1) etnik mənsubiyyət;
2) dini mənsubiyyət;
3) dünyəvi mənsubiyyət.

Bu ideologiyada öz əksini tapmış fəlsəfə və ya metafizikada, eləcə də onun mənsub olduğu (və onu yaradan) xalqın təfəkküründə nə etnik məhdudluq, nə dini dözümsüzlük, nə də antihumanizm yoxdur; yalnız o var ki, Azərbaycan xalqı da, dünyanın bütün digər xalqları kimi, müəyyən bir etnik mənşəyə, müəyyən bir dini dünyagörüşə mənsubdur və bütün digər xalqlar kimi, müasir dünyanın üzvi tərkib hissəsidir…

Beşinci əlamət Azərbaycan xalqının dünya miqyasında milli-mənəvi, mədəni bütövlüyünün möhkəmlənməsi üçün ardıcıl mübarizə aparılmasıdır ki, bunun müsbət nəticələrini görməmək mümkün deyil.

Tarixi taleləri elə gətirmişdir ki, azərbaycanlıların və ya Azərbaycan türklərinin bu gün yalnız beşdən biri müstəqil Azərbaycan Respublikasının vətəndaşıdır. Təxmini hesablamalara görə, dünya azərbaycanlılarının beşdən dördü öz tarixi Vətənində yüz (hətta min!) illərlə necə məskun olmuşdursa, bu gün də məskundur… Ona görə də əsası ümummilli lider Heydər Əliyev tərəfindən qoyulmuş bir siyasətin - Dünya azərbaycanlılarının həmrəyliyinin miqyasının genişləndirilməsi siyasətinin müasir mərhələdə Azərbaycan dövlətçiliyi tərəfindən uğurla davam etdirilməsi heç bir alternativ qəbul etməyən bir zərurət olub azərbaycançılıq ideologiyasını zənginləşdirən, ona güclü enerji verən, onun məzmununu (hətta fəlsəfəsini) bütövləşdirən konseptual hadisədir. Hər şeydən əvvəl ona görə ki, dünyanın harasında məskunlaşmasından asılı olmayaraq, kiçik istisnaları nəzərə almasaq, azərbaycanlılar eyni etnik mənşəyə, eyni dinə

mənsub olub eyni mental xüsusiyyətlərin, eyni adət-ənənələrin daşıyıcısıdırlar. Onların eyni bir dilləri - Azərbaycan dili, yaxud Azərbaycan türkcəsi mövcuddur…

Əlbəttə, qloballaşan müasir dünyada azərbaycanlıların siyasi-inzibati sərhədləri aşaraq bir-birləri ilə sıx ünsiyyətə girmələri, ümummilli maraqlarını humanizm, beynəlxalq insan hüquqları prinsipi çərçivəsində təmin etmələri yalnız milli yox, həm də insani (ümumbəşəri!) bir ehtiyacdır ki, əlahiddə hadisə olmayıb bütün millətə xasdır…

Azərbaycan xalqının (və insanının) dünyanın inkişaf etmiş xalqları (və insanları) ilə müqayisədə ikinci, hətta üçüncü dərəcəli olması kompleksinin sürətlə aradan qaldırılması baxımından görülən işlərə (və onun uğurlu nəticələrinə), fikrimizcə, altıncı əlamət kimi baxmaq olar.

Etiraf etməliyik ki, azərbaycanlılarda uzun on illər (hətta əsrlər!) belə bir kompleks olmuşdur. Ziyalıların öz ana dillərindən (və prinsip etibarilə, mənsub olduqları xalqdan) imtina edib müxtəlif əcnəbi dillərdə danışıb yazmaları, özlərinə əcnəbi soyad formaları qəbul etmələri və s. həmin "gerilik" kompleksinin təzahürləri (və nəticələri) idi ki, milli tarixin son mərhələsinə qədər bu və ya digər dərəcədə davam edirdi… Ancaq bu gün heç bir azərbaycanlı özünü nə bir rusdan, nə bir almandan, nə bir fransızdan, nə də bir ingilisdən aşağı hesab etmir və milli qürur yalnız sözdə deyil, həm də işdə, əməldədir. Ölkədə abadlaşan, "yeni rəmzlər"ini yaradan şəhərlər (xüsusilə Bakı!), kəndlər, çəkilən yollar, yaradılan təhsil müəssisələri, tətbiq edilən müasir idarəçilik texnologiyaları, dünya standartları ilə müqayisə olunan müxtəlif təsisatlar, idmanda, mədəniyyətdə indiyə qədər bu miqyasda görünməmiş beynəlxalq uğurlar Azərbaycan insanını mənən, ruhən yüksəldən, əgər belə demək mümkünsə, onun katarsisini təmin edən elə hadisələrdir ki, yalnız bu günlə məhdudlaşmayıb onun (Azərbaycan insanının) gələcək taleyini, xarakterini müəyyən edir. Bu taleyüklü işlər, əməllər Azərbaycan xalqının tarixində həmişəlik olaraq İlham Əliyevin adı ilə qalacaqdır…

Azərbaycançılıq ideologiyasının təkamülündə İlham Əliyev mərhələsinin yeddinci əlaməti həm iqtisadi, həm siyasi, həm də mədəni sahələrdə (bu sahələrin təsəvvürə gətirilməsi belə çətin olan çox geniş spektrində) beynəlxalq əlaqələrin, başqa sözlə, Azərbaycan-Dünya dialoqunun zəngin təcrübəsinin qazanılmasıdır. Bu isə, ilk növbədə, o deməkdir ki, azərbaycançılıq ideologiyası (və Azərbaycan xalqının milli idealları), bir vaxtlar olduğu kimi, məhdud bir miqyasda qalıb, "özümüz deyib, özümüz eşidək" prinsipi ilə mövcud olmur, universallaşır, hüdudlarını genişləndirir, ümumən insan (və dünya) təfəkkürü mövqeyindən görünüb etiraf olunur… Tarixi (və cari) rəqibləri açıq mübarizəyə çəkir, onların hansısa gizli "laboratoriyalar"da hazırlanmış məkrli planlarını alt-üst edir.

Beynəlxalq "Dialoq"lara ev sahibliyi edən Azərbaycan indiyə qədər görünməmiş bir miqyasda müxtəlif ideyaların, ideologiyaların həmsöhbət olmasına inamla münsiflik etdikcə, azərbaycançılıq məfkurəsi də zənginləşir, beynəlxalq nüfuzunu gücləndirir, yüksək standartlı paradiqmalara yiyələnir…

Səkkizinci əlamət Azərbaycan xalqının intellektual səviyyəsinin yüksəldilməsi, müasir texnologiyalara yiyələnməsinin sürətlənməsi, perspektivli özünüifadə (və özünütəsdiq) metodlarının, üsullarının və vərdişlərinin xüsusilə gənc nəsil tərəfindən mənimsənilməsidir. Etiraf etmək lazımdır ki, azərbaycançılıq ideologiyasının gənc nəsil tərəfindən bu qədər kütləvi (və intellektual!)

səviyyədə mənimsənilməsi heç bir mərhələdə mümkün olmayıb…

Azərbaycanın regionda, ümumən beynəlxalq aləmdə söz sahibi olması, onun mövqeyi ilə hesablaşılması, çoxstandartlılığı, xüsusilə cari konyukturluluğu ilə tanınan dünyanın “haqq-hesab”ından kənarda qalıb təcrid olunmaması, çox güman ki, doqquzuncu əlamətdir. Bu əlamətin özünəməxsusluğu ondan ibarətdir ki, Azərbaycan xalqının milli ideologiyası çevik, elastik, diplomatik resurslara yiyələnmiş, hər hansı “gözlənilməz” ideoloji hücumlara qarşı müqavimət (hətta əks-hücum) “immunitetlər”i qazanmışdır…

Nəhayət, Azərbaycançılıq ideologiyasının təkamülündə İlham Əliyev mərhələsinin onuncu əlaməti həmin ideologiyanın inkişafı üçün geniş perspektivlər təmin etməsidir ki, bu, milli ideologiyanın (azərbaycançılığın) gələcəyi barədə tamamilə nikbin fikirdə olmağa hər cür imkanlar verir. Xüsusilə o mənada ki, azərbaycançılıq ideologiyası qarşısında bu gün polemika üçün hüdudlar qoyacaq heç bir maneə, yaxud həmin ideologiyanın təkamülünü ya ləngidəcək, ya da süni şəkildə sürətləndirəcək heç bir konyuktur müdaxilə yoxdur.

Azərbaycançılıq ideologiyasının təkamülündə İlham Əliyev mərhələsi özünəməxsus dinamizmi ilə zənginləşməkdə, milli ictimai şüurun əsaslarını müəyyənləşdirməkdə və Azərbaycan xalqının dünya birliyindəki mövqelərini inamla yüksəltməkdədir. Odur ki, Azərbaycan Xalq Cümhuriyyətinin yüz illik yubileyi Azərbaycan xalqının (və dövlətinin) tarixinin elə bir dövründə keçirilir ki, ən azından üç baxımdan xüsusi (tarixi!) məna-məzmun kəsb edir:

1) Azərbaycan Xalq Cümhuriyyətinin “tərcümeyi-hal”ı, son illərdə demək olar ki, bütün tərəfləri ilə dərindən öyrənilmiş, onun güclü (və “zəif”) cəhətləri konkret sənəd və materiallar əsasında Azərbaycan tarixçiləri tərəfindən obyektiv araşdırılmış, dünya tarixşünaslığında bu barədə kifayət qədər aydın təsəvvür formalaşmışdır;

2) müstəqil Azərbaycan Respublikası Azərbaycan Xalq Cümhuriyyətini özünün hüquqi-tarixi varisi elan etdiyindən, eləcə də Cümhuriyyət tarixi hərtərəfli öyrənildiyindən o, milli ictimai təfəkkürün yaddaş potensialının üzvi tərkib hissəsinə çevrilmiş, hər bir Azərbaycan vətəndaşının qürur mənbəyi olmuşdur;

3) ən başlıcası isə odur ki, Azərbaycan xalqı (və dövləti) Xalq Cümhuriyyətinin yubileyini həm iqtisadi, həm siyasi, həm də mədəni inkişaf sahələrində həmin Cümhuriyyətin ideallarına layiq səviyyədə böyük uğurlarla qeyd etməklə milli azadlıq və dövlət müstəqilliyi uğrunda mübarizənin necə bir etibarlı varisi olduğunu, bu mübarizənin hansı mükəmməl nailiyyətlərə gətirib çıxardığını bir daha bütün miqyası ilə göstərir.

İnamla demək olar ki, Azərbaycan Xalq Cümhuriyyətinin yüz illik yubileyi müstəqil Azərbaycanı yaradıb inkişaf etdirmiş qüdrətli bir məfkurənin - azərbaycançılıq ideologiyasının həm ölkə daxilində, həm də onun hüdudlarından çox-çox uzaqlarda təntənəsidir.



# TƏBİİ-ELMİ BİLİKLƏR SİSTEMİNDƏ SİMMETRİYANIN YERİ VƏ ROLU



**Əziz Məmmədov,**
***fəlsəfə üzrə elmlər doktoru,***
***Bakı Dövlət Universitetinin professoru***

**İsa İsmayılov,**
***pedaqogika üzrə elmlər doktoru,***
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin professoru***

Təqdim edilən bu məqalədə əsas məqsəd simmetriya prinsipini iki istiqamətdə araşdırmaqdır. Məqalədə bu istiqamətlərin birində müasir elmi versiyalara əsasən simmetriya anlayışının mənası acıqlanır, onun həndəsi və dinamik, güzgü və uyğunlaşma növləri öyrənilir. İkinci istiqamət simmetriya prinsipləri ilə mikroaləmdə təzahür edən simmetriya prinsipləri arasındakı dialektik əlaqələr tədqiqata cəlb edilir.

***Açar sözlər:*** *simmetriya, simmetrik fiqurlar, simmetriya müstəvisi, simmetriya oxu, simmetriya mərkəzi, simmetriya dərəcəsi, həndəsi (xarici), dinamik (daxili), uyğunlaşma, güzgü simmetriyası, fiziki.*

***Ключевые слова:*** *симметрия, симметричные фигуры, плоскость симметрии, ось симметрии, центр симметрии, степень симметрии, геометрическая (внешняя), динамическая (внутренняя), адаптация, зеркальная симметрия, физическое.*

***Key words:*** *symmetry, symmetrical figures, the plane of symmetry, arrow of symmetry, center of symmetry, degree of symmetry, geometric (external), dynamic (internal), adaptation, mirror, physical.*

Təbii-elmi fikrin, o cümlədən, fizika, riyaziyyat, kimya, biologiya, mineralogiya və digər elmlərin də inkişafında mühüm əhəmiyyət kəsb edən, sistemli təhlili fəlsəfi təfəkkürün yüksələn xətlə irəliləyişinə təkan verən simmetriya anlayışının və simmetriya prinsipləri ilə saxlanma qanunlarının qarşılıqlı əlaqəsinin məntiqi - qnesoloji təhlili xüsusi əhəmiyyət kəsb edir.

Elmi araşdırmalarda simmetriya prinsipləri müxtəlif müstəvilərdə təhlil edilmiş, bu problemin səmərəli həllinə qatılan elmlər, anlayışın müxtəlif ənənələrini öyrənmişlər.

Simmetriya kateqoriyası fizika elmindən də yan ötməmiş, daima diqqət mərkəzində duraraq, mikro və makro-aləmdəki təzahürlərinin öyrənilməsinə, yeni ideyaların, bir sıra hallarda isə fundamental nəzəriyyələrin irəli sürülməsinə təkan vermişdir. Simmetriya prinsipləri ilə saxlanma qanunlarının əlaqəsinin öyrənilməsində fizika elminin xidmətləri, xüsusi qeyd olunmalıdır.

İnsan yaradıcılığının çoxəsrlik tarixindən keçib yaşadığımız günlərdə ümumelmi anlayış kimi formalaşan və buna görə də geniş əhatə dairəsinə, tətbiqi imkanlara malik olan simmetriya anlayışına müəlliflərin müraciəti, heç də təsadüfi deyil. Adı

çəkilən anlayışa maraq, əvvəla, belə bir səbəbdən irəli gəlir ki, fiziki biliklərin inkişafında simmetriya prinsipi dəyişilməz və amorf qalmayıb, özü də bu dinamik inkişafa qatılaraq, durmadan təkmilləşir və məzmunca zənginləşir. Buna görə də simmetriya anlayışının dialektik inkişaf prosesində öyrənilməsi mühüm idraki əhəmiyyət kəsb edir. Məqalədə simmetriya probleminə müraciət edilməsinin digər bir səbəbi də fizikada simmetriya prinsipləri ilə saxlanma qanunlarının daxili əlaqəsinin yeni elmi məcraya keçirilməsi, yeni kontekstdə öyrənilməsi zərurəti ilə bağlıdır. Nəhayət, müasir dövrdə simmetriya probleminin öyrənilməsinə yaranan səbəblər spektrinə belə bir səbəbi də əlavə etmək lazım gəlir ki, məhz bu problem müasir fizikanın, xüsusilə, elementar hissəciklər nəzəriyyəsinin həlli bu vaxtadək qarşılıqlı görünən bir sıra mürəkkəb məsələlərin həllinə aparan rasional yolun tapılmasına imkan verəcəkdir.

Simmetriya anlayışının müxtəlif aspektlərinin tədqiqinə istər fəlsəfi, istərsə də təbii-elmi xarakterli külli miqdarda işlər həsr olunmuşdur. Aparılmış tədqiqatlar fonunda idrakın rolu müxtəlif diapozonlarda öyrənilmiş, bu anlayış bir tərəfdən universallaşdırılaraq ən ümumi fəlsəfi kateqoriyalar səviyyəsinə qaldırılmış, digər tərəfdən özünü doğrultmayan kiçildilmələrə uğradılaraq konkret elmlərin, o cümlədən fizikanın, riyaziyyatın, kristalloqrafiyanın sıravi anlayışları sırasına keçirilmişdir. Buna görə də simmetriya anlayışının dərin fəlsəfi-nəzəri təhlilini verməzdən əvvəl onun kateqorial statusunu müəyyənləşdirməyi, təbii elmi idrak, o cümlədən fizikanın prinsip və qanunlarının formula edilməsində müəyyənedici rolunu və nəzəri - idraki əhəmiyyətini açıqlamağı vacib sayırıq.

Məlum olduğu kimi, son 20-30 ildə fəlsəfədə qanun və kateqoriyaların təhlilinə maraq xeyli artmış, elmdə güclü abstraksiyalar aparılması, insan biliklərinin idrak obyektinin qanunauyğunluqlarını getdikcə daha adekvat əks etdirməsi, idraki prosesdə obyekt və subyektin bir-birinə daha çox yaxınlaşması, tamlıq prinsipinin müasir elmin paradiqmalarından birinə çevrilməsi ilə əlaqədar olaraq konkret elmi idrak üçün dialektikanın prinsip, qanun və kateqoriyalarının metodoloji rolu da xeyli yüksəlmişdir. Buna görə də kateqoriyalar haqqında təlim istər postsovet respublikalarında, istərsə də müasir qərb ölkələrində intensiv və ekstensiv inkişaf etdirilməkdədir. Bu kontekstdə müasir elmin inkişafı, bir tərəfdən yeni anlayışların formalaşması, digər tərəfdən, elmə artıq çoxdan məlum olan anlayışların məzmunca zənginləşərək öz tətbiq hüdudlarını genişləndirməsi ilə səciyyələnir. Müasir elmdə müstəsna əhəmiyyət kəsb etməklə bir sıra fundamental tədqiqatlara təkan verən və bütövlükdə onun inkişaf dinamikasını, idraki orientasiyalarını istiqamətləndirən belə anlayışlardan biri "Simmetriya" anlayışıdır. Antik incəsənətin dərinliklərində yaranıb, sonradan riyaziyyata nüfuz edərək fizikada da qabaqcıl mövqe tutmuş simmetriya ideyaları hazırda geniş elmi status qazanaraq müasir elmi idrakın, o cümlədən, fizikanın inkişafında evristik rol oynamağa başlamışdır. Heç bir mübaliğə və metaforaya yol vermədən hökm edə bilərik ki, keçən əsrdə fizikanın inkişafı və müstəsna uğurları onun müxtəlif sahələrində fiziki təlimlərə sadəlik və daxili gözəllik verən, hətta bir sıra hallarda fiziki nəzəriyyələrin həqiqiliyinin məhək daşı rolu oynayan simmetriya prinsiplərinin geniş tətbiq tapması ilə səciyyələnir. Elmi idrakın inkişaf praktikası sübut edir ki, fiziki

sistemlərin tədqiqi, xüsusilə, o hallarda faydalı və səmərəli olur ki, təbii proseslərin kəşf olunan xassə və qanunauyğunluqlarını müəyyən simmetriya prinsipləri formasında ifadə etmək mümkün olmuş olsun.

Simmetriya real məkanın mühüm xarakteristikalarından biridir. "Simmetriya" yunan sözü olub, etimoloji baxımdan bircinlilik, mütənasiblik, ahəngdarlıq, harmoniya mənasına uyğun gəlir. Bu anlayışın sadə təzahürlərinə hər yerdə: təbiət də, cəmiyyətdə, texnikada, incəsənətdə, elmdə rast gəlmək mümkündür. Buna inanmaq üçün kəpənəyin və ağcaqayın ağacının yarpaqlarının simmetriyasını, avtomobil və təyyarənin formasındakı harmoniyanı, şeirin ritmik quruluşunda və musiqi sədalarında olan ahəngi, ornament və gəbələrdəki bağlılığı, molekul və kristalların atom strukturlarındakı simmetriyanı və s. xatırlamaq yetərlidir.

Simmetriya anlayışı zəmanəmizə insan yaradıcılığının bütün çoxəsrlik tarixindən keçərək gəlib çatmışdır. İnsan biliklərinin bütün qaynaqlarında rast gəlinən bu anlayışdan müasir elmin bütün istiqamətlərində istisnasız olaraq geniş istifadə olunması onun ümumelmi anlayışlar səviyyəsindən çıxaraq fəlsəfi status qazanmasından şəhadət verir.

Simmetriya prinsipləri fizika və riyaziyyatda, kimya və biologiyada, texnika və arxitekturada, rəssamlıqda və heykəltaraşlıqda, poeziya və musiqidə mühüm və evristik rol oynayır. Tükənməz rəngarəngliyi ilə dünya mənzərələrini idarə edən təbiət qanunları da öz növbəsində simmetriya prinsiplərinə tabe olub, onları canlı və cansız təbiətdə, materiya strukturunun mikro, makro və meqa səviyyələrində təzahür etdirir.

Sistemli tədqiqinə keçən əsrin ikinci yarısından etibarən başlanan simmetriya anlayışı haqqında ilk sadəlövh təsəvvürlərə hələ antik naturfilosofların təbiət haqqında təlimlərində, qədim astronomların kainatın harmoniyasını öyrənən konsepsiyalarında, ədədlər haqqında Pifaqor nəzəriyyəsində və Evklid həndəsəsinin quraşdırmalarında rast gəlinir. Təsadüfi deyildir ki, riyaziyyat, memarlıq və incəsənətdə simmetriya anlayışına mühüm nəzəri - praktik əhəmiyyət verən qədim yunan filosofları insanın müşahidə qavrayışları üçün gözəlliyin məhz obyektlərin müxtəlif hissələrinin simmetriyası və harmoniyası ilə yaradıldığını söyləyir və bununla da onun idraki rolunu açıqlamağa çalışırdılar.

Gündəlik həyatda simmetriya anlayışı iki mənada işlədilir. Birinci mənada o, mütənasiblik ifadə etməklə sistemin müxtəlif hissələrinin bir tam halında birləşməsi üsulunu göstərir; ikinci mənada isə simmetriya sözü tarazlıq bildirir.

Simmetriya anlayışının mahiyyətini başa düşmək üçün, hər şeydən əvvəl, məkanın təbiətən ziddiyyətli olub, dəyişkənlik və müvazinət, arasıkəsilməzlik və arasıkəsilənlik kimi əksliklərin vəhdətindən təşkil olunduğunu nəzərə almaq lazımdır. Bu halda dəyişkənlik tərəfi "məkanın xassələrində mövcud hadisələrin əlaqə növlərinin dəyişməsi, hər bir əlaqə növünün məhdudluğu, məkanın strukturu kimi, məkanın müvazinəti və sabitliyi isə "cismin mövcudluğunun, dayanaqlığının, struktur elementlərinin düzülüş qanunauyğunluqlarını əks etdirən yertutumu formasında təzahür edir".

İndi isə məkanın hansı hissələrinin simmetrik olduğunu gəstərmək məqsədilə bir anlığa "boş", yəni daxilində heç bir maddə

hissəciklərin və fiziki sahənin olmadığı məkan təsəvvür edək. Əgər bu məkanın sonlu hissəsinin müstəvi vasitəsilə iki bərabər hissəyə bölündüyünü fərz etsək, onları simmetrik hissələr kimi qəbul etmək olar. Halbuki, ixtiyari üsulla iki simmetrik hissəyə bölünə bilən abstrakt, “boş” məkandan fərqli olaraq, materiyanın daxili, universal xassəsi, obyektiv varlıq forması kimi başa düşülən real məkan üçün belə bir bölünmə əməliyyatı ixtiyari üsulla aparıla bilməz: real məkanın sonlu hissəsi yalnız o halda simmetrik hissələrə bölünə bilər ki, onun həcmini eyni keyfiyyətli bircinsli cisimlər doldurmuş olsun. Belə cisimlər toplusu isə müvazinət yaradaraq dinamik tarazlıqlı sistem təşkil edəcəklər. Əgər bu sistemin struktur elementləri və daxili prosesləri tarazlaşmamış və bir-birinə uyğunlaşmamışdırsa, belə sistem dayanıqlı olmayacaqdır. Yox, əgər dinamik tarazlıqlı sistem özü dayanaqlıdırsa, bu halda onun potensial enerjisi minimum onun bərabər hissələri və müvafiq məkan münasibətləri ilə (yertutumu və strukturu) tarazlaşacaqdır. Buna görə də biz, ümumi halda simmetriyaya “sistemin dayanıqlığını təmin edən fiziki qüvvələrin ifadəsi” kimi baxa bilərik. Həm də bu fikrə söykənərək hökm edə bilərik ki, simmetriya dayanıqlı tarazlığa malik sistemlərin əks hissələrinin və əks proseslərinin daxili tarazlığının təzahür formasıdır. Bu mənada başa düşülən simmetriya sistemin ehtiva etdiyi əksliklərin nisbi bərabərliyi, sistem daxilində onların tarazlaşması deməkdir. Nəzərə almaq lazımdır ki, maddi sistemlərin dinamik tarazlığının əsasını məhz bu əksliklərin nisbi bərabərliyi təşkil edir. Bu əksliklərin sırasına isə əvvəla, maddi sistemlərin qarşı-qarşıya duran əks hissələri, ikincisi, sistemdə əks istiqamətlərdə cərəyan edən proseslər daxildir. Sistemdaxili elementlərin bu bölgüsü ilə əlaqədar olaraq müasir fizikada simmetriyanın iki növü: həndəsi (xarici) və dinamik (daxili) formaları fərqləndirilir.

Məkanın topoloji xassələrinin ifadəsi olan bircinslilik, izotropluq, cütlük, inersial sistemlərin ekvivalentliyi, zamanın isə bircinsliliyi simmetriyanın həndəsi formasına aid hadisələrdir. Sistemin əks hissələrinin həcmi bərabərliyi kimi təzahür edən həndəsi simmetriyaya kristalların simmetriyasını, bitki və heyvan hissələrinin yerləşməsində reallaşan simmetriyanı da misal göstərmək olar. Sistemin qarşı-qarşıya duran əks hissələrinin həcmi bərabərliyi məkan simmetriyasının yalnız xarici ifadəsi olub, riyaziyyat və kristalloqrafiyada öyrənilir. Bu elmlərdə yalnız bərabər həcmli hissələri eyni cür yerləşən və simmetriya dərəcələri həmin hissələrin sayı ilə müəyyən olunan obyektlər simmetrik hesab olunur. Simmerik fiqurlar “simmetriya müstəvisi”, “simmetriya oxu”, “simmetriya mərkəzi”, “simmetriya dərəcəsi” və s. anlayışlarla xarakterizə olunur. Bu baxımdan, kürə təbiətdə simmetriya dərəcəsi ən yüksək olan cisim hesab olunur.

Yuxarıda qeyd etdik ki, simmetriya termini bir tərəfdən onların əks hissələrinin, digər tərəfdən əks proseslərinin bərabərliyini ehtiva edir. Sistemin daxilində cərəyan edərkən onun dinamik tarazlığına xələl gətirməyən əks proseslərin simmetriyası daxili və yaxud dinamik simmetriya adlanır. Bilavasitə məkan və zamanın xassələri ilə bağlı olan həndəsi simmetriyadan fərqli olaraq, fiziki qarşılıqlı təsirləri (qravitasiya, elektromaqnit, güclü, zəif qarşılıqlı təsir) ifadə edən dinamik simmetriya bir sıra elmlərdə öyrənilir. Məsələn, fizika-cazibə və itələmənin, mərkəzəqaçma və mərkəzdənqaçma qüvvələrinin, buxarlanma və kondensasiyanın, kimya - assosiasiya və dissosiasiyanın, fiziologiya - oyanma və ləngimənin,

biologiya - assimlyasiya və dissimlyasiyanın bərabərliyini, yəni dinamik simmetriyasını öyrənir.

Simmetriyanın təbiəti və tipləri haqqında yuxarıda deyilənləri yekunlaşdırıb belə bir qənaəti ifadə edə bilərik ki, təbiətdə prinsip etibarilə iki qrup simmetriya mövcuddur. Birinci qrupa (həndəsi simmetriya) vəziyyət, forma və strukrur daxildir. Bu simmetriyalar bilavasitə vizual müşahidə olunan, görünən simmetriyalardır. İkinci qrupa (dinamik simmetriya) isə fiziki hadisələri və təbiət qanunlarını xarakterizə edən simmetriyalar daxildir. Bu dünyanın təbii-elmi mənzərəsinin əsasında yerləşən simmetriyadır.

Simmetriyanın həndəsi və dinamik növləri haqqında yuxarıda vurğuladığımız fikirləri məşhur amerikan alimi C.Nyumanın aşağıdakı sözləri ilə yekunlaşdırmaq istərdik: "Simmetriya zahirən hər cür əlaqədən kənar görünən yer maqnetizminin, qadın duvağının, polyarlaşdırılmış işığın, təbii seçmənin, qrup nəzəriyyəsinin, invariantların və çevrilmələrin, şan hazırlayan arıların işləmək vərdişlərinin, məkan quruluşunun, vaza üzərindəki şəkillərin, kvant fizikasının, gül ləçəklərinin, rentgen şüalarının interferinsiya mənzərəsinin, Roma kilsələrinin, qar dənəciklərinin, musiqinin, nisbilik nəzəriyyəsinin son dərəcə maraqlı və qəribə görünən qohumluq münasibətlərini müəyyənləşdirir".

Maddi sistemlərin istər əks hissələrinin, istərsə də əks proseslərinin simmetriyası ikili xarakter daşıdığından müasir simmetriya nəzəriyyəsində onun daha iki növü - "uyğunlaşma" və "güzgü" simmetriyalar da bir-birindən fərqləndirilir. Əgər sistemlərin əks hissələrinin və əks proseslərinin orientasiyaları eyni, işarə və istiqamətləri də fərqlənmirsə, belə hissələr və proseslər bərabər, onların simmetriyası isə "uyğunlaşma" simmetriyası adlanır. Məsələn, gülün "düzgün" ləçəklərinin simmetriyası. Belə ki, gül ləçəklərinin məkan orientasiyaları eyni olduğundan, çiçək kasacığının öz oxu ətrafında fırlanması ilə onlar tamamilə üst-üstə düşə bilirlər.

Simmetriyanın təbiətdə təzahür edən digər bir növü güzgü simmetriyasıdır. Əks hissələrinin və əks proseslərinin məkan orientasiyaları müxtəlif, hissələrinin işarə və istiqamətləri bir-birinə əks olan sistemlərin simmetriyası güzgü simmetriyası adlanır. Gerçəklikdə güzgü simmetriyalı çoxlu cisim və proses mövcuddur. Məsələn, insanın sağ və sol əli, canlı orqanizmlərdə sintez və dağılma prosesləri, dielektriklərdə naqil və naqillərdə dielektrik, elektron və pozitron və s. bu qəbildən olan simmetriyalardır. Akad. A.B.Şubnikov təbiətin güzgü simmetriyasını belə səciyyələndirir: "İki güzgüvari bərabər fiquru müqayisə etdikdə məlum olur ki, bu fiqurların müşahidə olunan oxşarlığı eynilə onların bəzi əks xassələrinin oxşarlığı kimidir. Sağ və solun oxşarlığı tamamilə müsbət və mənfinin oxşarlığına bənzəyir. Bu oxşarlığı ondan görmək olar ki, sağ fiqurun bütün nöqtələrinin bir və ya hər üç koordinatının işarəsini dəyişsək, o, sol fiqura çevriləcəkdir". A.Şubnikovun təbirincə obyektlərin güzgü simmetriyasını eyni müvəffəqiyyətlə əks bərabərlik və yaxud, antibərabərlik də adlandırmaq olar.

Beləliklə, ilk baxışda çox sadə və anlaşıqlı görünən simmetriya fenomeni əslində mürəkkəb və ziddiyyətli proses olub, bərabərliyə (uyğunlaşma simmetriyası) və antibərabərliyə (güzgü simmetriyası) bölünür. Simmetriyanın bu dialektik ziddiyyəti və dualist təbiəti öz təzahürünü belə bir hadisədə tapır ki, təbiətdə kristal və mayelərin işıq şüalarının polyarizasiya müstəvisini fırladan güzgü simmetriyası modifikasiyalarından yalnız birinə - ya sol, ya da sağ modifikasiyaya rast gəlinir, ya da

bu modifikasiyalardan biri üstünlük təşkil edir. Bu hadisəyə belə bir faktı misal göstərmək olar: insanların böyük əksəriyyəti (təxminən 98%-i) anadan sağ əli sol ələ nisbətən daha çox inkişaf etmiş vəziyyətdə doğulur (solaxay insanlar təxminən 2% təşkil edir), şəkər çuğundurundan alınan məhsul və təbii qlükoza işığın polyarizasiya müstəvisini yalnız sağ istiqamətə fırladan modifikasiyaya malik olur. Asimmetriya və ya disimmetriya adını almış bu hadisələrdən belə nəticə çıxarmaq olar ki, maddi törəmələr inkişaf edib mürəkkəbləşdikcə məkan simmetriyası nisbi səciyyə alaraq, öz yerini getdikcə daha çox asimmetriyaya tərk edir. Asimmetriya xüsusilə canlı materiya üçün qanunauyğun hadisəyə çevrilməkdədir. Bu keçid prosesi göstərir ki, simmetriya və asimmetriya arasında dərin səbəb - nəticə əlaqəsi mövcuddur, simmetriya və asimmetriya eyni bir qanunauyğunluğun təzahür forması ola bilər.

Müasir təsəvvürlərə görə simmetriya anlayışı özündə üç amili birləşdirən müəyyən struktura malikdir: a) simmetriyası öyrənilən obyekt (hadisə) ; b) simmetriyanı öyrənməyə əsas verən çevrilmə; c) obyektin baxılan simmetriyanı ifadə edən xassəsinin invariantlığı, dəyişməzliyi, saxlanması. İnvariantlıq ümumiyyətlə deyil, yalnız müəyyən predmetə nəzərən mövcud olur.

Məlum olduğu kimi, fizikanın öyrəndiyi obyektlər içərisində simmetriya prinsipləri mühüm yer tutur. Təbiətin konkret sahəsində materiyanın inkişafının spesifik qanunauyğunluqlarını öyrənərkən fizika, buradakı dəyişkənlik momenti ilə yanaşı dayanaqlı, saxlanma tərəfini də aşkara çıxarır.

Təbiətdə saxlanma və dəyişmənin dialektik vəhdəti xüsusi halda fiziki nəzəriyyələrin nüvəsini təşkil edən qanunlarda təzahür edir. Fizikanın qanunları, hər şeydən əvvəl, hərəkət qanunları olsalar da, onlar hərəkətin digər tərəfini təşkil edən saxlanmanı da ehtiva edirlər. Buna görə də fundamental fiziki nəzəriyyələrin strukturunda bütün prosesləri və hərəkət formalarını əhatə edən daha ümumi qanunlar da mövcud olur. Bu qanunlar birinci növbədə simmetriya prinsipləri və ya invariantlar və onlara bağlı olan fiziki kəmiyyətlərin saxlanma qanunlarıdır.

Simmetriya anlayışının müasir fizikada roluna həsr olunmuş tədqiqatlarda simmetriya və qanun anlayışlarının, o cümlədən, simmetriya prinsipləri ilə saxlanma qanunlarının qarşılıqlı əlaqəsinin aydınlaşdırılması məsələsi də mühüm yer tutur. Simmetriya və qanun anlayışının məntiqi əsaslarının bir sıra ümumi cəhətləri vardır. Bu əlaqənin mahiyyəti ondan ibarətdir ki, qanunlar mənsub olduqları hadisələrdə baş verən dəyişikliklərə nəzərən həmişə simmetrikdirlər. Qanunların bu xarakteristikası invariantlıq adlanır. Lakin bir sıra müəlliflərin fikrincə “qanunların simmetriyası” anlayışı “qanunların invariantlığı” anlayışına nisbətən daha geniş məzmunludur. Qanunların simmetriyası anlayışı qanunlararası münasibətlərdən daha çox, qanunlar ilə real aləm hadisələri arasındakı münasibətləri əks etdirir. Məkan yerdəyişmələrinə nəzərən simmetriya fiziki qanunların simmetriyasına ən yaxşı əyani misal ola bilər. Bu simmetriyanın mahiyyəti ondan ibarətdir ki, məkanın müxtəlif nöqtələrində eyni şəraitdə aparılan eksperimentlər bir qayda olaraq eyni nəticəni verir. Bu isə o deməkdir ki, həmin eksperimentləri təsvir edən qanunlar məkanın bütün nöqtələrində eynidir. Fiziki

qanunlar bərabərsürətli və düzxətli hərəkətlərə nəzərən də simmetrikdir. Bu simmetriyanın mahiyyəti isə ondan ibarətdir ki, eksperimentin gedişi cismin sükunət və ya bərabərsürətli düzxətli hərəkət halından asılı deyil, başqa sözlə, fiziki qanunları ifadə edən riyazi tənliklər məkan və zaman koordinatlarının bir sistemdən digərinə çevrilməsinə nəzərən invariantdırlar.

Müasir fizikanın məzmununda mühüm yer alan saxlanma qanunlarının idraki və metodoloji əhəmiyyəti, hər şeydən əvvəl, onların ümumiliyi və universallığı ilə şərtlənir. Müasir fizikanın məzmununa bir sıra fundamental ideyaların daxil edilməsi təsadüfi olmayıb, materiya strukturunun bütün səviyyələrində təsir göstərən saxlanma qanunları ilə bağlıdır. Mövcud fiziki nəzəriyyələrin məlum saxlanma qanunları ilə ziddiyyətə gəlməməsi faktı onların gerçəkliyə adekvatlığının mühüm göstəricisi kimi sübut edir ki, saxlanma qanunları ixtiyari fiziki nəzəriyyənin həqiqiliyinin meyarı rolunu oynaya bilər.

Materiyanın strukturu və fiziki hərəkət formasının ekstensiv və intensiv dərkində oynadığı müstəsna rol da sübut edir ki, saxlanma qanunları dünyanın müasir təbii - elmi mənzərəsinin çox mühüm ünsürlərindən birini təşkil edir.

Saxlanma qanunları çoxcəhətli və mürəkkəb məzmuna malik olduqlarından onların idraki- qnesioloji funksiyalarını bütün təfərrüatı ilə açmaq mümkün deyil. Fizikanın digər qanunlarından fərqli olaraq saxlanma qanunları proseslərin necə cərəyan edəcəyini birmənalı söyləməyə imkan vermir. Amma biz, hər hansı bir prosesin məlum saxlanma qanunları ilə uzlaşmadığını, onlara zidd olduğunu gördükdə dərhal düşünməliyik ki, real imkanın olmaması üzündən bu proses ümumiyyətlə reallaşa bilməz. Fizika tarixindən məlumdur ki, müxtəlif dövrlərdə bir çox istedadlı insanlar enerji sərf etmədən iş görməyə qabil olan "daimi mühərrik" yaratmaq arzusunda olmuşlar. Lakin enerjinin saxlanması qanunu "daimi mühərrikin" yaradıla bilməsinin obyektiv mümkünsüzlüyünü sübut etdiyindən bu sahədə göstərilmiş bütün cəhdlər, təbii ki, müvəffəqiyyətsizliyə uğramışdır.

Müasir fizikaya tam bir silsilə saxlanma qanunları məlumdur. Bunlardan materiyanın saxlanması qanunu, enerjinin saxlanması qanunu, impulsun saxlanması qanunu, impuls momentinin saxlanması qanunu, elektrik yükünün saxlanması qanunu materiya və hərəkətin mexanizm səviyyəsində başa düşüldüyü klassik fizikada kəşf edilmiş və klassik fizika nümayəndələri həmin qanunların timsalında bütün fiziki prosesləri hərəkətin mexaniki formasına müncər edən mühüm bir amili görmüşlər. Klassik fizikada kəşf edilmiş hər bir saxlanma qanununa təbiətin ümumi və mütləq qanunu sayılan materiya və hərəkətin saxlanmasının konkret təzahürü kimi baxmaq olar. Lakin belə düşünmək səhv olardı ki, bu halda bu və ya digər saxlanma qanununun məzmun və forması dəyişilməz qalmalıdır. Əksinə, elmin inkişafı və insan təcrübəsunun hüdudlarının genişlənməsi ilə əlaqədar olaraq saxlanma qanunlarının məzmunca zənginləşməsi və mənaca dürüstləşməsi prosesi də baş verir. Məsələn, maddə kütləsinin saxlanması qanununa istinad edən klassik fizikadan fərqli olaraq nisbilik nəzəriyyəsi müəyyən etmişdir ki, cismin kütləsi heç də sabit olmayıb, onun hərəkət sürətindən asılıdır. Bu kəşfə uyğun olaraq nisbilik nəzəriyyəsində enerji elə təyin olunur ki, (E= 〖mc〗 ^2) cisim seçilmiş hesablama sistemində hətta

sükunətdə olduqda belə ($E=mc^2+(m\vartheta^2)/2$) onun enerjisi sıfırdan fərqlənir. Müasir fizikada elementar hissəciklərin qarşılıqlı çevrilmə proseslərinin kəşfi ilə əlaqədar olaraq, bir tərəfdən yeni saxlanma qanunları (lepton yükünün, barion yükünün, qəribəliyin, cütlüyün, izotopik spinin saxlanması qanunları) kəşf edilmiş, digər tərəfdən, klassik fizikaya çoxdan məlum olan saxlanma qanunlarının məzmunu mikroaləmin tədqiqinin verdiyi materiallar əsasında xeyli zənginləşmiş və dərinləşmişdir. Müasir fizikanın saxlanma qanunlarının başa düşülməsinə gətirdiyi yenilik bundan ibarətdir ki, burada dəyişməzlik, sabitlik, invariantlıq və saxlanma materiyanın inkişafı ilə daxili əlaqədə götürülməklə, bu inkişafın özünə materiyanın müxtəlif formalarının qarşılıqlı çevrilmələri kimi baxılır.

Saxlanma qanunları təbiət qanunları sistemində xüsusi yer tutur. Saxlanma qanunlarının ümumiliyi və universallığı onların kəsb etdiyi elmi, metodoloji və fəlsəfi əhəmiyyəti şərtləndirən mühüm amillərdir. Fizikada reallaşdırılan mühüm hesablamaların və onların texniki tətbiqlərinin əsasını təşkil edən bu qanunlar bir sıra hallarda müxtəlif fiziki-kimyəvi sistemlərin və proseslərin tədqiqində özlərinə yer alan bəzi effektlərin və hadisələrin varlığını irəlicədən söyləməyə əsas verir. Prinsipial əhəmiyyətli bir sıra ideyaların müasir fizikaya daxil edilməsi məhz saxlanma qanunları ilə bağlıdır. Saxlanma qanunları ixtiyari ümumi fiziki nəzəriyyənin məhək daşını təşkil edir.

Müasir təsəvvürlərə görə elementar hissəciklərin qarşılıqlı təsirləri, əsasən, iki sinfə bölünən saxlanma qanunlarına tabedir:

1. Ciddi saxlanma qanunları. Bu qrupa materiyanin, enerjinin, impulsun, impuls momentinin, elektrik yükünün, nüvə yükünün, barion yükünün, lepton yükünün saxlanması qanunları daxildir. Bu qanunların “Ciddi saxlanma qanunları” adlandırılmasının səbəbi onların elementar hissəciklərin qarşılıqlı təsirlərinin bütün növlərində (güclü, elektromaqnit, zəif və qravitasiya qarşılıqlı təsirləri) ödənilməsidir.

2. Qeyri-ciddi saxlanma qanunları. Bunlar cütlüyün, qəribəliyin, izotopik spinin saxlanması qanunlarıdır. Bu qanunların qeyri-ciddi adlandırılmasının səbəbi onların qarşılıqlı təsirlərin yalnız müəyyən növündə saxlanmasıdır. Məsələn, cütlüyün və qəribəliyin saxlanması elementar hissəciklərin zəif qarşılıqlı təsirlərində, izotopik spinin saxlanması qanunu isə həm zəif, həm də elektromaqnit qarşılıqlı təsirlərində pozulur.

Müasir fizika saxlanma qanunlarının mütləq xarakter daşıdığını, onların həmişə və hər yerdə deyil, ancaq müəyyən şəraitlərdə ödənildiyini aşkar etmişdir. Elementar hissəciklər fizikasının son nailiyyətləri ilə əlaqədar olaraq ciddi məzmun və forma dəyişikliyinə uğrayan saxlanma qanunları yeni-yeni faktların təsiri ilə getdikcə dürüstləşərək elmin daha dərin və konkret qanunlarına çevrilməkdədirlər.

Saxlanma qanunlarının uğradığı bu məzmun dəyişikliyi elementar hissəciklərin qarşılıqlı çevrilmələrinin kəşfi ilə əlaqədar daha da qabarıq nəzərə çarpmaqdadır. Müasir fizika müəyyən etmişdir ki, elementar hissəciklərin qarşılıqlı çevrilmələri ixtiyari formada deyil, yalnız ciddi saxlanma qanunları əsasında baş verir. Təbiətdə elementar hissəciklərin bir sıra çevrilmə və parçalanma proseslərinin baş verməsinin səbəbi onların müəyyən saxlanma qanunları ilə qadağan edilməsidir. Məsələn, təbiətdə neytronun proton və elektrona çevrilməsi (həqiqətdə neytron üç hissəciyə: protona, elektrona və antineytrinoya parçalanır) impuls momentinin saxlanması qanunu ilə, elektronun neytron və protona parçalanması isə elektrik yükünün saxlanması qanunu ilə qadağan edilmişdir. Qeyd edək ki, müfəssəl öyrənilmiş və funksiyaları az-çox dəqiq müəyyənləşdirilmiş bu saxlanma qanunları



*2

ilə yanaşı elementar hissəciklər aləmində təbiətləri bizə hələ kifayət qədər bəlli olmayan bir sıra digər qadağanlar da fəaliyyət göstərir. Doğrudan da, hissəciklərin məlum saxlanma qanunları ilə qadağan olunmayan bir sıra parçalanma və çevrilmə prosesləri təbiətdə bizə məlum olmayan hansı bir səbəbdənsə baş vermir. Müasir fizika elementar hissəciklərin toqquşması zamanı yeni hissəciklərin doğulması prosesində də yeni "sirli" hadisələrlə qarşılaşır. Beləliklə, müasir fizikanın inkişaf dinamikası göstərir ki, elementar hissəciklər aləmində adi saxlanma qanunları ilə yanaşı yeni qadağan qaydaları da fəaliyyət göstərir. Eksperimental nəticələrin təhlili isə sübut edir ki, mikroaləmdə müşahidə olunan bu əlavə məhdudiyyətlər nəzəriyyəyə yeni saxlanma qanunlarının daxil edilməsi ilə izah edilə bilər.

Beləliklə, simmetriya haqqında yuxarıda dediklərimizdən belə qənaətə gələ bilərik ki, simmetriyanın ən ümumi xarakteri onun təbiətin bütün rəngarəng obyekt və hadisələrində təzahürü ilə deyil, heç bir fundamental problemdən yan ötməyən simmetriya prinsipinin özünün ən ümumi səciyyə daşıması ilə müəyyən olunur. Zira, simmetriya prinsipləri klassik fizikanın da, nisbilik nəzəriyyəsinin də, kvant mexanikasının da, bərk cisimlər fizikasının da, atom və nüvə fizikasının da, elementar hissəciklər fizikasının da əsasını təşkil edir. Bu prinsiplər təbiət qanunlarının invariantlıq xassələrində nisbətən daha qabarıq ifadə olunur. Mikroaləmdə saxlanma qanunlarının simmetriya prinsipləri ilə əlaqəsi o dərəcədə fundamentaldır ki, onu saxlanma qanunlarının həm makro, həm də mikroaləmdə ifadəsi kimi qəbul etmək olar.

Simmetriya prinsipləri və saxlanma qanunları haqqında yuxarıda deyilənlərdən belə nəticəyə gəlmək olar ki, simmetriya prinsipləri sistemlərin tarazlığının ifadəsi, saxlanma qanunları isə bu tarazlığın təzahürü olduğundan, təbiətdə simmetriyanın konkret növləri ilə müvafiq saxlanma qanunları arasında daxili bir əlaqə mövcud olmalıdır.

Müasir fizika üçün simmetriya prinsiplərinin əhəmiyyəti danılmazdır. Belə ki, simmetriya prinsiplərindən yeni fundamental nəzəriyyələrin yaradılmasında geniş istifadə olunur. Digər tərəfdən, simmetriya prinsiplərinin və saxlanma qanunlarının fəlsəfi dünyagörüşlü əhəmiyyəti də vardır: onlar determinizmin ifadəsinin ən ümumi formaları olub, dünyanın maddi vəhdətini, materiyanın hərəkət formalarının daxili əlaqəsini, məkan və zamanın topoloji xassələri ilə fiziki kəmiyyətlərin saxlanması arasındakı dərin dialektik əlaqəni nümayiş etdirirlər.

Yuxarıda qeyd etmişdik ki, simmetriya həndəsi və dinamik olmaq etibarilə iki fundamental növə bölünür. Eyni bölgünü simmetriya prinsiplərinə də tətbiq etmək olar. Təbiətdə fəaliyyət göstərən həndəsi simmetriya prinsipləri məkan və zamanın topoloji xassələrinin, dinamik simmetriya prinsipləri isə elementar hissəciklərin spesifik xassələrinin təsviri ilə bağlıdır. Əvvəlcə məkan və zamanın simmetriya prinsiplərinə və onlar ilə bağlı saxlanma qanunlarına nəzər salaq.

1. Zamanın sürüşməsi prinsipi, başqa sözlə, zamanın hesablama başlanğıcının dəyişməsi. Fizika qanunları zaman sürüşməsinə nəzərən invariant (dəyişməz) qalırlar. Bu, o deməkdir ki, zaman anları bircinslidir və onların hər biri hesablama başlanğıcı kimi götürülə bilər. Fizika qanunlarının zaman sürüşməsinə nəzərən invariantlığından enerjinin saxlanması qanunu çıxarılır.

2. Hesablama sisteminin başlanğıcının məkan koordinatlarının sürüşməsi də

fizika qanunlarının dəyişməzliyinə xələl gətirmir. Bu isə məkan nöqtələrinin eyni hüquqlu, məkanın isə bircinsli olmasına dəlalət edir. Simmetriyanın bu növünə impulsun saxlanması qanunu uyğun gəlir.

3. Fəzada hesablama sisteminin oxlarının dönməsi də fizika qanunlarının məzmununa təsir etmir. Bu, o deməkdir ki, fizika qanunları məkanın izotropluğuna, yəni məkanda bütün istiqamətlərin eynihüquqlu olmasına nəzərən invariantdırlar. Məkanın izotropluğu prinsipindən impuls momentinin saxlanması qanunu çıxır.

4. Fundamental fiziki qanunlar zaman inversiyasına, yəni riyazi tənliklərdə zamanın (t) əks işarəli zamanla (-t) əvəz olunmasına nəzərən invariantdırlar. Bu, o deməkdir ki, təbii proseslər zaman etibarilə dönəndirlər. Zaman inversiyası adlanan bu simmetriya prinsipi təbiətdə entropiyanın saxlanması qanununa gətirib çıxarır.

5. Fizikaya məlum simmetriya prinsiplərindən biri də məkan inversiyası və ya güzgü simmetriyasıdır. Bu halda maddi nöqtənin koordinatları (x, y, z) əks işarəli koordinatlar ilə (-x,-y, -z) əvəz olunur. Fizika qanunları məkan inversiyasına nəzərən invariantdırlar və bu simmetriya növündən çıxarılan qanun cütlüyün saxlanması qanunu adlanır.

6. Təbiətdə fəaliyyət göstərən simmetriya prinsiplərindən biri də hissəciklərin antihissəciklərlə əvəzlənməsi əməliyyatını ifadə edən yük qoşması simmetriyasıdır. Fizika qanunları yük qoşması prinsipinə nəzərən də invariantdırlar. Qeyd edək ki, güzgü və yük qoşmaları güclü və elektromaqnit qarşılıqlı təsirlərində saxlanıldığı halda, zəif qarşılıqlı təsirlərdə pozulur. Fiziki təfəkkürə görə, yük qoşması simmetriyası yükün saxlanması qanunu ilə bağlıdır.

Beləliklə, müasir fizikada simmetriya prinsiplərinin müəyyən iyerarxiyası aşkar edilmişdir. Bu prinsiplərdən bəziləri qarşılıqlı təsirlərin bütün növlərində (güclü elektromaqnit, zəif və qravitasiya) ödənildiyi halda, bəziləri yalnız güclü və elektromaqnit növlərində ödənilir. Bununla əlaqədar olaraq dinamik simmetriya prinsiplərinin araşdırılması və onların müvafiq saxlanma qanunları ilə əlaqəsinin aşkarlanması da mühüm evristik və metodoloji əhəmiyyət kəsb edir.

Simmetriya anlayışı, simmetriya prinsipləri ilə fizikanın saxlanma qanunları arasındakı əlaqələrin araşdırılması müəlliflərə aşağıdakı ümumiləşdirmələri etməyə imkan verir:

Simmetriya anlayışı və simmetriya prinsipləri müasir fizikanın inkişafı üçün müstəsna əhəmiyyət kəsb edərək yeni elmi nəzəriyyələrin yaradılmasına, fiziki biliklərin inkişafında qabaqgörənlik etməyə, hadisələrin gedişini qabaqlamağa, yeni elmi müddəaları formulə etməyə imkan verir.

Simmetriya anlayışının məntiqi aspektdə öyrənilməsi və qneseoloji kontekstdə dəyərləndirilməsi onun müxtəlif növlərinin, o cümlədən, həndəsi (xarici) və dinamik (daxili) aşkarlanmasına, onların spesifik və ümumi cəhətlərini öyrənməyə əsas verir.

Araşdırmalar göstərir ki, təbiətdə simmetriya prinsipləri ilə saxlanma qanunları arasında üzvü bir əlaqə mövcuddur. Yəni, fizikada hər bir simmetriya prinsipi hökmən özünə müvafiq bir saxlanma qanununa gətirib çıxarmalıdır.

***Rəyçi: prof. F.İsmayılov***

## İstifadə edilmiş ədəbiyyat

1. Məmmədov Ə. İsmayılov V. Müasir fizikaya fəlsəfi baxış. Bakı: Elm, 2001.
2. Бежанов Л. Принципы детерминизма и закон сохранения/ Современый детерминизма законы природа. М.: Наука, 1973.
3. Готт В. Симметрия и асимметрия. М.: Знание, 1965.
4. Готт В. Философские вопросы современной физики. М.: Высшая школа, 1972.
5. Урманцев Ю.А. Симметрия природы природа симметрии. М.: Знание, 1974.
6. Компанеец А. Симметрия в микромире. М.: Наука, 1978.
7. Вигнер Э. Этюды о симметрии: Инвариантность и законы сохранения. Пер. с англ. Изд.3 URSS 2015.
8. Ляховский В. Болохов А. Группы симметрии и элементарные частицы. URSS. 2016.
9. Məmmədov Ə., Məmmədov F. Fiziki idrakda formalaşdırma və onun idraki fuksiyaları. //Azərbaycan məktəbi, 2017, № 1.

**А.Мамедов,**
**И.Исмайлов,**

**Роль и место симметрии в системе естественнонаучных знаний**

**Резюме**

В данной статье к вниманию читателей представляется принцип симметрии который анализируется в двух направлениях. В первом направлении на основе материлов современного естествознания раскрывается суть понятия «симметрии», изучаются виды геометрических и динамических, «зеркальних» и «соответствуюших» симметрий, а во втором направлении анализируется внутренняя взаимосвязь принципов симметрии с законами сохранения в микромире.

**A.Mammedov,**
**I.Ismayilov**

**The role and place of symmetry in the knowledge framework for the natural-sciences**

**Summary**

This article describes the principles of symmetry, which are analyzed in two ways. In the first way, the essence of the concept of "symmetry", including types of geometric and dynamic, "mirror" and "corresponding" symmetries are studied based on the materials of modern natural science, and in the second way, the internal interrelation of the principles of symmetry is analised with conservation laws in the microworld.

*Bizim müsahibəmiz*

# HƏR ÖYRƏDƏN MÜƏLLİM DEYİL, KİMDƏN ÖYRƏNİRSƏNSƏ O MÜƏLLİMDİR

***Müsahibimiz ADPU-nun İbtidai təhsil fakültəsinin dekanı, pedaqoji elmlər doktoru, professor, Əməkdar elm xadimi, Beynəlxalq Pedaqoji Akademiyanın həqiqi üzvü, Pedaqoji və Sosial Elmlər Akademiyasının akademiki Fərrux Rüstəmovdur.***

**Tanışlıq.**“Azərbaycan məktəbi” jurnalının redaksiya heyətinin üzvü Fərrux Rüstəmov 1 yanvar 1961-ci ildə Qərbi Azərbaycanın Göyçə mahalının Cil kəndində anadan olub. 1978-ci ildə Cil kənd orta məktəbini, 1982-ci ildə ADPİ-ni bitirib. 1982-1985-ci illərdə Quba rayonunun Rəngidar kənd məktəbində müəllim və məktəb direktoru vəzifələrində işləyib. ADPU-nun əyani aspiranturasını bitirıb, 1989-cu ildə "Azərbaycan sovet pedaqoji elminin inkişafı (1961-1981-ci illər)" mövzusunda namizədlik, 2003-cü ildə "Azərbaycanda pedaqoji elmin inkişaf yolları (1920-1991-ci illər)" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. 2004-cü ildən ümumi pedaqogika kafedrasının professorudur.ADPU-nun “Şagirdlərin peşəyönümü” ETL-nin, Dədə Qorqud ETL-nin, “Şagirdlərin peşəyönümü” ETL-nin,İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının, Bakı Qızlar Universitetinin pedaqogika kafedrasının müdiri olub. 2007-ci ildən ADPU-nun İbtidai təhsil fakültəsinin dekanı vəzifəsində çalışır. Moskva şəhərində yerləşən Beynəlxalq Pedaqoji Akademiyanın (1998), Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi üzvü (2010) seçilib. ADPU-nun Elmi Şurasının qərarı ilə " İlin müəllimi” və “İlin alimi" müsabiqəsinin qalibi olub. Azərbaycan Jurnalistlər Birliyinin üzvüdür. "Akademik Mehdi Mehdizadə", "Gənc alimlər" və "Qızıl qələm" mükafatları laureatıdır. “Avropa Nəşr Mətbu Evi” komissiyasının qərarı ilə “Ən yaxşı vətənpərvər tədqiqatçı alim” qızıl medalı ilə təltif olunmuşdur. Təhsildə və elmdə qazandığı uğurlara görə "Azərbaycan Respublikasının qabaqcıl təhsil işçisi" döş nişanı (2010), "Tərəqqi medalı" (2006) ilə təltif olunub, "Əməkdar elm xadimi" (2012) fəxri adına layiq görülüb. 2009-2016-cı illərdə ADPU-da fəaliyyət göstərən Ümumi Pedaqogika, Pedaqogika və təhsilin tarixi üzrə ixtisaslaşdırılmış Dissertasiya Şurasının sədr müavini olub. Rəhbərliyi ilə 17 nəfər pedaqogika üzrə fəlsəfə doktoru, 2 nəfər elmlər doktoru dissertasiyası müdafiə edib. Əsərləri Bakı, İstanbul, Tbilisi, Moskva, Çeboksarı, Səmərqənd, Təbriz şəhərlərində nəşr olunub. Türkiyə, Rusiya, Finlandiya, İsveç, Yunanıstan, Albaniya, İtaliya, Norveç, Danimarka, Estoniya, İspaniya və Portuqaliyada keçirilən Beynəlxalq konfranslarda iştirak edib. 30-dan artıq monoqrafiya, kitab və kitabçanın, 31 tədris proqramının, 200 elmi məqalə və tezisin, 250-yə qədər elmi-pedaqoji və publisistik yazının müəllifidir.” Şərqdə pedaqogika tarixi” kitabı İranda, “Müasir dövrdə Azərbaycanda təhsil sisteminin əsas istiqamətləri” kitabı Moskvada nəşr olunub.

**- Müəllimlik sənəti, ona verilən tələblər və bu sahədə görülən işlərlə əlaqədar Fərrux müəllimin fikirlərini bizimlə bölüşməyi xahiş etdik.**

- Azərbaycan Dövlət Pedaqoji Universiteti pedaqoji kadr hazırlığının flaqmanıdır. Azərbaycan müəllimlərinin mütləq əksəriy-yəti onun məzunlarıdır.Universitet

inkişafının yeni mərhələsinə qədəm qoyub, ciddi islahatlar keçirilir....

ADPU-da rəqabət mühiti yaradan, stimullaşdırma və karyera inkişafını nəzərdə tutan layihə uğurla həyata keçirilir. Professor Cəfər Cəfərov ADPU-ya rektor təyin olunduqdan sonra bu elm və təhsil məbədi öz inkişafının keyfiyyətcə yeni mərhələsinə qədəm qoyub. İnfrastrukturun yeniləşdirilməsi, auditoriyaların təmiri, ümumtəhsil məktəbləri və xarici ölkələrin pedaqoji kadr hazırlığını həyata keçirən ali məktəbləri ilə əlaqələrin genişləndirilməsi, yüksək bal toplayan tələbələrin Universitetimizə cəlbi, müəllim kadrları hazırlığının nəzəri və praktiki problemləri ilə bağlı respublika və beynəlxalq səviyyəli konfransların təşkili sahəsində mühüm addımlar atılıb. Universitetdə nəşr olunan jurnalların elmi statusu və periodikliyi təmin edilib. II-IV kurs tələbələrinə həm də imtahan formasını seçmək imkanı verilib. Bəzi imtahanlar ənənəvi qaydada - şifahi formada aparılır. Təhsil haqqını ödəməkdə çətinlikləri olan tələbələrə vaxt baxımdan müəyyən sərbəstlik verilib. Universitetdə elmi seminarların keçirilməsi, qarşılıqlı dərs dinləmələrinin müzakirəsi, tələbə debatları, idman yarışları mütəmadi xarakter alıb. Universitetdəki təhsil sahəsindəki yenilikləri müzakirə etmək məqsədilə Pedaqoji Forum yaradılır. Tanınmış təhsil ekspertləri A.Cahangirovun "Təhsil strategiyasının əsas dayağı:səriştə əsaslı təhsil", prof. Şahlar Əsgərovun "Biliyin qiymətləndirməsinin fəlsəfəsi" mövzusunda təqdimatları olub.

Universitetdə tədris prosesinin təkmilləşdirilməsi və daha səmərəli qurulması, əməkdaşlıq mühitinin yaradılması, sağlam rəqabətin formalaşdırılması dərin elmi-metodik biliyi, kreativ düşüncəsi, geniş erudisiyası, pedaqoji-psixoloji hazırlığı, yüksək mənəvi-əxlaqi keyfiyyətləri, akademik bacarığı, tədris təcrübəsi və peşəkarlıq səviyyəsi ilə fərqlənən müəllimlərdən birbaşa asılıdır.



ABŞ-ın Şimali Karolina Universitetinin professoru, Nobel mükafatı laureatı Əziz Sancar Bakıda tələbələrlə görüşlərində onlara xitəbən demişdi: "Özünüzə yaxşı müəllim seçin". On illərdir ki, azərbaycanlı tələbələrin də müəllim seçmək hüququ var. Amma bu seçimi reallaşdırmaq mexanizmi yoxdur. Yenə də buna mentalitet mane olur. Tələbələr vaxtı ilə tanınmış bir alimin (indi isə mühazirə oxumağa fiziki gücü çatmayan, yenilikləri süngü ilə qarşılayan birinin) fənnini seçməsə o, işini itirə bilər. O, hamımızın müəllimi olub, onu necə təhsildən uzaqlaşdıra bilərik? Ona görə də ali məktəblərimizin mütləq əksəriyyətində müəllimi kafedra, seçmə fənləri isə dekanlıq seçir. Əgər biz Avropa ölkələrində olduğu kimi müəllim seçimində peşəkarlığı, pedaqoji-psixoloji və metodiki hazırlığı önə çəkməyi qarşımıza məqsəd qoymuşuqsa onda, seçki sisteminin metodologiyasını dəyişməliyik. Təbii ki, bu, mürəkkəb, çətin və ağrılı prosesdir. İşin pioneri olmaq həmişə çətin olub. Yeni bir ideya ortaya atı-

landa ilk mərhələdə çoxları onun əleyhinə çıxır, ideyanı illüziya hesab edirlər. İkinci mərhələdə bəziləri buna laqeyd yanaşır, yarı lehinə, yarı da əleyhinə danışır. Sonda hamı həmin ideyanı təqdir edir, hətta əvvəldən həmin fikirdə olduqlarını söyləyirlər. ADPU-da professor, dosent, baş müəllim və müəllim vəzifələrinin tutulması qaydalarındakı dəyişiklik qısa bir vaxtda həm seçkidə iştirak edənlərin, həm də Universitet əməkdaşlarının seçki sistemi və tədris prosesi ilə bağlı baxışlarında köklü dəyişiklik yaratdı. Müsabiqənin şərtləri Universitetin Elmi Şurasında müzakirə və təsdiq edildikdən sonra adpu.edu.az saytında yerləşdirildi, fakültələrdə seçkinin keçirilməsi şərtləri ilə bağlı maarifləndirici tədbirlər həyata keçirildi. Müsabiqənin keçirilməsi haqqında “Xalq qəzeti”nin, “Azərbaycan müəllimi” qəzetinin 4 mart 2017-ci il tarixli saylarında müvafiq elanlar dərc edilmişdir. Müsabiqənin özəlliyi və ənənəvilikdən fərqi onda idi ki, burada müsabiqəyə vəzifələr (baş müəllim, dosent, professor) yox, kafedralarda tədris olunan fənlər çıxarıldı. 114 yerə 500 nəfər sənəd vermişdi. Professor-müəllim heyətinin bilik, bacarıq və peşəkarlıq səviyyəsini müəyyən etmək məqsədi ilə Tədris Depatamentininin nəzarəti ilə fakültələrdə açıq dərslər keçirildi, üstün nəticə göstərərək iddiasında olduqları vəzifəni tutmağa nail oldular. Elmi-metodik hazırlığı, İKT bacarığı, yeni təlim texnologiyalarına bələdliyi ilə seçilən müəllimlər uğur qazanmışdır. Uğura gedən yolun qısası yoxdur. Uğur zəhmət tələb edir. Bu uğur onların zəhmətinin, əziyyətinin, yuxusuz gecələrinin, narahat gündüzlərinin bəhrəsi idi. Bu müsabiqə hamı üçün bir dərs, bir nümunə məktəbi oldu. Müsabiqədə yetərli bal toplasalar da, birincilik qazana bilməyənlərə bir il müqavilə əsasında işləyərək növbəti seçkilərə daha yaxşı hazırlaşmaları tövsiyə edilmişdir.

**- Müsabiqənin “dərsləri” necə oldu?**

Müsabiqənin sevincini 112 nəfər yaşasa da, nəticə Universitetimiz üçün uğurlu oldu, “yatmışları oyatdı”. Bir daha aydın oldu ki, müəllimlik peşəsi şərəfli olduğu qədər də məsuliyyətli, çətin və mürəkkəb bir işdir. Müəllim o kəs deyil ki, öyrədir, o kəsdir ki, ondan öyrənirlər. Yaxşı öyrətmək üçün də yaxşı öyrənmək lazımdır. “Müəllim nə qədər ki, oxuyur, öyrənir, o yaşayır, o, oxumağı dayandırdıqda ondakı müəllimlik ölür” (K.D.Uşinski). Universitetdə rəqabət mühiti yaradan, stimullaşdırma və karyera inkişafını nəzərdə tutan yeni model sınaqdan uğurla keçdi. Qaliblərə sertifikat təqdim olundu, bir ştat yarım tədris yükü ilə təmin edilmələri ilə bağlı göstəriş verildi. Bu prosesdə hər bir iştirakçı uğurlu və zəif cəhətlərini gördü. Yaxşı mənada əməkdaşlar arasında rəqabət yarandı. Rəqabət mühiti olmayan yerdə təkamül, tərəqqi və inkişaf mümkün deyil. Rəqabətə davamlı insan kapitalının formalaşdırılması yeni düşüncəyə, təhsil-tərbiyə texnologiyasına, əxlaqi və mənəvi saflığa, yüksək peşə və ixtisas hazırlığına, ümummədəni kompetensiyalara malik müəllimlərdən bir başa asılıdır. Ənənəvi seçki sistemi ilə səriştəli müəllim seçmək, insan resurslarını təbii yolla yeniləşdirmək olduqca çətin prosesdir. Çünki heç kəs (hətta yaşı 80-i keçən də) öz yerindən, tutduğu vəzifədən getmək istəmir. Dövlətin isə ali pedaqoji təhsildən gözləntiləri böyükdür.Tələbə auditoriyası yeni nəfəs, yeni səs, yeni fəlsəfi yanaşma tələb edir. Ahıl və müdrik müəllimlərimiz bizi bağışlasın, bu günün tələbəsi ilə onların arasında yaş fərqi 60 ildən çoxdur. İndiki tələbə auditoriyaları “saralmış kağızlardan üzündən oxumağı” deyil, müasirlik, texnoloji bilik, əməkdaşlıq, dinamika və çevik

təfəkkür tələb edir.

“Azərbaycan 2020: Gələcəyə baxış” Konsepsiyasınada, “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda, “Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi”ndə təhsil sahəsində insan resurslarının müasirləşdirilməsi nəzərdə tutulur.

Strategiyanın əsas məqsədi ölkədə səriştəli təhsilverənlərə, ən yeni texnologiyalara əsaslanan infrastruktura malik, keyfiyyət nəticələri və əhatəliliyinə görə dünya ölkələri sırasında qabaqcıl mövqe tutan təhsil sistemi yaratmaqdır. Azərbaycanın təhsil sisteminin iqtisadi cəhətdən dayanıqlı və dünyanın aparıcı təhsil sistemlərinin standartlarına uyğun olması üçün strategiyada 5 istiqamət müəyyənləşdirilmişdir: 1) səriştəyə əsaslanan şəxsiyyətyönümlü təhsilin məzmununun yaradılması; 2) təhsil sahəsində insan resurslarının müasirləşdirilməsi; 3) təhsildə nəticələrə görə cavabdehlik, şəffaf və səmərəli idarəetmə mexanizminin yaradılması; 4) ömür boyu təhsili təmin edən təhsil infrastruktunun yaradılması; 5) təhsil sisteminin dünya standartlarına uyğun maliyyələşdirilməsi.

İkinci strateji istiqamət kimi təhsil sahəsində insan resurslarının müasirləşdirilməsi nəzərdə tutulur. Bu istiqamət innovativ təlim metodlarını tətbiq edən, təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən səriştəli təhsilverənin formalaşdırılmasına xidmət edir və strategiyada da qeyd edildiyi kimi, özündə təhsilverənlərin peşəkarlığının yüksəldilməsini, təhsilalanların nailiyyətlərinin qiymətləndirilməsi üzrə yeni sistemlərin qurulmasını, təhsilalanların istedadının aşkar olunması və inkişafını, habelə xüsusi qayğıya ehtiyacı olanlar üçün inklüziv təlim metodologiyasının yaradılmasını ehtiva edir. Bu strateji istiqamətin reallaşdırılmasında ümumtəhsil məktəbləri üçün müəllim kadrları hazırlığını həyata keçirən ali təhsil müəssisələrinin üzərinə mühüm vəzifələr düşür. Səriştəyə əsaslanmayan, əmək bazarında yetərincə rəqabətli olmayan əmək haqqı sistemi və maddi stimullaşdırma mexanizmlərinin adekvat olmaması təhsildə müəllim amilinin inkişafına mənfi təsir göstərmişdir. Müəyyənləşdirilən bu istiqamətlərin həyata keçirilməsi akademik bacarığı, tədris təcrübəsi və peşəkarlıq səviyyəsi ilə fərqlənən keyfiyyətli müəllim kadrlarının hazırlanmasını, müəllim peşəsinin nüfuzunun yüksəldilməsini tələb edir.

**- Keyfiyyətli və səriştəli müəllim kadrları hazırlığının bütün məsuliyyətini ali pedaqoji təhsil müəssisələrinin üzərinə atmaq, Sizcə, nə qədər doğru yanaşmadır?**

K.S.Stanislavski deyirdi ki, teatr asılqandan başlayır. Keyfiyyətli və səriştəli müəllim kadrlarının hazırlığının ilkin şərti pedaqoji peşəyə seçimin düzgün, obyektiv və şəffaf aparılmasından asılıdır. Cun-Lutan deyirdi ki, yaxşı müəllim tapmaq çətindir, yaxşı şagird tapmaq ondan da çətindir. Bunun üçün isə, ilk növbədə, pedaqoji peşəyə sənəd verən abituriyentlərin peşəyəyararlılıq səviyyəsi yoxlanılmalıdır. Təəssüf ki, ali məktəblərə mövcud tələbə qəbulu sistemi bu seçimi reallaşdırmağa imkan vermir. Abituriyentlərin pedaqoji peşəyə maraq, meyil və qabiliyyətləri, zahiri görünüşləri, xüsusi ilə də ibtidai sinif müəllimliyi ixtisasını seçənlərin yazı və nitq mədəniyyəti yoxlanılmır. Musiqiçi üçün musiqi duyumu, rəssam üçün rəng duyumu nə qədər zəruri və vacibdirsə, müəllim üçün pedaqoji sövqtəbiilik, pedaqoji qabiliyyətlər o qədər zəruri və vacibdir. Müəllimin xüsusi peşə və ictimai funksiyaları onun şəxsiyyətinə mühüm tələblər verir. Müəllim

şagirdlər, valideynlər və ümumiyyətlə, cəmiyyət üçün nümunə, etalon olmalıdır. Keyfiyyətli müəllim yaxşı həkim, yaxşı mühəndis, yaxşı hüquqşünas, yaxşı iqtisadçı, peşəkar hərbiçi deməkdir. Bu səbəbdən də strategiyada müəllim təhsilalanların öyrənməsi və inkişafı, nailiyyətlərinin monitorinqi prosesində həlledici sima hesab olunur.Tədqiqatçılar müəllimlərin qarşısına qoyulan tələbləri pedaqoji fəaliyyətin səmərəliliyini təmin edən peşə keyfiyyətlərinin imperativ (qeyri-şərtsiz) sistemi kimi şərh edirlər. Avropa alimlərinin fikrincə, praktik pedaqoji fəaliyyətin yarısı pedaqoji texnologiyaların, o biri yarısı isə pedaqoji ustalığın payına düşür. Müəllimə verilən başlıca tələb onun peşə kompetensiyalarına malik olmasıdır. Müəllimin şəxsi keyfiyyətləri hesab olunan pedaqoji kompetensiyalar onun uşaqlara məhəbbətində, onlarla işləməkdən və ünsiyyətdə olmaqdan həzz almaqda özünü göstərir. İllərlə ağ xalatlı həkim olmaq, insanların fiziki sağlamlığının keşiyində dayanmaq arzusu ilə yaşayan, ali məktəbə qəbul zamanı bu istəyini reallaşdıra bilməyən, təsadüf nəticəsində biologiya müəllimliyi ixtisasına düşən və yaxud hüquqşünas, diplomat olmaq istəyən abituriyentlərinin tarix, ədəbiyyat, sinif müəllimliyi ixtisaslarına daxil olmaları, həmin peşəni istəyərək seçənlərə nisbətən yüksək bal toplamalarına baxmayaraq onların gələcəkdə yaxşı müəllim olacaqlarına dəlalət etmir. Müəllim fitrətən müəllim, ustad olmalıdır. Müəllimin praktik fəaliyyəti üçün zəruri olan təşkilatçılıq, tədqiqatçılıq, təlim (öyrətmə), perspektiv, kommunikativ, suqqestiv, elmi-idraki qabiliyyətləri, pedaqoji peşəyə maraq və meyili olmalıdır.

Ümumtəhsil məktəblərində olduğu kimi, ali təhsil sistemində də müəllimlərin heç də hamısının bilik, bacarıq və peşəkarlıq səviyyələri müasir tələblərə uyğun gəlmir. Müvafiq stimullaşdırıcı tədbirlər və səmərəli monitorinq vasitəsilə ali məktəb müəllimlərinin fəaliyyətinin səmərəliliyi, məhsuldarlığı, keyfiyyəti, ən əsası isə rəqabətə davamlılığı artırıla bilər.

İnkişaf etmiş ölkələrdə milli sərvət ölkənin sərvətinin böyük hissəsini təşkil edir iqtisadi artımda intellektual əmək xüsusi çəkiyə malikdir. Azərbaycanda da ölkənuin dayanaqlı inkişafını təmin etmək məqsədilə insan kapitalının formalaşdırılması və ondan səmərəli istifadə əsas prioritet hesab edilir və bu təşəbbüslər dövlət tərəfindən dəstəklənir.

Azərbaycan Respublikasında təhsil sisteminin insan kapitalının inkişafı çağırışlarına cavab verməsi məqsədilə ümumi təhsilin keyfiyyət göstəricilərinin yüksəldilməsi, ali təhsilin Avropa standartlarına uyğunlaşdırılması, təhsili idarəetmə sisteminin yenidən qurulması, insan resurslarının inkişaf etdirilməsi və müəllim peşəsinin nüfuzunun artırılması istiqamətində mühüm işlər görülüb. Müasir standartlara cavab verən təhsil infrastrukturları yaradılıb.. Son illərdə üç mindən artıq ümumtəhsil məktəbi ya yenidən tikilib, ya da əsaslı şəkildə təmir edilib, müasir təhsilin tələblərinə uyğun avadanlıqlarla, informasiya-kommunikasiya texnologiyaları ilə təmin edilib. Təhsil-alanların yaş və fərdi xüsusiyyətlərini nəzərə alan innovativ təlim metodları və pedaqoji texnologiyalar hazırlanıb. Pedaqoji prosesdə innovasiyaların, xüsusilə ekstensiv innovasiyaların tətbiqi genişlənib. Məlum oldu ki, ekstensiv innovasiyaların təhsil prosesinə tətbiqi müəyyən irəliləyişlərə səbəb olsa da köklü dəyişikliyə gətirib çıxartmadı. Ona görə də Avropa ölkələrində olduğu kimi,

Azərbaycan təhsilində də intensiv innovasiyaların tətbiqinə ehtiyac yarandı. Bu da təbii ki, təhsilverənlərin peşəkarlıq səviyyəsinin yüksəldilməsini təmin edən yeni sistemin yaradılmasını, qəbul prosesində yüksək bal toplayan abituriyentlərin müəllimlik ixtisasına cəlb edilməsini, müəllim əməyinin diferensiallaşdırılmasını və stimullaşdırılmasını tələb edir. Təhsil Nazirliyi bu məqsədlə son illərdə bir sıra zəruri tədbirlər həyata keçirdi. 500-dən artıq bal toplayan 300 tələbəyə 100 manat həcmində “Gələcəyin müəllimi” təqaüdünün verilməsi, pedaqoji sahə ilə də bağlı ”Sabah” qruplarının təşkili gələcək müəllimlərə əlavə stimul verdi. (Elə bu səbəbdəndir ki, 500-dən yuxarı bal toplayaraq müəllimlik peşəsini seçən tələbələrin sayı dəfələrlə artıb). Respublikanın ümumtəhsil məktəblərində çalışan müəllimlərin diaqtostik qiymətləndirilməsi zəruri və vacib hesab olundu. İşləyənlə işləməyənlər fərqləndirildi. Müsabiqə şərtlərini ödəyənlərin əməyi stimullaşdırıldı. Az bal toplayanlar seçim qarşısında qaldı: ya treninqlərdə, seminarlarda pedaqoji-psixoloji və metodiki yenilikləri mənimsəməklə təhsil sahəsindəki dəyişikliyə uyğunlaşdılar, ya da məktəblə birdəfəlik vidalaşmalı oldular. Etiraf edək ki, məktəblərimizdə kompüterdən istifadə etməyi bacarmayan, şagirdlərin sadə sualları qarşısında çaş-baş qalan müəllimlərimiz var və onları məhz bu yolla tədricən məktəblərdən uzaqlaşdırmaq mümkündür.

**- Belə müəllimlər məktəbə necə gəlib?**

- Keçən əsrin 90-cı illərinin əvvəllərində ölkədə baş verən ictimai-siyasi proseslər bütün sahələrdə olduğu kimi, təhsil sahəsində də ciddi problemlər yaratdı. On illərlə məktəbdə çalışan, bu sahədə yüksək biliyi, bacarığı və təcrübəsi olan müəllimlərin böyük bir hissəsi əməkhaqqının azlığından sevimli şagirdlərindən ayrılmalı oldu. Onların yerini yüksək ixtisaslı olmayanlar tutdu. Platon deyirdi ki, pinəçinin bir cüt ayaqqabını pis tikməsi bir nəfər afinalıya ziyan vurduğu halda, müəllimin pis işi, pis tərbiyəsi bütün Yunanıstana ziyan gətirir. Ona görə də strategiyada "təhsil sisteminin bütün pillələrində müəllimlərin bilik, bacarıq və peşəkarlıq qabiliyyətlərinin müasir tələblərə uyğun yüksəldilməsi, müvafiq stimullaşdırıcı mexanizmlər və səmərəli monitorinq sistemi vasitəsi ilə müəllim fəaliyyətinin keyfiyyətinin artırılması" bir vəzifə kimi qarşıya qoyulmuşdur.

**Bakı şəhərindəki ümumtəhsil məktəblərinin bəzilərinin pedaqoji kollektivi ancaq qadınlardan ibarətdir. Genişlənməkdə olan feminizasiya prosesinin qarşısını almaq, oğlanların müəllimlik peşəsini seçmələri üçün hansı tədbirlərin görülməsini zəruri hesab edirsiniz?**

Qadınlar fitrətən tərbiyəçi-müəllimdir. Onlar ali təhsil almadan da tərbiyəçilik funksiyasını ləyaqətlə yerinə yetirirlər. Əbəs yerə demirlər ki, yaxşı bir ana yüz müəllimə bərabərdir. Oğlanların tərbiyəsində qadınlar - evdə ana, məktəbdə isə çoxluq təşkil edən qadın müəllimləri daha fəal rol oynayır. Günün çox hissəsini qadınlarla ünsiyyət şəraitində keçirən oğlan uşaqları yalnız onların təkcə düşüncə tərzini götürmür, həm də məhz qadın meyarlarını mənimsəyir, başqa sözlə, “dünyaya qadın gözü ilə baxmağa” (Ə.Əlizadə) başlayır. Deməli, onda qadın xarakteri formalaşır. Xarakter insan şəxsiyyətinin mahiyyətini, istiqamətini, meylini, məqsədini, hisslərini, fəaliyyət tərzini ifadə edir. Xarakter insanın həyat yolundan, tərbiyəsindən və özünütərbiyəsindən asılı olaraq dəyişir. Qüvvətli və möhkəm xarakterin formalaşması təhsilverənlərin xarakterindən asılıdır. Əbəs yerə demirlər ki, xarakteri xarakter formalaşdırır. Ali pedaqoji təhsil müəssisələrinə qəbul olan

tələbələrin böyük əksəriyyətinin qızlardan ibarət olması bizi həyəcan təbili çalmağa sövq edir. Qeyri-adekvat olan bu vəziyyətin aradan qaldırılması məqsədi ilə oğlanların pedaqoji peşəni seçmələri üçün stimullaşdırıcı tədbirlərin həyata keçirilməsi, onlara xüsusi təqaüdlərin və imtiyazların verilməsi, müəllim işlədiyi dövrdə bazar iqtisadiyyatı tələbatına uyğun əməkhaqqı ilə təmin edilməsi, hərbi xidmətdən azad edilməsi və s. kimi vacib və təxirəsalınmaz işlər görülməlidir.

**- Mənimlə razılaşarsınız ki, ali pedaqoji təhsil müəssisələrinin, konkret olaraq ADPU-nun tələbə yataqxanasının olmaması pedaqoji kadr hazırlığının keyfiyyətinə öz təsirini göstərən amillərdən biridir.**

- Tamamilə haqlısınız. Ali təhsil müəssisələrinin yataqxanasının olmaması və ya müasir tələblərə cavab verməməsi həm də ölkəmizdə təhsil almaq istəyən əcnəbi tələbələrin müvafiq təhsil müəssisələrində oxumalarına mane olur. ADPU-nun hazırda 5 tələbə yataqxası var. Onun 4-ü Dərnəgüldə yerləşir. Hazırda onlarda qaçqınlar yaşayır. Bir yataqxanımız da Universitetin 2 saylı tədris binasında yerləşir. Məhdud sayda yaşayış otaqları var. Qızların yaşaması üçün nəzərdə tutulub.Yataqxananın olmaması maddi vəziyyətləri ağır olan bəzi tələbələrin təhsildən imtina etməsinə səbəb olur. Yataqxana təkcə yaşayış yeri deyil, həm də tələbələrin sosiallaşmasının, birgəyaşayış qaydalarına uyğunlaşmasının, əməkdaşlığa alışmasının, sosial işə hazırlanmasının vacib məkanıdır. Mən özüm tələbə vaxtı iki il yataqxanada yaşamışam. Yataqxanada bir illik yaşama xərci cəmi 17 manat idi. İşıq, qaz, su pulsuz idi. Bu xərclər dövlət tərəfindən qarşılanırdı. Təəssüf ki, indiki tələbələrin bu imkanları yoxdur. Ali təhsil müəssisələri üçün yeni kampusların tikilməsi, xüsusilə də yataqxanalarla təmin olunması Bolonya prosesinin əsas tələblərindən biri olan tələbə mobilliyinin həyata keçirilməsinə kömək etmiş olardı.

Tələbələrin ən böyük narazılıqları internet şəbəkəsinin, elektron kitabxananın yoxluğu, tədris resurslarının azlığı ilə bağlıdır.

Ali təhsil üçün dərslik və dərs vəsaitlərinin hazırlanması və nəşri 30 ilə yaxındır ki, özfəaliyyət xarakteri daşıyır, bu sahəyə dövlət tərəfindən vəsait ayrılmır. ADPU-da həyata keçirilən elektron universitet lahiyəsi bu narazılıqların aradan qaldırılmasına hədəflənib. Ali təhsil müəssisələrində tədris olunan fənlər üzrə yeni nəsil dərsliklərin müsabiqə yolu ilə hazırlanması, dövlətin maliyyə vəsaiti hesabına çap olunması, onların elektron variantlarının hazırlanması, tələbələrin müasir tələblərə cavab verən dərsliklərlə, tədris resursları ilə təmin olunması kadr hazırlığının keyfiyyətini təmin edən əsas amillərdən biri kimi dəyərləndirilməlidir.

Müasir dövrdə təhsilin bütün pillələri, o cümlədən ali təhsil üzrə yeni kurikulumların, səriştəyə əsaslanan standartların hazırlanması zəruri və vacib hesab olunur. Müəllim hazırlığı üzrə yeni kurikulumlar tətbiq edilsə də bütövlükdə ali təhsil müəssisələrinin kurikulumlarının yenidən hazırlanmasına ehtiyac vardır.

Dövlətin ali təhsildən, xüsusi ilə də ali pedaqoji təhsillilərdən gözləntiləri böyükdür. Millətin mənəvi potensialının formalaşması onların dərin və hərtərəfli biliyə, praktik bacarığa, yüksək mədəniyyətə, məsuliyyət hissinə və müasir dünyagörüşə hansı səviyyədə malik olmalarından asılıdır. Müasir dövrdə cəmiyyətdə intensiv olaraq dəyişən sosial-iqtisadi münasibətlər təhsil sisteminin bu proseslərə çevik və dinamik adaptasiyasını tələb etdiyindən, ildən-ilə öyrənmə prosesinin keyfiyyətini yüksəltmək müəllimlərdən təhsil prosesinə daha səriştəli yanaşma tələb edir. Müasir müəllim araşdırmalar aparmağı bacarmalı, müasir təhsil,

tərbiyə, inkişaf texnologiyalarından baş çıxarmalı, düzgün diaqnozlaşdırma, proqnozlaşdırma, layihələşdirmə, informasiyavermə, təşkiletmə, qiymətləndirmə, nəzarətetmə və korreksiya funksiyalarını bilməli, tədqiqatçılıq keyfiyyətinə malik olmalıdır. Tədqiqatçılıq bacarığı olmayan müəllim bu keyfiyyəti öz şagirdlərinə aşılaya bilməz. Müəllim-şagird münasibətləri qarşılıqlı anlaşmaya və humanist ideyalara əsaslanmalıdır. Müəllim şagirdlərin daxili aləminə nüfuz etməli, onların rəylərini öyrənməli, ideyalarından bəhrələnməli, müstəqillik və təşəbbüskarlığını rəğbətləndirməli, hörmət hissini tələbkarlıqla üzvü surətdə uzlaşdırmalıdır. Homer deyirdi ki, təhsil şagirdə hörmətdən başlayır. Konfusi deyirdi ki, mən bəzi şeyləri kitablardan, çox şeyi yoldaşlarımdan, daha çox şeyi isə şagirdlərimdən öyrəndim. Müasir məktəbin müəllimi yaradıcı olmalı, dərs dediyi şagirdin inkişafını bütün mərhələlər üzrə görməyi bacarmalı, onların şəxsiyyət kimi formalaşmasını düzgün istiqamətləndirməlidir. Məsuliyyətini dərk edən, demokratiya prinsiplərinə və xalqın milli ənənələrinə, insan hüquq və azadlıqlarına hörmət edən, azərbaycançılıq ideyalarına sadiq olan, müstəqil və yaradıcı düşünən vətəndaş və şəxsiyyət yetişdirmək üçün müəllim şagirdin yaradıcı təfəkkürünə məxsus bütün psixo-pedaqoji xüsusiyyətləri bilməlidir. Bunun üçün isə vahid konsepsiya olmalıdır.Humanist pedaqogikaya görə, müəllim hazır bilik verməməli, əlaqələndirici, istiqamətləndirici, məsləhətçi, "fikrin mamaçası" (Sokrat) rolunda çıxış etməli, şagirdlərə öyrənmənin yollarını öyrətməlidir. Doğrudan da, dosta balıq verməkdənsə, ona balıq tutmağı öyrətmək faydalı deyilmi? Bu prosesdə şagirdlər passiv olmamalı, tədqiqatçı, təcrübəçi, yaradıcı subyekt kimi əvvəlcədən müəyyən olunmuş nəticələrin əldə edilməsi üçün məqsədyönlü fəaliyyət göstərməlidirlər. Əgər keçən əsrin 70-ci illərində "Conni nə üçün oxuya bilmir?" sualı Amerika təhsilinin ən başlıca suallarından biri idisə, sonralar o yeni sualla "Conni nə üçün düşünə bilmir?" sualı ilə əvəz olundu. Şagirdləri fikirləşməyə öyrətməyi vacib hesab edən Amerika alimi V.Bruer suala münasibət bildirərkən deyirdi: "Əgər biz Amerikada təhsilin səviyyəsini yüksəltmək istəyiriksə, şagirdlərə insanı ağıllı, öyrənən, düşünən varlıq edən keyfiyyətlər aşılamalıyıq". İndiki dövrdə, əslində, bu bütün dünyada, Hamlet dilemmasıdır: olum, ya ölüm məsələsidir. Düşünmək insanın başlıca qabiliyyəti, onu ifadə etmək əsas təlabatı, yaymaq isə ən qiymətli azadlığıdır. Düzgün düşünmək böyük bir kəşf qədər əhəmiyyətlidir ki, humanist pedaqogikanın da əsas qayəsi budur.

**- Fərrux müəllim, yazılarınızın birində belə fikir oxudum:"Ənənəvi pedaqogika praktikaya o qədər də dəyişdirici təsir göstərə bilmir".**

- Həqiqətən sovet dövründə formalaşan ənənəvi pedaqogika praktikaya o qədər də dəyişdirici təsir göstərə bilmir. İnzibatiamirlik dövründə formalaşan ideoloji ehkamlar pedaqogikanı öz təbii inkişaf axarından çıxarmışdır. "Uşaqların anadan bərabər imkanlarla doğulması, təhsiltərbiyədə bərabər imkanlara malik olması"- kimi heç bir elmi əsasa söykənməyən fikirlər bu gün özünü doğrultmur. Elm və təcrübə sübut edir ki, təhsil-tərbiyənin köməyi ilə çox şeyi dəyişmək olar, amma insanın təbiətini dəyişmək olmaz. Elə bir şərait, elə bir təhsil mühiti ki, şagird özü oxumaq istəsin.Təhsilin humanistləşdirilməsi, ilk növbədə, şagirdin təlim prosesində bilavasitə inkişaf etdirilməsini, özünü bir şəxsiyyət kimi təsdiq etməsi, özünüreallaşdırması üçün əlverişli şəraitin yaradılmasını nəzərdə tutur. Elə bir şərait, elə bir təhsil mühiti ki, şagird özü oxumaq istəsin.

Hazırda şagirdlərin təfəkkürünün inkişaf tempi mövcud təhsil standartlarına, qəbul olunmuş proqramlara, öyrətmə metodikalarına adekvat deyil, şagirdlər həddən artıq “ölü” faktlar ilə yüklənir, onlara qarşı müəllimlərin, valideynlərin sərt tələbləri, düzgün olmayan yanaşmaları hələ də davam edir. İllərlə məktəbə gəlməyi arzulayan, xəyallar quran uşaqlar görəsən niyə oxumaq istəmir? Özlərimi oxumaq istəmir, bizmi onları oxuda bilmirik? Onların potensial enerjisini kinetik enerjiyə çevirə bilmirik. Daha doğrusu, onların oxuması üçün zəruri sağlam təhsil mühiti yarada bilmirik. Bəlkə elə onların yaxşı oxumalarına bizim tələblərimiz, bizim istəyimiz, bizim düzgün olmayan baxışlarımız mane olur. Ailə, məktəb, cəmiyyət mane olur. V.Hüqo deyirdi: “Tanrı, heç bir uşağı pis olsun deyə yaratmaz!”. Bəlkə biz uşaqlarla bağlı, onların oxumaları ilə bağlı öz baxışlarımızı dəyişək. L.Tolstoy deyirdi: “Hamı dünyanı dəyişmək istəyir. Ancaq kimsə özünü dəyişmək niyyətində deyil. Halbuki siz özünüzü dəyişməyənə qədər dünya da dəyişməyəcək”. Biz məktəbdə uşağın təbiətini dəyişmək istəyirik. Məktəbin şəxsiyyət yetişdirmək kimi ali missiyası məktəbdə ikinci plana keçib.Bütün şagirdləri bir küpə salıb onlardan əlaçı, sabah 600-700 bal toplaya biləcək şagirdlər hazırlamaq istəyirik. Cəmiyyət buna səfərbər olub. Buna nail olmaq mümkündürmü? Təbii ki yox!. Buna ehtiyac varmı, təbii ki yox! Axı atalar deyir ki, qanı damara görə alarlar. Ulu Şəhriyar deyirdi: “Hamının başını eyni ülgüclə qırxmaq olmaz”. Zor gücünə verilən bilik ağlı boğur. H.C.Ayzenk deyirdi: “Əgər biz atı su axurunun yanına gətirə biliriksə, uşağı da bu qaydada məktəbə gətirə bilərik. Lakin atı su içməyə məcbur edə bilmədiyimiz kimi, uşağı da, əgər o bunu istəmirsə, oxumağa məcbur edə bilmərik”.

Müstəqil dövlətin əsas dayaqlarından biri milli təhsil quruculuğu, milli dövlət təhsil siyasətinin yeridilməsi sayılır. Təhsildə milli tərəqqiyə, üstün inkişafa nail olmadan millətin, dövlətin real tərəqqisindən, inkişafından danışmaq mümkün deyil.

Milli təhsil quruculuğunda yeniləşmə yeni məzmun və struktur dəyişiklikləri ilə nəticələndi. Elə bir təhsil sisteminin formalaşdırılması nəzərdə tutuldu ki, burada hər bir şagird azad və bərabər təhsil ala bilsin, özünütəhsil, özünüidarə, özünü reallaşdırma yolu ilə potensial imkanlarını üzə çıxartsın, özünü təkmilləşdirsin, təsdiq etsin və həm də başqa adamlarla qarşılıqlı əməkdaşlığa hazır olsun. Bunun üçün, hər şeydən əvvəl, ənənəvi didaktik sistemlərin yeniləşdirilməsinə, müəllim-şagird əməkdaşlığının yenidən qurulmasına, öyrətmə öyrənmə prosesində ağırlıq mərkəzinin tədricən şagirdin üzərinə köçürülməsinə başlanıldı. Azərbaycan pedaqoji elmində belə bir fikir formalaşdırıldı ki, şagird yalnız ona məxsus olan təbii imkanlara, xüsusiyyətlərə, fərdi qabiliyyətlərə və məqsədlərə malik olan, fəal hərəkət edən subyektdir. O, yaşadığı cəmiyyətin birgəyaşayış qaydalarına riayət edən, milli və bəşəri dəyərləri qoruyub saxlayan, yeni mədəniyyət nümunələri yaradan, müstəqil formalaşan və azad vətəndaşa çevrilən şəxsiyyətdir. Təhsilin vəzifəsi isə böyüyən bu insana həyat şəraitini keçmiş nəsillərdən bir hədiyyə olaraq qəbul etməməyi, onu yaradıcı dəyişməyi, öz həyatını daha yaxşı qurmağı öyrətməkdən ibarət olmalıdır. Təhsil insanın ruhunu qidalandırmalı, onda özünə, öz daxili potensialına və onu yaradan Tanrıya inam hissi yaratmalı, onu özünüdərkə hazırlamalıdır. Təhsil insanlara istənilən həyat şəraitində düzgün hərəkət etmək qabiliyyəti aşılamalıdır. Mahiyyət etibarı ilə bu problem yeni yanaşma, yeni pedaqoji təfəkkür tələb edir.

Pedaqoji prosesin əsasında duran paradiqmaları dəyişmək, onu yeni məzmunda qurmaq həyat reallığına çevrilir. Belə olan halda müəllim və şagirdlərin müəyyən qaydada və rejimdə həyata keçirilən birgə fəaliyyətlərinin zahiri ifadəsi olan təlimin təşkili formalarının da məzmunu və xarakteri dəyişir. Sosial səbəblər və didaktik sistemlərin inkişafı ilə əlaqədar olaraq meydana gələn, ciddi reqlamentə, sərt qaydalara əsaslanan standart dərslər tədricən öz yerini qeyri-standart dərslərə verir.

Futuroloqlar yazır ki, gələcəkdə məktəblərdə müəllimə ehtiyac olmayacaq. İnsanlar istədikləri məlumatları asanlıqla əldə edəcəklər...

Bütün dövrlərdə məkəb ziya, işıq nur paylayan müqəddəs bir yer, müəllim isə bu missiyanın daşıyıcıları hesab olunublar.Bu ilahi bir missiyadır.Müəllim əməyi Allahın xəlq etmə qüdrətinin bilavasitə davamıdır. Məşhur ərəb mütəfəkkiri İbn Əl Müqəvva yazırdı ki, vücudumuzun havada və qidadan sonra ən çox tələb etdiyi şey məhz təhsil-tərbiyədir. İnsanın kamilləşməsi, şəxsiyyət kimi formalaşması, əqlinin, cisminin və ruhunun bərabər səviyyədə inkişafı müəllimdən asılıdır. Müəllim təhsil-tərbiyəsi ilə məşğul olduğu insanın yaş və fərdi xüsusiyyətlərini, əxlaqi keyfiyyətlərini, fiziki imkanlarını, ümumiyyətlə potensialını nəzərə alaraq onun hisslərinə, şüuruna və davranışına təsir göstırir. Bu təsir nəticəsində insan dəyişir, özünüdərk edir, çevrəsini dərk edir, Allahı dərk edir. Onda əxlaqi, etik, estetik, fiziki keyfiyyətlər formalaşır. Ona görə də müəllimin missiyası həmişə yüksək olub. Hətta valideynlətdən də.Valideyn bizim fiziki bədənimizin yaradıcısı və tərbiyəçisi olduğu halda müəllim ruhumuzun tərbiyəçisidir. Ruh bədəndən üstün olduğu üçün təbii ki müəllim də valideyndən üstündür. Həm müəllim, həm də valideyn bizə həyat bəxş edir: biri adi həyat, o biri layiqli həyat. Hər öyrədən müəllim deyil, kimdən öyrənirsənsə, o, müəllimdir (İbn Xəldun). Məhəmməd Peyğəmbər buyururdu: "Cənnət bağçalarından keçəndə əyləşin". Əsabələri soruşanda ki, ya Peyğəmbər, cənnət bağçaları deyəndə, nəyi nəzərdə tutursunuz? Peyğəmbər buyurmuşdu ki, müəllim məclislərini. Cənnət bağçalarından necə ki, min gülün, min çiçəyin ətri gəlir, rayihəsi gəlir, müəllim məclislərindən də ədəb, əxlaq, mərifət ətri gəlir.

Müəllim insanın özünü yetişdirir, onun əxlaqını formalaşdırır. Heç bir sivilizasiya, heç bir cəmiyyət əxlaqdan kənarda mövcud ola bilməz. Əxlaq və qəbahət, fəzilət və rəzalət tərəzinin müxtəlif gözlərində yerləşir. Bu gün əxlaq yüksəkdə durduğuna görə cəmiyyət müəllimlərə borcludur. Müəllim ayrı-ayrı insanları və bütövlükdə millətləri qaranlıqdan aydınlığa çıxaran işığa bənzəyir. Bu ədəb, əxlaq və mərifət işığına həmişə ehtiyac olacaq. Bunsuz mümkün deyil...

**- Azərbaycan müəllimlərinə sözünüz....**

- Fikrimi 23 il Azərbaycan maarifinə rəhbərlik etmiş akademik Mehdi Mehdizadənin sözləri ilə tamamlamaq istərdim. O deyirdi: "Biz müəllimlər hamıya örnək olmalıyıq. Çünki təlim-tərbiyənin başında biz dayanırıq. Böyüyən nəsli həyata biz hazırlayırıq. Ona görə də müəllimin bir nömrəli keyfiyyəti halallıq olmalıdır. Halal olmayan müəllim kamil insan yetişdirə bilməz".

**Müsahibəni apardı:**

**Nəcəf Nəcəfov,**
***filologiya üzrə fəlsəfə doktoru,dosent, Əməkdar müəllim, Azərbaycan Yazıçılar Birliyi və Jurnalistlər Birliyinin üzvü***

**Pedaqogika**

# TƏHSİL PROSESİNİN HUMANİSTLƏŞDİRİLMƏSİNİN BƏZİ MƏSƏLƏLƏRİ



**Gülşən Orucova,**
***Bakı şəhəri, Səbail rayonu, 6 nömrəli tam orta məktəbin direktoru, ADPU-nun ümumi pedaqogika kafedrasının doktorantı***

Məqalədə müasir dövrdə ümumtəhsil məktəblərində təhsil-tərbiyə prosesinin humanistləşdirilməsinin mahiyyətinə aydınlıq gətirilir, cəmiyyətin ən mühüm mənəvi dəyəri kimi araşdırılır. Təhsil-tərbiyə prosesinin əsas istiqamətlərinin (təhsilin məzmununun, prinsiplərinin, forma və metodlarının, pedaqoji ünsiyyətin və əxlaqi-mənəvi mühitin) humanistləşdirilməsinin nəzəri və praktik məsələləri nəzərdən keçirilir, təhlil və tədqiq edilir.

***Açar sözlər:*** *təhsil, humanistləşdirmə, humanitarlaşdırma, dəyər, kulturoloji yanaşma.*

***Ключевые слова:*** *образование, гуманизацие, гуманитаризацие, ценность, культурологическое отношение.*

***Key words:*** *education, humanization, humanitarization, value, cultural approach.*

Müasir dövrdə ümumtəhsil məktəblərində təhsil-tərbiyə prosesinin humanistləşməsi vacib pedaqoji problemlərdən biridir. Belə ki, böyüyən nəslin həyata hazırlanmasında, onlarda humanist dünyagörüşün formalaşmasında ümumtəhsil məktəblərinin mühüm rolu vardır. Ümumi təhsilin məqsədi dövlətin təhsil sahəsindəki məqsədindən irəli gəlir. Təhsil cəmiyyətin və dövlətin mənəvi, sosial, iqtisadi, mədəni inkişafının əsasıdır. Təhsil ailə, cəmiyyət, dövlət qarşısında məsuliyyətini dərk etməklə yanaşı, başqalarının hüquq və azadlıqlarına hörmət edən, müstəqil, azad, yaradıcı, mədəni, əxlaqi və intellektual səviyyəsi ilə fərqlənən şəxsiyyətin formalaşması məqsədi daşıyır. Pedaqoji ədəbiyyatda ümumtəhsil məktəbinin əsas vəzifələri aşağıdakı kimi şərh edilir:

1) əhalinin təhsilə olan tələbatını ödəmək, fiziki və əxlaqi cəhətdən sağlam nəsil tərbiyə etmək;

2) cəmiyyətin və istehsalatın tələbatları ilə müəyyən olunan biliklər sisteminin mənimsənilməsini təmin etmək;

3) gənc nəsildə elmi dünyagörüşü, siyasi, iqtisadi, hüquqi mədəniyyəti, humanist dəyərləri və idealları, yaradıcı təfəkkürü formalaşdırmaq;

4) gənclərdə fəal vətəndaşlıq mövqeyi, insani ləyaqət, məsuliyyət hissi, demokratik özünüidarə işində iştirak etmək səyləri aşılamaq (1, səh. 122).

Bununla yanaşı, hesab edirik ki, ümumtəhsil məktəbi böyüyən nəslin əqli, əxlaqi, etik, estetik, fiziki və multikultural inkişafını təmin etməli, onda yaradıcı imkanların üzə çıxmasına, özünə və çevrəsinə humanist münasibətin formalaşmasına, fəaliyyətinin (dəyişdirici, idraki, praktiki, kommunikativ, qiymətləndirmə-oriyentasi-

ya) inkişafı üçün sağlam təhsil mühitinin yaranmasına şərait yaratmalıdır. Şagird ümumtəhsil məktəbində aldığı elmi bilikləri ümumiləşdirməyi və biliyə çevirməyi bacarmalıdır.Təlimdə əsas məqsəd alınmış məlumatı ancaq yadda saxlamaq deyil, həm də onun əvvəlki məlumatla qarşılıqlı əlaqəsini başa düşməkdir. Məlumatların, formul və təriflərin mexaniki əzbərlənməsi biliklərin formal mənimsənil-məsinə səbəb olur. Formal mənimsəmə isə insanın əqli inkişafına kömək etmir, yaradıcılığa deyil, doqmatizmə gətirib çıxarır. Biliyi mənimsəmənin səviyyələri (tanışlıq, bilik, bacarıq, vərdiş) təhsil prosesində nəzərə alınmalı, nəticədə onlar dəyərlərə çevrilməlidir. Təhsil həm də kütləviliyi sayəsində ictimai şüuru formalaşdırır və cəmiyyətdə baş verən proseslərə təsir edir. Təhsil demokratiyaya, bərabərliyə və birgəyaşayışa kömək edən vacib sosial institutdur. Təhsilin köməyi ilə mədəniyyətlər ötürülür və transformasiya olunur, sosial funksiyalar dəyişir, yeni statuslar yaradılır və yenilənir. Şagirdlərdə elə bacarıqların formalaşdırılması nəzərdə tutulur ki, istənilən həyat şəraitində və müxtəlif situasiyalarda qarşısına çıxan çətinliklərdən baş çıxara bilsin, aldığı bilik və bacarıqları digər fəaliyyət sahələrinə transformasiya etməyi bacarsın. Məktəbin məqsədi təhsilin məzmunuda öz əksini tapır. Məktəbin məqsədlər sistemini müəyyənləşdirməli olsaq aşağıdakı mənzərənin şahidi olarıq: oxumağı öyrətmək; hesablamağı öyrətmək; danışmağı öyrətmək; ünsiyyətdə olmağı öyrətmək; ümumu oxuma (öyrənmə) bacarıqlarını öyrətmək; fənlər üzrə bilik, bacarıq və vərdişləri öyrətmək; intellektual bacarıqları formalaşdırmaq; emosional sferanı inkişaf etdirmək; motivasiya sferasını inkişaf etdirmək; iradə sferasını inkişaf etdirmək; əməkdaşlıq münasibətləri öyrətmək; qanuna tabe olmağı öyrətmək və s. Məktəbin məqsədləri çoxdur və onların sayını artırmaq da mümkündür. Sadaladığımız bu məqsədləri üç böyük qrupda birləşdirmək olar: təlim məqsədləri, tərbiyə məqsədləri və inkişaf məqsədləri. Deməli, tam pedaqoji prosesdə təhsilləndirici, tərbiyəedici, inkişafetdirici və nəzarət-korreksiyaedici funksiyalar vəhdətdə həyata keçirilməlidir. Bu aspektdən yanaşanda təhsil-tərbiyə prosesi insanın zəruri ehtiyaclarının reallaşması mühitidir. Belə bir şəraitdə insan özünü təsdiq edir, özünü aktuallaşdırır, ətraf aləmlə tarazlığı qoruyub saxlayır. Davranış mədəniyyətinin formalaşdırılması pedaqoji prosesin iştirakçılarının seçim hüququnun təminatını və onların daxili potensialının realizə edilməsi üçün pedaqoji şəraitin yaradılmasını vacib hesab edir. Bu məqsədlərin metodoloji əsasını məktəbin müasirləşdirilməsi, yəni humanistləşdirilməsi təşkil edir.

Təhsil prosesinin humanistləşdirilməsi dedikdə nə başa düşülür? Pedaqoji və metodik ədəbiyyatda pedaqoji prosesin humanist-ləşdirilməsi, humanistliyi, humanizmi kimi anlayışlardan istifadə olunur. Bu anlayışlar mahiyyətcə eyni mənanı ifadə edir. "Ensiklopedik fəlsəfə lüğəti"ndə humanizm "tarixən dəyişən baxışlar sistemi" (2, səh. 130) kimi izah edilir. Amerika Humanistlər Assosasiyası (American Humanist Association) humanizm anlayışını "insanın özünü reallaşdırmaq və bəşəriyyətə daha çox fayda vermək məqsədilə etik həyat tərzi keçirməyə qadir olduğunu və buna məcbur olduğunu iddia edən mütərəqqi həyat mövqeyi" (3) kimi şərh edir. Humanizm və humanist münasibətlərin tarixi qədim olsa da anlayış kimi İntibah dövründə elmi dövriyyəyə daxil edilib. Bu dövrün pedaqoji nəzəriyyələri sonrakı dövrlərdə maarifçilik ənənələrinin yaranmasına, humanist pedaqoji ideyaların formalaşmasına güclü təsir edib. İntibah dövrünün pedaqoji fikirdə öz əksini tapan ideyaları "humanism" termini

ilə ifadə olunur. İntibah dövrünün zəka sahibləri hələ XV əsrdə yaratdıqları əxlaqi-mənəvi sərvətin adını ifadə etmək üçün “humanitas” sözündən istifadə edirdilər. “Humanitas” sözü elmilik, özü də dünyəvi elmilik mənasında işlədilirdi. İntibah dövründə yaranan pedaqoji nəzəriyyələr dünyəvi xarakteri ilə seçilirdi. Sonralar həmin dövrü səciyyələndirən F.Engels yazırdı: “Bu, bəşəriyyətin o vaxta qədər gördüyü bütün çevrilişlər içərisində ən böyük mütərəqqi bir çevriliş idi, dahilərə ehtiyac olan, təfəkkür və xarakter cəhətdən, kamillik və alimlik cəhətdən dahilər yetirən bir dövr idi” (4, səh.234). Bu dövrdə pedaqoji nəzəriyyə üçün ən vacib elemenet Allah haqqında təlimdən fərqli olaraq insan haqqında təlimin ön plana çəkilməsi idi. Təbiətdən, məhəbbətdən, incəsənətdən, insan təfəkkürünün nailiyyətlərindən, ünsiyyətdən zövq almağı bacaran humanist insan modeli yarandı. İnsan zəkasının ecazkar qüdrətinə, əqlinin gücünə inam artdı.

Maraqlıdır ki, o dövrdə “təhsil-tərbiyə nəzəriyyəsində humanizmin cücərtiləri milli özünüdərk şəraitində yaranırdı. Humanistlər şəxsiyyətin mükəmməlliyi üçün onun estetik və bədii tərbiyəsinin zəruriliyini başlıca şərt kimi irəli sürür, gözəl və məntiqli danışığı ilə seçilən, öz yerini bilən, insanları arxasınca aparmaq qabiliyyətinə malik insan yetişdirməyi vacib hesab edirdilər (5, səh. 280-281). Kvintilianın pedaqoji ideyalarını əsas kimi götürən İtaliya humanistləri Vitterina de Feltrenin timsalında humanist məktəb modeli yaratdılar. Məktəblilərin harmonik inkişafı üçün məktəbdə humanist müna-sibətlər sistemi hakim idi. Həm klassik (V.Feltre, F.Rable, E.Rotterdamski, M.Mon-ten, T.Kampanella, X.Vives, Y.A.Komens-ki), həm də müasir (K.Rocers, A.Maslou, K.Yapers, C.Dyui, C.Olport) pedaqoqların əsərlərində humanizm həm dünyagörüşü prinsipi, həm də əxlaq prinsipi kimi verilir. Humanizm dünyagörüşü yalnız bir mərkəzdə - insanda birləşir. Əgər humanizmə prinsip kimi, dünyaya baxışlar sistemi kimi yanaşsaq, onda insan onun özünəməxsus sistem yaradıcısı olar (elə buradan da “humanizm”, “insanpərvərlik” anlayışları yaranır). Buradan belə nəticəyə gəlmək olur ki, humanizm prinsipdir. O, pedaqoji prosesin bütün prinsiplərini özündə birləşdirməklə onların məzmununu zənginləşdirir. Bu prinsipin əsasında uşaq şəxsiyyətinə humanist münasibət, məhəbbət, hörmət durur. Əxlaqi prinsip kimi verilən humanizm insanın maddi və mənəvi tələbatının ödənilməsinə istiqamətlənmişdir. Humanizm insan haqqında baxışların məcmusunun şüurda əksidir, onun yüksək ictimai vəzifəsi, onun hərtərəfli və ahəngdar inkişafı, insanlar arasındakı münasibətlərin formalaşmasıdır. Humanistlik şəxsiyyətin əxlaqi keyfiyyəti, onun mənəvi zənginliyinin göstəricisidir. Əxlaqi prinsip kimi kollektivdaxili və qarşılıqlı münasibətdə, insan fəaliyyətinin müxtəlif aspektlərində təzahür edir.

Şəxsiyyətə sistemli yanaşma humanizm tərbiyəsinin əsas komponentlərini (humanist hisslər, humanist münasibətlər, humanist keyfiyyətlər) fərqləndirməyə imkan verir. Bu komponentlər davranışda təzahür etdiyinə görə məktəblilərin tərbiyəlilik səviyyəsinə müəyyənedici təsir göstərir. Məktəblilərin tərbiyəlilik səviyyəsini tam müəyyənləşdirmək və dəqiq ölçmək üçün mexanizm yoxdur. Bu gün məktəblərimizdə tərbiyəliliyin nəticələrini üzə çıxarmaq məqsədilə mürəkkəb və çətin əməliyyatlardan istifadə etməklə tərbiyəliliyin səviyyəsi ilə bağlı təxmini təsəvvürlər əldə etmək olar. Məktəbimizdə məktəblilərin tərbiyəlilik səviyyəsini üzə çıxarmaq məqsədilə qiymətləndirmədən istifadə olunur, nəticələr ilkin tərbiyəlilik səviyyəsi ilə müqayisə edilir. İlkin və son nəticələr arasında yaranan

fərq tərbiyə prosesinin səmərəliliyini müəyyən edir.

Humanist hisslər insanın insana, cəmiyyətə münasibətini ifadə edir. "Humanistlik-insanı qəddarlıqdan çəkindirən, uşaqlara, qocalara, xəstələrə, köməyi ehtiyacı olanlara, ümumiyyətlə, bütün adamlara qayğı və nəvaziş, mehriban münasibət bəxş edən ən gözəl əxlaqi keyfiyyətlərdən biridir" (5, səh. 157). Fikrimizcə, müasir məktəb bütövlükdə humanist xarakter kəsb etməlidir. Məktəbin interyerindən pedaqoji prosesin məzmununa qədər hər şey humanist mahiyyət kəsb etməlidir. Təhsilverənlərlə təhsilalanlar arasında münasibətlə yanaşı, həm də təhsilin məzmunu, mahiyyəti, prinsipləri, metodları, təşkili formaları humanistləşdirilməlidir. Vaxtı ilə böyük çex pedaqoqu Y.A.Komenski məktəbi "humanizm" emalatxanası, "insanlıq emalatxanası" adlandırırdı (6, səh. 324). İndiki dövrdə məktəb sözün həqiqi mənasında insaniləşdirilməli, "antroposentrik" olmalıdır. Məktəbdə pedaqoji prosesin mərkəzinə şagird qoyulmalı, təhsilin məzmunu, müəllimlərin fəaliyyəti yüksək dəyər kimi onun şəxsiyyətinin inkişafına istiqamətləndirilməlidir.

Təhsilin humanistləşdirilməsi, ilk növbədə, "şagirdin təlim prosesində bilavasitə inkişaf etdirilməsini, özünü bir şəxsiyyət kimi təsdiq etməsini, özünüreallaşdırması üçün əlverişli şəraitin yaradılmasını" (7, səh. 749) nəzərdə tutur. Şagirdlərdə oxumağı və öy-rənməyə daxili motiv və marağın yaradılması üçün stimullaşdırıcı tədbirlərin həyata keçirilməsini məktəblərdə sağlam və şəffaf təlim mühitinin yaradılması şərtləndirir. Qeyd edək ki, heç də bütün motivlər pedaqoji prosesin gedişinə və nəticələrinə həlledici təsir göstərmir. Psixoloqlar bir çox hallarda öyrənmə motivlərini xarici və daxili olmaqla iki yerə ayırırlar. Uzunillik məktəb təcrübəsi nəticəsində yəqin etmişəm ki, müasir dövrdə öyrənmə prosesində daxili motiv üstünlük təşkil edir. Şagirdlərin özləri təşəbbüskar olmasalar məktəb rəhbərinin, müəllimlərin, valideynlərin öyüd-nəsihətləri, təhrikedici hərəkətləri o qədər də səmərə vermir, bəzi hallarda hətta münaqişəli vəziyyətin yaranmasına səbəb olur. Tədqiqatçı alimlərin "zor gücünə verilən bilik ağlı boğur" –fikri ilə tamamilə şərikəm. Məktəblilərin (eləcə də bütün insanların) motivasiyasının əsas mənbəyi onun özündədir, daxilindədir. Təlim prosesinin səmərəliliyinin və keyfiyyətinin yüksəldilməsində məktəb rəhbərləri və müəllimlər məktəbin və şagirdlərin nailiyyətlərini obyektiv müəyyənləşdirmək məqsədilə real motivləri nəzərə almalıdır. Belə olan halda pedaqoji prosesdə real motivlərə istinad etməklə daha təsirli və yüksək motivlərin (xəyali motivlərin) yaradılması mümkündür. Məktəbin humanistləşdirilməsi elə bir sistemin yaradılmasını nəzərdə tutur ki, burada hər bir şagird azad və bərabər təhsil ala bilsin, özünütəhsil, özünüidarə, özünü reallaşdırma yolu ilə potentsial imkanlarını üzə çıxartsın, özünü təkmilləşdirsin, təsdiq etsin və həm də başqa adamlarla qarşılıqlı əməkdaşlığa hazır olsun. Pedaqoji-psixoloji ədəbiyyatda "humanizm" anlayışı iki mənada (geniş və dar) işlədilir. Geniş mənada insan şəxsiyyətini yaradan dəyərlər sistemini, insanın rifah və xoşbəxtliyini, onun layiqli yaşamaq hüququnu ifadə edir. Məhdud mənada isə Avropada (xüsusilə İtaliyada və Almaniyada) İntibah dövrünün (XIV-XVI əsrlər) mədəni hərəkatını xarakterizə edir. Yuxarıda qeyd etdiyimiz kimi, məhz bu hərəkatın çərçivəsində də "humanizm" termini yaranıb. İlk zamanlar o filoloji aspektdə intellektual məşğələlərin müəyyən növü - ritorikanın, qrammatikanın, poeziyanın, etikanın, fəlsəfənin öyrənilməsi kimi başa düşülürdü.

XX əsrin 90-cı illərində Azərbaycanda məktəbin sosial funksiyası dəyişdi. Yeni

pedaqoji təfəkkür müasir təhsil nəzəriyyəsində aparıcı mövqe qazandı. Ümumtəhsil məktəblərində şagirdin bir şəxsiyyət kimi formalaşdırılmasında təhsilin humanistləşdirilməsi vacib hesab olundu. Pedaqoji-psixoloji arsenala “humanistləşdirmə” anlayışı daxil edildi. Təhsilin humanistləşdirilməsi şagirdlərdə humanist əxlaqi, etik, estetik hisslərin, keyfiyyətlərin formalaşdırılmasını, bunun üçün tələb olunan maddi – intellektual və sosial əxlaqi şəraitin yaradılmasını nəzərdə tutur. Deməli, təhsilin humanistləşdirilməsi, ilk növbədə, müəllimin fəaliyyəti, davranışı, hərəkəti, ünsiyyəti, rəftarı və münasibətlərinin, eləcə də məktəbdaxili idarəetmənin humanist məzmun kəsb etməsini tələb edir. Bu anlayışın elmi dövriyyə və praktik fəaliyyətə daxil edilməsində prof. Ə.Əlizadənin müstəsna xidmətləri oldu. Onun fikrincə, “məktəb həyatının humanistləşdirilməsi yeni pedaqoji təfəkkürün ana xətti kimi özünü göstərir. İnsan amili ancaq bu yolla məktəb həyatına nüfuz edib önəmli pedaqoji məna kəsb edə bilər” (8, səh. 30).

Dünyanın humanist dərki insan şəxsiyyəti ilə bağlıdır. Şəxsiyyətin inkişafı isə mürəkkəb prosesdir. Bu prosesdə həm kəmiyyət, həm də keyfiyyət dəyişikliyi baş verir. İnkişaf prosesi ziddiyyətlərlə şərtlənir. Elə bu səbəbdən də insanla, onun mənəvi ehtiyacı ilə bağlı olan, dialoji mədəniyyət prosesində üzə çıxan humanizm anlayışı da mürəkkəb olmaqla yanaşı, həm də çoxparametrli hadisədir. O ümumsosial səviyyədə bəşəriyyətin mənəvi tərəqqisinin, ruhi inkişafının məqsədi və kriteriyası kimi çıxış edir. Əgər problemə birinci aspektdən yanaşsaq, aydın olar ki, humanizm, insanın (həm də insanlıq tarixinin) öz inkişafında can atdığı ən yüksək mənəvi idealdır. Deməli, bəşəriyyətin inkişaf tarixində humanist münasibətlərin inkişafı insanın özünün inkişafı kimi başa düşülür. İdeal kimi isə əxlaqi borcun və insani dəyərlərin vəhdəti kimi dərk edilir.

“Humanistləşdirmə” anlayışı “humanizm” və “humanistlik” anlayışlarından törəmədir. O problemin konstruktiv aspektini, dəyərlərin sisteminin yüksək mərhələsini ifadə edir. Humanistlik Azərbaycan dövlətinin təməl prinsiplərindəndir, dövlət siyasətində öz əksini tapır, qanunlarda təsbit olunur. Humanislik “Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu”nda təhsil siyasətinin əsas prinsiplərindən biri kimi verilir. Təhsil Qanununda “humanistlik – milli və ümumbəşəri dəyərlərin, şəxsiyyətin azad inkişafının, insan hüquqları və azadlıqlarının, sağlamlığın və təhlükəsizliyin, ətraf mühitə və insanlara qayğı və hörmətin, tolerantlıq və dözümlülüyün prioritet kimi qəbul olunması” (9) kimi şərh edilir. Dövlət siyasətinin humanist mahiyyəti, hər şeydən əvvəl, cəmiyyət üzvlərinin bir-birinə humanist münasibətində və dövlətin cəmiyyətin humanistləşdirilməsinə yönəldilmiş layihələrin icrasına dəstək verməsində öz əksini tapır.

Pedaqoji-psixoloji ədəbiyyatda ümumtəhsil məktəbində təlim-tərbiyə prosesinin humanistləşdirilməsi ilə bağlı müxtəlif nöqteyi-nəzərlər vardır. Tədqiqatçıların bəziləri hesab edir ki, təlim və tərbiyə prosesinin humanistləşdirilməsi müəllim tərəfindən “şagird şəxsiyyətinin “unikallığının” qəbul edilməsi, qayğı göstərilməsi, hər kəsdə “şəxsi inkişafın açarının” olmasına inamla bağlıdır. Bu ideyanın tərəfdarları daha çox K.Rocersin şəxsiyyətyönümlü təhsil konsepsiyasına istinad edirlər. Bu konsepsiyaya görə, “məktəb şagirdi dünyaya uyğunlaşma-

ğı və dünyaya uyğun dəyişməyi öyrətməlidir. Bu da fərdin şəxsi axtarışları nəticəsində əldə olunan həyatı bacaraqlara əsaslanan davamlı biliklərin olmasını tələb edir (10, səh. 22). Onun təhsil konsepsiyasında insana inam, insanın özünütəsdiqi, özünüreallaşdırması, özünüdərk prosesi və azadlığı mühüm yer tutur. Onun fikrincə, pedaqoji prosesdə diskussiya yolu ilə kompromis variantlar tapmaqla, qarşılıqlı güzəşt yolu ilə münaqişələri asanlıqla aradan qaldırmaq olar. Digər bir qrup tədqiqatçı alim isə təhsil-tərbiyə prosesinin humanistləşdirilməsinin əsas yolunu təhsilin humanitarlaşdırılmasında görürdülər. Onların fikrincə, humanitarlaşdırma yolu ilə şagirdin təfəkkürünü, mənəvi aləminini inkişaf etdirmək, həyata münasibətini dəyişmək, mədəni (emosional, mənəvi və estetik) zənginliyə qovuşdurmaq mümkündür. Bu da uşağın insanlara, özünə və işə münasibətinin formalaşmasını təmin edir. Humanitarlaşdırma təhsilin məzmununda ciddi dəyişikliyi tələb edir. Təlim prosesində şagirdlərin əqli, əxlaqi və ruhi inkişafına istiqamətlənmiş humanitar məzmun humanist hisslərin yaranmasını təmin edir. Araşdırma zamanı belə qənatə gəldim ki, keçən əsrin 70-80-ci illərində və müasir dövrdə Azərbaycanda və Rusiyada təhsilin humanistləşdirilməsi ilə bağlı aparılan diskussiyaların məğzində akademik Ş.Amonaşvilinin ideyaları dayanır. Onun rəhbərliyi altında keçən əsrin 60-70-ci illərdə Gürcüstan məktəblərində yeni məzmunlu eksperimentlər aparılmağa başlandı. 1986-cı ildə "Əməkdaşlıq pedaqogikası" manifesti qəbul edildi. Görkəmli pedaqoq alim V.A.Suxomlinskinin nəzəri fikirləri, Rostov, Lipetsk müəllimlərinin təcrübəsi Azərbaycanda özünə yer aldı. Ş.A.Amonaşvili hesab edir ki, pedaqoji prosesin humanistləşdirilməsi şagirdlərə "məyusluqdan daha çox uğur, kədərdən daha çox sevinc, konfliktlərdən daha çox birlik, ədəbsizlikdən daha çox tərbiyəlilik, yerində saymaqdan daha çox yaradıcılıq" gətirir. Pedaqoji prosesin humanistləşdirilməsinin açarını o şagirdlə müəllimin mənəvi birliyində görürdü. Bu o deməkdir ki, təlim-tərbiyə prosesində şagirdlərin emosional sferasını inkişaf etdirmək məqsədilə müxtəlif stimullaşdırıcı tədbirlərin həyata keçirilməsi, həvəsləndirici situasiyaların yaradılması vacibdir. Motivasiya proqram-məqsədli yanaşmaların arsenalında çoxsaylı stimullaşdırıcı situasiyalar var ki, onlar da məktəblilərdə emosionallığa və mənəvi inkişafa təkan verir. Təlim-tərbiyə prosesinin iştirakçılarının əməkdaşlığı pedaqoji prosesin humanistləşdirilməsinin vacib şərtidir.

Humanizm mənəvi dəyər kimi cəmiyyətdə əxlaqi münasibətlərin təzahürünün bir forması kimi çıxış edir. Deməli, humanizm həm mənəvi dəyərdir, həm əxlaq normasıdır. Məzmunu bilmədən normanı yerinə yetirmək mümkün deyil. Təhsilin humanistləşdirilməsi pedaqoji prosesin mənəvi əsasıdır. Bu, yaradıcı təlim fəaliyyətinin, dərketmənin və ünsiyyətin fəal subyekti kimi şagirdin şəxsiyyətinin inkişafına yönəlmiş prosesin pedaqoji-psixoloji xarakteristikasıdır.

Humanistləşdirmə cəmiyyətin inkişafının sosial pedaqoji dəyərlərini, mənəvi-psixoloji əsaslarını, pedaqoji prosesin dəyər aspektlərini xarakterizə etdiyindən təlim-tərbiyə prosesinin humanistləşdirilməsi məktəb həyatında humanist prinsiplərin tədbiqini zəruri edir. Elmi-pedaqoji ədəbiyyatda pedaqoji dəyərlər üç qrupa bölünür:1) sosial-pedaqoji dəyərlər; 2) qrupun pedaqoji

dəyərləri; 3) şəxsiyyətə xas olan pedaqoji dəyərlər (1, 68). Birinci qrup dəyərlər cəmiyyətin təhsil sahəsində fəaliyyətini tənzimləyən ideyaların, normaların, qaydaların, ənənələrin məcmusu kimi xarakterizə olunur. İkinci qrup dəyərlər qrupun pedaqoji dəyərlərini (pedaqoji fəaliyyəti nizama salan və istiqamətləndirən normaları ideyaları və konsepsiyaları) ehtiva edir. Üçüncü qrup dəyərlər müəllimin şəxsiyyətinin məqsədi, motivləri, idealları və dünyagörüşünün digər xarakteristikalarını əks etdirir. Özünü və başqalarını inkişaf etdirmək müəllimin pedaqoji fəaliyyətinin əsasını təşkil edir. Pedaqoji fəaliyyətin məqsədi konkret motivlərlə ifadə olunur. Belə olan halda motivasiya humanistləş-dirmənin texniki əsası kimi çıxış edə bilər.

Şəxsiyyətin inkişaf istiqamətləri ilə bağlı maraqlı araşdırmaları olan, Azərbaycan ictimai-pedaqoji fikir tarixində şəxsiyyət və onun inkişafı problemini elmlər doktoru dissertasiyası səviyyəsində araşdıran Ə.Ağayev təhsil-tərbiyənin humanist prinsiplərindən bəhs edərkən mövcud təsnifata şəxsiyyətin fasiləsiz inkişafı prinsipini əlavə edir. Təlim prosesində şəxsiyyətin fasiləsiz inkişafı o zaman təmin olunur ki, o inkişafın aktual səviyyəsinə deyil, yaxın zonasına yönəldilmiş olsun. L.S.Vıqotskinin əsaslandığı qanunauyğunluğa görə təhsil-tərbiyənin məqsədi və metodları uşağın çatdığı inkişaf səviyyəsinə deyil, həm də onun "yaxın inkişaf zonasına" müvafiq olmalıdır. Ancaq bu səviyyə şagirdin inkişafı haqqında tam təsəvvür yaratmır. Təhsil-tərbiyə prosesinin vəzifəsi "yaxın inkişaf zonası" yaratmaqdır ki, sonradan o aktual inkişaf zonasına çatsın. Bundan sonra onun qarşısında yeni inkişaf zonası yaransın. Bu vəziyyət bütün tədris illərində təkrar olunmalıdır. Bu yanaşmanın mahiyyəti ondan ibarətdir ki, təlim prosesində təhsilverənlərlə təhsilalan-ların əməkdaşlığı elə qurulmalıdır ki, təhsilalanları ən yüksək intellektual səviyyəyə qaldırmaq, təqlidin köməyi ilə mənimsədikləri biliyi bacarığa çevirmək mümkün olsun.

Uşağın yaş və psixoloji xüsusiyyətləri ilə bağlı olan inkişaf prosesinə digər amillərlə yanaşı, milli və ümumbəşəri mədəniyyət güclü təsir göstərir. Bu qanunauyğunluq təhsilin məzmununun müəyyənləşdirilməsində kulturoloji yanaşma prinsipinə əməl etməyi tələb edir. Müasir dövrdə böyüyən nəslin tərbiyəsində özünü göstən qüsurların çoxu onlarda humanitar mədəniyyətin olmaması ilə bağlıdır. Təhsilin məzmununda kulturoloji yanaşmanın nəzərə alınması insanlarda humanitar mədəniyyətin yüksəlməsini şərtləndirir. İnsandakı mövcud mədəniyyət və dəyərlər ümumbəşəri mədəniyyətlə harmoniyada daha intensiv inkişaf edir. Mədəniyyət insanı fəaliyyətə həvəsləndirir. İnsanın fəaliyyəti nə qədər rəngarəng və məhsuldar olarsa peşə mədəniyyətinin mənimsənilməsi də bir o qədər səmərəli olur.

"Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyasında, "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda, "Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi"ndə humanist dəyərləri mənimsəyən insan kapitalının bilik və innovasiyalara əsaslanan inkişafı prioritet təşkil edir. Azərbaycan Respublikasında təhsilin bütün pillə və səviyyələri insan kapitalının inkişafı çağırışlarına cavab verməyə istiqamətlənib. Ümumtəhsil məktəbləri ilə bağlı Milli Kurikulum təsdiq olunub. Yeni Milli Kurikulum Çərçivəsi hazırlanır. Dünyanın mütərəqqi təhsil ənənələri

əsasında millətin övladlarının intellektual, mənəvi və ruhi inkişafını təmin edə biləcək məzmun formalaşdırılıb. Ümumtəhsil məktəblərində verilən məzmun şagirdlərdə dünyanın inteqrativ mənzərəsini yaratmaqla yanaşı, onlarda yüksək dəyərlər formalaşdırmalıdır. Bu, ali bir məqsəddir, millətin ümumi inkişafına hədəflənib. Ümumtəhsil məktəblərində pedaqoji prosesin keyfiyyətinin yüksəldilməsində, müəyyənləşdirilən məzmunun realizə edilməsində, humanist və demokratik təhsil mühitinin yaradılmasında, fikrimizcə, aşağıdakı eyni əhəmiyyətli prinsiplərə əməl etmək zərurəti yaranır:

1) təhsilin məzmununa kulturoloji yanaşma prinsipi;

2) təhsil prosesinin forma və metodlarının humanistləşdirilməsi prinsipi;

3) pedaqoji ünsiyyətin humanistləşdirilməsi prinsipi;

4) məktəbdə əxlaqi-mənəvi və fəaliyyət mühitinin humanistləşdirilməsi prinsipi.

Fikrimizcə, məktəb həyatının humanistləşdirilməsi bu prinsiplərin kompleks tətbiqindən asılıdır. Birinci prinsipin reallaşdırılması təhsilin məzmununun humanitarlaşdırılmasını, milli və bəşəri, ictimai və şəxsi dəyərlərin vəhdətini, ikinci prinsipin reallaşdırılması şəxsiyyətin tərbiyəsinin və özünüinkişafının birliyini, təhsilin diferensiallaşdırılması və fərdiləşdirilməsini, tədris prosesinin rasional və emosional komponentlərinin birliyini və qarşılıqlı əlaqəsini, təlim prosesində monoloqlara deyil, dialoqlara üstünlük verilməsini, üçüncü prinsipin reallaşdırılması tədris prosesində müəllim və şagirdin mövqeyinin bərabərləşdirilməsini, pedaqoji prosesin iştirakçılarının əməkdaşlığını, müəllimin yüksək ünsiyyət mədəniyyətinə malik olmasını, dördücü prinsipin reallaşdırılması isə məktəbdə mühitin estetikləşdirilməsini, tərbiyəedici mənəvi mühitin formalaşdırılmasını, sosial-pedaqoji şəraitin yaradılmasını nəzərdə tutur.

Ənənəvi təhsil sistemində bu komponentlərə və onların qarşılıqlı əlaqəsinə ciddi əhəmiyyət verilmirdi, bəzi hallarda passiv qavrama üstünlük təşkil edirdi. Şagirdlər diqqəti daha çox müəllimin monoloq şəklində söylədiklərini əzbərləməyə yönəldilirdi. Şagirdlər çox hallarda öyrənmə, tapma, kəşf etmə sevincini yaşamırdılar. Məktəb həyatının humanistləş-dirilməsində bu, çox vacib məsələdir. Şagird öyrənmənin emosiyasını, həyacanını yaşayanda, prosesin tamhüquqlu üzvü olanda mənimsəmə prosesi asanlaşır. Yuxarıda sadaladığımız prinsiplərlə bərabər təlim-tərbiyə prosesinin humanistləşdirilməsində öyrətmə və öyrənmə fəaliyyətinin müsbət motivasiyalaşdırılmasına, təhsil prosesinin iştirakçılarının şəxsi təcrübəsindən istifa-dəyə, pedaqoji prosesinin rasional və emosional komponentlərinin birliyi və qarşılıqlı əlaqəsinə xüsusi diqqət yetirilməsi vacibdir. Humanistləşdirmə prosesində bu prinsiplərin nəzərə alınması şagird şəxsiyyətinin potensial imkanlarının üzə çıxmasında əhəmiyyətli rol oynayacağı şübhə doğurmur.

Təhsil sisteminin formalaşmasında ictimai-tarixi şərait mühüm rol oynayır. Təhsildəki tendensiyalar dövlətin sosial-iqtisadi və siyasi həyatının təzahürü, ictimai sistemin tələbləri ilə bağlıdır. Bu yanaşmanı metodoloji əsas kimi götürsək, təhsilin humanistləşdirilməsinin obyektiv (insanların təhsil səviyyəsi, texnokratlaşma və humanist insan, siyasi azadlıq və humanist münasibət) və subyektiv (prosesin subyektləri, mənəvi istehsal məhsulları, məktəbin inkişaf proqramı, təhsilin məzmunu, təhsil texnologiyaları, müasir dərsin struktu-

ru, təlim-tərbiyə prosesinin təşkili) amillərini müəyyənləşdirə bilərik.

***Rəyçi: prof. F.Rüstəmov***

## İstifadə edilmiş ədəbiyyat

1. Paşayev Ə., Rüstəmov F. Pedaqogika. Bakı: Elm və təhsil, 2012.
2. Философский энциклопедический словарь. М., 1983.
3. https://americanhumanist.org/what-is-humanism/
4. Rüstəmov F. humanist pedaqogika, yoxsa pedaqogikada humanizm? // Azərbaycan məktəbi, 2017, №5.
5. Qaralov Z. Tərbiyə. I cild. Bakı: Pedaqogika. 2003.
6. Komenski Y. Böyük didaktika. (Elmi redaktoru, tərtibçisi və nəşrə hazırlayanı prof. F.Rüstəmov). Bakı: Elm və təhsil, 2012
7. Rüstəmov F.Azərbaycan pedaqogikaşünaslığı. Bakı: Elm və təhsil, 2016.
8. Əlizadə Ə.Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı: Ozan, 1998.
9. Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. http://edu.gov.az/az/page/72/302.
10. Rogers C.R. The Interpersonal Relationship in the Facilitation of learning //Humanizing Education / Ed. by R.Leeper. Washington, D.C.: National Education Association, 1967. - P. 1-23.

**Г.Оруджова**

**Некоторые вопросы гуманизации учебного процесса**

**Резюме**

Статья вносит ясность на вопросы гуманизации образовательно-воспитательного процесса в современных школах как самой важной духовной ценности общества. Здесь анализируется и исследуется гуманизация основных направлений образовательно-воспитательного процесса (содержание и принципы образования, его методы и формы, педагогическое общение и морально-духовная обстановка)

**G.Orujova**

**Some issues of humanization of the educational process**

**Summary**

The article clarifies the essence of humanization of the educational process in comprehensive schools in the modern era and is being studied as the most important spiritual value of society. Here the theoretical and practical aspects of humanization of the main spheres in education (the content of education, principles of education, forms and methods, pedagogical communication and moral and spiritual environment) are studied and analyzed.

***Psixologiya***

# İSTEDADLI UŞAQLARIN PSİXOPEDAQOJİ XÜSUSİYYƏTLƏRİ

***Açar sözlər:*** *istedad, qabliyyət, təfəkkür, əqli xüsusiyyətlər,tənqidi təfəkkür, məntiqi təfəkkür, müstəqil təfəkkür.*

***Ключевые слова:*** *талант, способность, мышление, черты разума, критическое мышление, логическое мышление, свободное мышление.*

***Key words:*** *talent, capacity, contemplation, intellectual characteristics, critical thinking, logical thinking, independent thinking.*

Bütün ictimai-siyasi dövrlərdə cəmiyyətin, bütövlükdə bəşəriyyətin ağıllı, istedadlı uşaq və yeniyetmələrə, gənclərə habelə insanlara böyük ehtiyacı olub və bu gün də təhsil sistemində həmin istiqamətdə keyfiyyətli islahatlar gedir. Azərbaycan dövlətinin xarici və daxili siyasətində təhsil siyasəti mərkəzi yerlərdən birini tutur. Müasir təhsildə məktəblilərə təhsil alan subyekt kimi yanaşmanı əsas götürür. Məktəbliyə (insana) təkrar olunmayan fərdə daxilən azad, müstəqil fəaliyyət göstərməyi bacaran, şüurlu, inkişaf edə bilən bir şəxsiyyət kimi yanaşılır. Bütün şagirdlərə onların inkişaf etməsi üçün eyni şəraitin yaradılması ilə yanaşı, xüsusi qabiliyyətə malik olan, isdedadlı uşaqların da inkişafına xüsusi şərait yaradılır. Müasir təhsildə insan və şəxsiyyət amilinə daha çox üstünlük verilir. Çünki insanın savadı, biliyi onun gələcək həyatını müəyyən edir. Ölkənin hərtərəfli inkişafına xidmət edir və beləliklə də ölkənin intellektual potensialı da möhkəmlənir.

“Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası” Azərbaycan Respublikasında Ümumi Təhsilin Konsepsiyası (Milli Kurrikulumu)”, “Təhsil haqqında” Azərbaycan Respublikasının Qanunu digər sərəncam və göstərişlər məktəblilər arasında daha bacarıqlı intellekt sahibi olan istedadlı uşaqların seçilməsini, onlardan ölkənin sosial-iqtisadi, siyasi-ideoloji, mənəvi-psixoloji inkişafında istifadə olunmasını tələb edir. Əvvəla qeyd etmək lazımdır ki, isdedadsız şagird, uşaq yoxdur. Uşaqların içərisində özünün bacarığı,hər hadisəyə, onun başvermə səbəblərinə daha həssas yanaşmasına, təfəkkür tərzinə, hafizəsinə, nitqinə, xüsusi qabiliyyətlərinə görə seçilən, fərqlənən uşaqlar var və söhbət onların seçilməsindən, daha da formalaşdırılmasından gedir. İstedadlı uşaqlar milli-mənəvi dəyərlərimizdir. İsdedadlı uşaqların özünəməxsus psixoloji xüsusiyyətləri var. Onlar ənənəvi yolla getmirlər, hadisələrin daxili mahiyyəti ilə maraqlanır, özlərinə yeni yol və cığır açmağa çalışır, müəllimin, valideyinlərinin, həmyaşıdlarının fikirlərinə müstəqil və tənqidi yanaşırlar. Çox vaxt onların sualından valideynlər yayınmağa çalışsalar da uşaqlar onlara imkan vermirlər. Onlar hər şeylə maraqlanırlar, sönük dərs keçən müəllimləri qəbul etmirlər, onlardan narazı qalırlar. İsdedadlı uşaqlar həmişə dünyanın sirləri ilə gizlədilmiş hadisələri axtarır, onlar haqqında fikir yürütməkdən, sual verməkdən, fikirləşməkdən doymurlar. İstedadlı uşaqlar sanki öz ağlı, emosional hissi halları ilə və ya düşüncələr ilə yeni axtarışda olurlar. Təbii ki, bu dediklərimiz isdedadlı uşaqların istedadının təzahür formalarının cüzi bir hissəsidir. İstedadlı uşaqlarda özünü göstərən psixoloji xüsusiyyətlər

adətən bir neçə səviyyələrdə öyrənilə bilər: Ailə, bağça, məktəb, kütləvi informasiya vasitələri və s.

İstedadlı uşaqların aşkar edilməsi, ta qədimdən empirik şəkildə olsa da mövcud olub, lakin onların potensial imkanlarının elmi şəkildə araşdırılması keçən əsrin 70-ci illərindən etibarən diqqət mərkəzində olmuşdur. Bu vacib iş sahəsinin mühüm prioritetlərdən biri kimi irəli sürülərək reallaşdırılması istiqamətində ciddi addımlar atılmışdır. Azərbaycanda dövlət müstəqilliyinin bərpasından sonra, xüsusən 1993-cü il iyunun 15-də görkəmli dövlət xadimi Heydər Əliyevin respublikamızda siyasi rəhbərliyə qayıdışı ilə milli-mənəvi dəyərlərin dirçəlişinə, iqtisadiyyatın, sosial sahələrinin inkişafına güclü stimul verilmiş, bunlarla bərabər, ölkənin təhsil sisteminin yenidən qurulmasına, qabaqcıl dövlətlərin təhsil sistemlərinə inteqrasiya olunmasına geniş imkanlar açılmış, istedadlı uşaq və gənclərə diqqət və qayğının artırılması ölkə Konstitusiyasında təsbit edilərək təhsil sahəsində dövlət siyasətinin əsas istiqamətlərindən birinə çevrilmişdir.

İstedadlı uşaqlar birtərəfli inkişaf etməməlidirlər. Onlar orta təhsil çərçivəsində bütün fənlərə dair bilikləri mənimsəməlidirlər. Lakin onların istedadlı olduqları sahədən və konkret təhsil məqsədlərindən asılı olaraq, bu biliklərin həcmi, məzmunu və s. fərqli ola bilər.

Təhsilin əsas məqsədlərindən biri (bəlkə də birincisi) istedadlı uşaqların bütün qabiliyyət və imkanlarının aşkarlanması inkişaf etdirilməsi və peşə fəaliyyətində onun reallaşdırılmasının təmin edilməsidir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev demişdir: "Biz mədəni dəyərlərimizi, iqtisadi potensialımızı insan kapitalına çevirməliyik. Çünki insanın savadı, biliyi onun gələcək həyatını müəyyən edir və ölkənin hərtərəfli inkişafına xidmət edir. Beləliklə ölkənin intellektual potenisalı da təmin olunur". Qeyd etmək lazımdır ki, cəmiyyət müasir problemlərin həllini məhz bu uşaqlardan gözləyir. Bu səbəbdən də belə uşaqların vaxtında aşkarlanması, dəstəklənməsi və inkişaflarının təmin edilməsi təlimin prioritet məqsədlərindəndir. İstedadın sistemləşmiş keyfiyyətlər kimi başa düşülməsi istedadlı uşaqların şəxsiyyət keyfiyyətlərinin inkişafını təlim-tərbiyənin əsas məqsədi kimi nəzərdə tutur.

Bu o deməkdir ki, uşağın daxili potensial imkanları və tələbatları, motivlər sistemləri, onların qabiliyyəti, temperamenti, xarakteri nəzərə alınmalıdır. Xüsusi daxili motivasiya istedadın sistemləşmə tərkiblərindən (komponentindən) biri olduğundan, onun dəstəklənməsi və inkişaf etdirilməsi şəxsiyyətin inkişafının mərkəzi problemlərindən biridir. Müəllim daima həmin uşaqları müsbət mənada nəzarətdə saxlamalıdır.

Müəllimin istedadlı uşaqlarla işi mürəkkəb və heç vaxt bitməyən prosesdir. Bu iş müəllimdən şəxsiyyət kimi yüksəlməyi, istedadların psixoloji durumu və təlimi sahəsində daim yeniləşən biliklər əldə etməyi, psixoloqlarla, digər müəllimlərlə, inzibati işçilərlə,valideyinlərlə əməkdaşlığı nəzərdə tutur. O, müəllim peşəkarlığının daima yüksəlməsini, çevikliyi, bu gün hələ yaradıcı tapıntı və güclü tərəfi bildiyindən imtina etmə bacarığını tələb edir. Hər bir uşaq məktəbdə elə təhsil almalıdır ki, onun üçün mümkün olan maksimal inkişaf səviyyəsinə çata bilsin. Bütün istedadlı uşaqlar müxtəlif proqramlar tətbiq olunan xüsusi sinif və məktəblərdə oxumaq imkanına malik deyillər. Bu şəraiti məktəb mühiti, müəllim yaratmalıdır. İstedadlı uşaqlar arasında olan fərdi fərqlər isə artıq mövcud olan xüsusi proqramların diferensiallaşdırılması zərurətini yaradır.

Bu uşaqlarla işləyən müəllimə strategiyanın aşağıdakı dörd istiqaməti ilə işləməsi məsləhət görülür: sürətləndirmə, dərinləşdirmə, mürəkkəbləşdirmə, yeniləşdirmə.

Müəllim bütün qrup uşaqları ilə o vaxta qədər işləməlidir ki, işin birinci-"beyin

həmləsi" mərhələsində bütün ideyalar səslənənə qədər söylənilən hər hansı ideyanın tənqidinin yolverilməz olduğunu başa düşsünlər. İşin növbəti mərhələsində söylənilən hər ideyanın müəyyən meyarlara, həqiqətə uyğunluğu "yoxlanılmalıdır". Sonra isə tənqidə yol vermək olar. Bununla yanaşı uşaqlar başa düşməlidirlər ki, tənqid taktiki formada ifadə olunanda və müəyyən konstruktiv başlanğıcdan ibarət olanda (maraqlı fakt, yeni fikir, sualın qeyri – ənənəvi ifadəsi) daha effektli olur. Əməkdaşlığın dəstəklənməsi, riskə hazırlıq, başa düşməyə nail olmaq üçün zəruri olan problem və cəhdlərin həlli yollarının axtarışı – bunlar hamısı yeni fikirlərin yaranmasına gətirib çıxarır. Yaradıcı təfəkkürün stimullaşdırılması üçün istifadə olunan bütün üsullar "yeniləşmə" parametri üzrə təlimin diferensiallaşdırılmasında uğurla tətbiq oluna bilər, bu şərtlə ki, uşaqların əqli səyləri hər bir halda müvafiq məzmunda cəmləşsin.

Tədris olunan fənnin yüksək elmi səviyyəsini təmin etmək, şagirdlərə əməli əhəmiyyətli olan bacarıq və vərdişlər aşılamaq üçün təlim işini elə təşkil etmək lazımdır ki, şagirdlərdə yaradıcılıq təffəkürü və idrak fəaliyyəti daha da inkişaf etsin. Bunun üçün hadisə və proseslər arasında müqayisə aparmaq, müşahidə və faktlardan müstəqil nəticə çıxarmaq bacarığı inkişaf etdirilməli, analiz və sintez, mücərrədləşdirmə, ümumiləşdirmə və s. üsullardan istifadə, idrak fəaliyyətinin aktivləşdirilməsi üçün vasitə olmalıdır (5, səh.92).

İstedadlı uşaqların yetişdirilməsində müstəqil işlərin müxtəlif növlərində istifadə oluna bilər. Bura-məlumat kitabları, elmi-kütləvi xarakterli kitabçalar və s. üzərində iş, referatlar, məruzələr, əyani vasitələrin (sxem, cədvəl, stend, cihaz, model və s.) hazırlanması aiddir.

İstedadlı şagirdlərlə aparılan işin frontal formada müəllimin irəli sürdüyü tapşırığın həllində bütün sinif iştirak edir. Lakin şagirdlərin bilik, bacarıq və vərdişlərinin səviyyəsindən asılı olaraq onu həll etmək üçün priyom və qaydalar fərdiləşdirilir. Zəif şagirdlər üçün orta səviyyəli, qabiliyyətli şagirdlər üçün isə mürəkkəb tapşırıqlar verilir.

İstedadlı uşaqlar bir sıra xüsusiyyətləri ilə fərqlənirlər. Belə ki, onlar yaşıdlarına nisbətən qabiliyyətlərinin yüksək səviyyəsinə çatır və buna görə də onlardan fərqli nəticələr əldə edirlər. İstedadlı uşaqlar aktiv olub başqalarına nisbətən çox işləməyə çalışırlar. Onlara xüsusi qayğı lazımdır ki, müəyyən olunmuş istiqamətdəki qabiliyyətlərini inkişaf etdirsinlər.

"İstedadlı uşaqlar hər şeyi ətraflı öyrənmək və əlavə məlumat almaq istəyirlər. Bu yüksək tələbatı ödəmək üçün müəllim nisbətən asan ədəbiyyat göstərməlidir. Oxumaq belə uşaqlara zövq verir, məşğələləri artıq yük kimi qəbul etməyib, biliklərini artırırlar. Çoxsaylı bacarıqlarına əsaslanaraq, onlar müstəqil fəaliyyətlə başqalarına nisbətən daha yaxşı məşğul olmağa qadirdilər" (9. səh.95). Belə uşaqlar əhatə olunduqları təsirlərə tənqidi yanaşmağı bacarır və hadisələrin mahiyyətini anlamağa çalışır, səthi məlumatlara qane olmurlar.

Öz yaşıdları ilə müqayisədə istedadlı şagirdlər hadisələr arasındakı münasibətləri daha yaxşı açmağı, induktiv və deduktiv fikirləşməyi bacarırlar. Onların əksəriyyəti öz qarşılarında, yerinə yetirilməsi çox vaxt tələb edən, tapşırıqlar qoyur. Bu tapşırıqlar belə uşaqların qabiliyyətlərinin tətbiqinə istiqamətləndirilir. Şagirdlər saatlarla elmi ədəbiyyatlarla məşğul olur, faktları ümumiləşdirməyə, düzgün nəticə çıxarmağa böyük səy göstərirlər. Bu zaman onlarda ixtiraçılıq, müstəqil fikir söyləmək, hadisənin şərhinə yaradıcı şəkildə yanaşmaq, öz fikirlərini ümumiləşdirib yazılı surətdə ifadə etmək qabiliyyəti inkişaf edir.

İstedadlı şagirdlərlə aparılan işin dərs prosesi ilə məhdudlaşdırılmaması, dərsdənkənar məşğələlərin müxtəlif növlərindən bu məqsəd üçün istifadə olunması onların idrak maraqlarının aktivləşməsinə, qabiliyyətlərinin inkişafına təsir göstərir.

Burada ailədə aparılan işləri xüsusilə qeyd etmək lazımdır. Valideynlər mütəmadi olaraq istedadlı uşaqlarla intellektual bacarıqlar tələb edən testlərdən, şifahi sorğulardan istfadə etməklə onların əqli inkişafına xeyli kömək etmiş olarlar.

Məzmunu dərinləşdirilmiş təlim yanaşması konkret bilik və s. ya fəaliyyət istiqamətinə xüsusi maraq göstərən uşaqlar üçün daha səmərəlidir. Bu zaman müəyyən bir sahənin dərindən öyrənilməsi nəzərdə tutulur. Bu yanaşmanın xüsusi peşə təmayüllü məktəblərində tətbiqi də çox faydalıdır. Məzmunu dərinləşdirilmiş təlim yanaşması konkret bilik və ya fəaliyyət istiqamətinə xüsusi maraq göstərən uşaqlar üçün daha səmərəlidir.

Məzmunu zənginləşdirilmiş təlim yanaşması isə təhsilin keyfiyyətcə fərqli məzmununa istiqamətlənir. Burada ənənəvi mövzulardan kənaraçıxma, başqa mövzularla, problemlərlə, fənlərlə əlaqələndirməyə xüsusi yer verilir. Təlim elə planlaşdırılır ki, uşaqların istedadlarına uyğun xoşladıqları fəaliyyətlə sərbəst, reqlamentləşdirilməmiş məşğul olmağa xeyli vaxtları qalır.

Zənginləşdirilmiş proqram uşaqlara əqli fəaliyyətin müxtəlif metodlarının öyrədilməsini və təşəbbüskarlıq, özünə-nəzarət, tənqidçilik, geniş elmi dünyagörüşü kimi keyfiyyətlərin formalaşdırılmasını nəzərdə tutur. Bu yanaşmada təlimin fərdiləşdirilməsi və diferensiallaşdırılması, ümumiyyətlə, innovativ təlim metodları uğurla tətbiq edilə bilər.

Pedaqoji kollektivin, ailənin, cəmiyyətin, bağçanın, valideynlərin istedadlı uşaqlarla işi mürəkkəb və uzunmüddətli prosesdir. Belə fəaliyyətin bütün sadalanan struktur elementlərinin qarşılıqlı münasibəti, müəllimin istedadlı işaqlarla elə iş sistemini nəzərdə tutur ki, burada fəaliyyətin üç əsas aspekti öz əksini tapır: diaqnostik, təlim-inkişafetdirici və sinifdənxaric fəaliyyət. İstedadlı uşaqlarla bağlı bütün işlər bunun üzərində bərqərar olur. Müəllimin fəaliyyətinin bütün komponentlərindən hər biri konkret məqsədlərlə, vəzifələrlə, məzmunla, müvafiq formalarla və iş metodları ilə səciyyələnir.

Təlim uğurlarının səviyyəsinin aşağı düşməsinə təsir göstərən amillərdən biri də istedadlı uşaqların məktəb kollektivində yaşıdlarının əksəriyyətinin orta qabiliyyətli olması, ətrafdakıların aşkar və ya gizli inamsızlıq, qəzəb və ziyankarlıq münasibətləri ilə rastlaşmalarıdır. Bu səbəbdən onlardan seçilməmək hissi formalaşır və onların yaradıcılıq imkanları tədricən genişlənir. İstedadlı uşaqların "adiləşməsi", ümumi intellektual və yaradıcılıq potensialının tənəzzülü, aşkar ifadə olunan nevroz əlamətinin təzahürləri ilə müşayiət olunur: məsələn, "keçmiş vundurkind sindromu" kimi. Baş tutmayan yaradıcılıq hissi, yerində sayma hissi, keçmişlə yaşama və s. bu kimi hallar həmin sindroma səbəb olur. O isə öz növbəsində şəxsiyyətin nevrozlu, bəzən də psixopatik inkişafına səbəb olur.

Məktəb təcrübəsində yol verilən səhvlərdən biri də şagirdlərin təfəkkür üslubunu müəllimlərin nəzərə almaları ilə bağlıdır. Şagirdlər informasiyanı müxtəlif yollarla əldə edir, toplayır, yenidən işləyir və istifadə edirlər. Sinir sisteminin tipindən asılı olaraq şagirdlərin bir qismi tez, bir çoxu ləng fikirləşir. Təcrübə göstərir ki, bəzi uşaqlar bir materialı tez, bəzisi gec qavrayır. Onların hafizəsi, təfəkkürü, bacarıq, qabiliyyətləri fərqli olur. İstedadlı uşaqların təliminin harada təşkil olunmasından asılı olmayaraq, vacib olan onların nəyi və necə öyrədilməsidir.

İstedad fenomeninin növ, təzahür, inkişaf və s. müxtəlifliklərini nəzərə alaraq, istedadlı uşaqların təliminin təşkili üçün aşağıdakı məsələlər aydınlaşdırılmalıdır:

1. İstedadın hansı növüdür (ümumi, xüsusi və ya konkret olaraq hansı);

2. İstedad hansı formada təzahür edir: aşkar və gizli, başqa sözlə, potensial;

3. İstedadlı uşaqlarla işdə hansı məsələlər prioritetdir: müəyyənləşdirilmiş qabiliyyətlərin inkişaf etdirilməsi; psixoloji dəstək və yardım; təhsil mühitinin layihələndirilməsi və ekspertizası; təhsil texnologiyalarının, proqramlarının hazırlanması və təhsil müəssisələrinin monitorinqi və s.

4. Hansı təlim müəssisəsinin istifadə edilməsi daha məqsədəuyğundur: məhz istedadlı uşaqlarla işləməyə yönəlmiş gimnaziya, kütləvi ümumtəhsil məktəbi, əlavə təhsil müəssisəsi və s.

Müəllimlər çox vaxt cəhdə əhəmiyyət vermir, dərs prosesində şagirdlərin hamısını eyni dərəcədə fəallaşdırırlar. Psixoloji cəhətdən hətta şagirdin hansı məsələni həll etməsi də onun təfəkkürünü keyfiyyət baxımından həll etmək üçün kifayət deyildir.

Bir məqamı xüsusi vurğulamaq lazımdır:intellekti ölçmək yollarını bilməyən, bu yollardan istifadə etməyən müəllim özünün birtərəfli güzaran təcrübəsinə arxalanır, bu və ya digər şagirdin intellektinə şübhə ilə yanaşır, sinifdə ona yersiz tənə edir.

Təlimin fərdiləşməsi yolları, görünür, məktəb təcrübəsində elə faktların dərk olunması zəmində formalaşmışdır. Bu yolların əhəmiyyəti böyükdür. İstedadlı uşaqlar erudisiyalı müəllimləri sevir və onlarla işləməkdən həzz alırlar, lakin hətta erudisiyası ilə fərqlənən müəllimlərin bir çoxu bərqərar olmuş vaxt büdcəsi və şagird kontingenti səviyyəsində təlimin fərdiləşdirilməsi yollarından sistemli və səmərəli istifadə edə bilmir. İsdedadlı uşaqları seçmək üçün, onlarla mütamadi iş aparmaq lazımdır. Hər yaş dövrü üçün bu işi mükəmməl bilən, səriştəli psixoloq olması faydalı olar. Belə uşaqların seçilməsində kəmiyyətə yox keyfiyyətə daha çox üstünlük versək işin xeyirinə olar. Ümumtəhsil orta məktəblərində, bağçalarda və digər tədris müəssələrində konkret qruplarda istedadlı uşaqların siyahısı və konkret olaraq hansı fənlər üzrə yüksək göstəricilərin müəyyənləşdirilməsi bu sahədə uğurlu addımlardan olar. Son zamanlar isdedadlı uşaqların öyrənilməsində, İki mühüm informasiya mənbələrindən müəllimlər (sinif rəhbərləri) və vali-deynlərdən istifadə olunur. Onlar müvafiq sorgu vərəqələri doldurur və müxtəlif siniflərdə yaradıcılıq, sənətşünaslıq, riyaziyyat, oxu, musiqi, ictimai aktivlik, incəsənət və psixomoterika sahələri üzrə uşaqların qabiliyyətlərini qiymətləndirirlər (Ə.Əli-zadə). İsdedadlı uşaqlar bəzən vali-deyinlərin, tərbiyəçilərin, müəllimlərin laqeyidlikləri üzündən hər an istedadını itirə bilər. Hökmən lazım deyil ki, xüsusi loboratoriya şəraiti, tədqiqat yeri olsun. Adi hallarda müşahidələrdən, testlərdən, nağıllardan, əfsanələrdən, tapmacalardan, hikmətli ifadələrdən istifadə etmək yolu ilə də isdedadlı uşaqları müəyyənləşdirmək olar.

Adi bir misal: Rəvayətə görə bir gün Şirvan xaqanı Məlhəm kəndinin yanından keçirmiş. Kənd əhlindən heç kim onun pişvazına çıxmamışdır. Bu hökmdarı təəcübləndirmiş, çöldə cılız bir uşağı yanına çağırıb onunla söhbətləşmiş, uşağın hazircavablığını, çevik təfəkkür sahibi olduğunu görüb, gələcəkdə istedadlı bir adam olacağına inanan xaqan onu saraya dəvət edir. Onun təhsili, tərbiyəsi ilə özü məşgul olur. Onun daim nəzarətdə saxlayır. Sonralar o, Xaqani Şirvani adı ilə bütün dünyada şöhrət qazanan şair olur. Bu və ya buna bənzər testlərdən və digər empirik vasitələrdən istifadə etmək yolu ilə də isdedadlı uşaqları seçmək mümkündür. Kifayət edər ki, müəllimlərin, vali-

deyinlərin, tərbiyəçilərin bu sahəyə marağı olsun.

***Rəyçi: prof. O.Həsənli***

## İstifadə edilmiş ədəbiyyat

1. Bayramov Ə., Əlizadə Ə. Psixologiya. Bakı, 1999.
2. Əlizadə Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı, 2002.
3. Baxşəliyev Ə. Azərbaycan milli-mənəvi dəyərlərinin sosial psixoloji mahiyyəti. Bakı, 2011.
4. Həsənli O. Sosial psixopedaqogikada istedadlı uşaqlar problemi. Bakı: Elm və təhsil, 2011.
5. Əlizadə Ə. İstedadlı uşaqlar. Psixopedaqoji məsələlər. Bakı, 2005.
6. Həmzəyev M. Yaş və pedaqoji psixologiyanın əsasları. Bakı, 2003.
7. Mustafayev T. Gənclərdə ədəbi yaradıcılıq meyillərinin formalaşması. Bakı, 1991.
8. Əlizadə Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı, 2004.

**Ш.Алиева,**
**А.Бахшалиев,**
**Г.Рахимова,**
**С.Хейдерова,**

**Психолого-педагогические особенности талантливых детей**

**Резюме**

Основной целью образования (возможно, первой) является - обеспечение талантливых детей возможностью открывать, развивать и реализовывать свои способности и возможности в профессиональной деятельности. Следует отметить, что общество ждет что эти дети решат его проблемы. Поэтому своевременное выявление, поддержка и развитие таких талантливых детей является приоритетом для обучения. Поскольку особая внутренняя мотивация является одним из компонентов таланта, его поддержка и развитие являются одной из центральных проблем развития личности. Рассмотрение таланта как систематических качеств предполагает развитие личностных особенностей талантливых детей в качестве основной цели обучения и воспитания. Это означает, что необходимо учитывать потенциальные возможности и потребности ребенка, системы мотивации, их навыки, темперамент и характер. Учитель всегда должен, в положительном смысле, держать этих детей под контролем.

Группировка талантливых детей в частных учреждениях может сопровождаться проблемами с точки зрения изменчивости детского таланта, атмосферы элитарности и общения. Образование талантливых детей в обычных классах и регулярными программами приводит к незаменимым потерям. Мы не должны быть безразличны к этой реальности.

**Sh.Aliyeva,**
**A.Bakhshaliyev,**
**G.Rahimova,**
**S.Heyderova**

**Psihologo-pedagogical features of talented children**

**Summary**

The main goals of education (perhaps the first one) is to ensure that talented children have the opportunity to discover, develop and implement their abilities and opportunities in professional activity. It should be noted that the society is mainly waiting for these children to solve their problems. Therefore, the timely detection, support and development of so talented children is a priority for the training. As special inner motivation is one of the components of the talent, its support and development is one of

the central problems of personality development. Consideration of the talent as systematic qualities suggests the development of personality traits of talented children as the main purpose of training and upbringing. This means that the child's potential capacities and needs, motivation systems, their skills, temperament, and character must be taken into account. Teacher should always keep these children, in a positive sense, under control.

Grouping of talented children in private institutions can be accompanied by problems in terms of child talent changeability, atmosphere of elitism and communication. Education of the talented children in ordinary classes and regular programs leads to irreplaceable losses. We should not be indifferent to this reality.

**Şəhla Əliyeva,**
***professor***

**Ərəstun Baxşəliyev,**
***professor***

**Qəribə Rəhimova,**
***dosent***

**Simnarə Heydərova,**
***dosent***
***Azərbaycan Dövlət Pedaqoji Universiteti***

* * *

# MƏKTƏBƏQƏDƏR VƏ İBTİDAİ TƏHSİL PİLLƏLƏRİ ARASINDA VARİSLİK TƏHSİLİN KEYFİYYƏTİNƏ TƏSİR EDƏN AMİL KİMİ

Məqalədə məktəbəqədər və ümumi təhsil pillələrində varislik məsələsi müasir təhsilin aktual problemlərindən biri kimi nəzərdən keçirilir. Bu varisliyin təmin edilməsi üçün məktəbəqədər və kiçik məktəbli yaş dövründə uşaq təfəkkürünün inkişaf xüsusiyyətlərinin və onların aparıcı fəaliyyətlərinin özünəməxsusluqlarının nəzərə alınmasının vacibliyi əsaslandırılmışdır. Məktəbəqədər və ibtidai təhsil arasında düzgün və rəvan keçidin təmin edilməsi üçün yeni yanaşmaların, təlim formalarının axtarılmasının, təhsilin məzmununda, təlim strategiyalarında əhəmiyyətli dəyişikliklərin edilməsinin vacibliyi vurğulanmışdır.

***Açar sözlər:*** *təhsil, məktəb, münasibət, uşaq bağçası, islahatlar.*
***Ключевые слова:*** *образование, школа, отношение, детский сад, реформы.*
***Key words:*** *education, school, contact, attitude, kindergarten, reforms.*

Azərbaycan Respublikasının dövlət təhsil siyasətinin strateji istiqamətlərindən biri də ibtidai təhsilin inkişaf etdirilməsidir. Məktəbəqədər təhsil bütün təhsil sisteminin bünövrəsidir, çünki məhz bu mərhələdə uşağın şəxsiyyət kimi formalaşmasının təməli qoyulur. Məhz buna görə də məktəbəqədər təhsilin uşaqların potensial imkanlarının üzə çıxarılmasında, məktəbə hazırlanmasında, onlarda mədəni keyfiyyətlərin, müstəqillik, yaradıcılıq, təşəbbüskarlıq, eləcə də həyati bacarıqların formalaşmasında mühüm rol oynayır.

Müasir təhsil mühitinin xüsusiyyətlərini şərh edərkən qeyd etmək lazımdır ki, hazırda təlimlə bağlı həm akademik, həm də tədqiqat fəaliyyətində innovasiyaların rolu əhəmiyyətli dərəcədə artmışdır. Eyni zamanda davamlı islahatlar kontekstində təhsildə düzgün təşkil edilmiş psixoloji və pedaqoji dəstək mühüm əhəmiyyət kəsb edir. Yüksək təhsil standartlarına keçmək və onların reallaşdırılmasında uğur əldə etmək üçün təhsil müəssisələrində müvafiq maddi-texniki bazanın yaradılması zəruri amillərdən biridir.

Son samanlar təhsil kurikulumlarında səriştəyönümlülüyün qabardılması və bu aspektin diqqət mərkəzində saxlanılması vacib məsələ kimi qarşıya qoyulmuşdur. Bu məsələdə beynəlxalq qiymətləndirmə proqramlarında şagirdlərimizin nəticələrini şərtləndirən vacib amil kimi nəzərədən keçirilir. Bu baxımdan ibtidai siniflərdə səriştəyönümlü təhsilin əsasını qoymaq, onun prinsiplərini tətbiq etmək üçün müvafiq pedaqoji-psixoloji əsaslar yaradılmalı və inkişaf etdirilməlidir. Bunun üçün də pedaqoji universitetlərdə müəllim hazırlığında da səriştəyönümlü təhsil prinsiplərinin tətbiqinə geniş yer verilməlidir.

Təhsilin səmərəliliyini və keyfiyyətini artırmaq üçün islahatlar şəraitində məktəbəqədər təhsil pilləsi ilə ibtidai və ümumi orta təhsil səviyyələri arasında varisliyin təmin edilməsi vacib amildir. Bunun üçün müəllimlərin peşəkar inkişafı məsələlərinə xüsusi diqqət yetirməklə yanaşı

şagirdlərin universal təlim fəaliyyətlərinin formalaşdırılmasında müəllimlərin fəaliyyətini metodik baxımdan dəstəkləmək, bu fəaliyyətlərin formalaşması və inkişafı üçün müasir təhsil texnologiyalarından məqsədyönlü şəkildə istifadə etmək lazımdır.

Məktəbəqədər və məktəb təhsilində varislik məsələsi müasir təhsilin aktual problemlərindən biridir. Bu varisliyin təmin edilməsi üçün məktəbəqədər və kiçik məktəbli yaş dövründə uşaq təfəkkürünün inkişaf xüsusiyyətləri və onların aparıcı fəaliyyət növlərinin özünəməxsusluqlarını nəzərə almaq lazımdır.

Varisliyin təmin edilməsi üçün ümumi təhsil məktəblərinin ibtidai təhsil pilləsində müvafiq informasiya mühitinin yaradılması olduqca zəruridir. Məktəbəqədər təhsil müəssisələrində müasir tədris texnologiyalarından geniş istifadə etmək və məktəbəqədər təhsilin məzmununu etno-mədəni və multikurtural aspektlərdə müasirləşdirmək və səmərəliləşdirmək lazımdır. Digər ölkələrdə məktəbəqədər və ibtidai təhsildə varisliyin təmin olunması üçün tətbiq edilən innovativ modellərin tətbiqinə dair ən yaxşı təcrübələri öyrənmək lazımdır.

Müşahidələr göstərir ki, əslində məktəbəqədər və ibtidai məktəb təliminin məzmununda, strategiyalarında bəzi ziddiyyətlər və uyğunsuzluqlar vardır. Problemin aktuallığı həm də ondan irəli gəlir ki, ildən-ilə uşaqların təlim motivasiyalarında azalma müşahidə edilir. Məktəbə öyrənmə həvəsi ilə gələn uşaqların məktəbə həvəsi ildən ilə azalır.

Təhsildə şagirdlərin motivasiya səviyyəsinin azalma dinamikası və onu doğuran səbəblərin dəqiqləşdirilməsi üçün müşahidələr və xüsusi tədqiqatlar aparılmalı, məktəb kursunun məzmununa, təlim strategiyalarına, prosedur qaydalarına əhəmiyyətli dəyişikliklər edilməlidir. Bu mənada, Finlandiya təhsil sisteminin təcrübəsi maraqlıdır. Bu təhsil sistemində məzmun, təlim strategiyaları, qiymətləndirmə və davamiyyət məsələlərində uşaqların rahatlıqları təmin edilmişdir. Sistem elə qurulmuşdur ki, uşaqların məktəbdə oxumaq istəyi, başqa sözlə, təlim motivasiyaları olduqca yüksəkdir, onlar məktəbə böyük həvəs və maraqla gedirlər.

Ali məktəblərdə müəllim hazırlığı prosesində tələbələrdə yaradıcı təfəkkürün inkişaf etdirilməsinə dair bacarıqlar formalaşdırılmır. İbtidai sinif müəllimlərinin tədris proqramında, ixtisasartırma kurslarında, uşaqlarda yaradıcı düşüncənin formalaşdırılmasına və inkişafına nisbətən az diqqət yetirilir. Bu səbəbdən müəllimlər məktəblərdə, bir qayda olaraq, standart dərslər keçməyə üstünlük verirlər. Məktəbəqədər təhsil dövrü uşaqlarda yaradıcı təfəkkür, yaradıcı düşüncənin inkişafı ilə müşayiət olunur. Uşaq yaradıcılığı məktəbəqədər təhsil müəssisələrində əsasən yaxşı inkişaf etdirilir. Məktəbdə isə müəllimlər öz davranış və təlim üsulları ilə bu ehtiyacı ödəmədikləri üçün şagirdlərin təlimə marağı sönür. Məktəb nəinki yaradıcılığın inkişafı üçün baza vermir, əksinə yaradıclıqla bağlı bütün fəaliyyəti, fərdi yanaşmaları məhdudlaşdırmaqla, bir növ uşaqları standartlaşdırmağa cəhd göstərir, yaradıcı təfəkkürün inkişafını məcburi olaraq ləngitməyə yönəlir, uşaqların yaradıcılığının inkişafını "söndürür" və onların öyrənməyə marağını azaldır. Məktəblərdə şagirdlərin yaradıcılığının inkişafına az yer verilir, onların fərdiliyi məhdudlaşdırılır. Məktəb təlimi uşaqları standartlaşdırmağa çalışarkən onların yaradıcı düşünmə bacarıqlarının inkişafını zəiflədir.

Məktəbəqədər təlimdən məktəb təliminə keçid zamanı rəvanlığın təmin olunması olduqca vacib pedaqoji və psixoloji problemdir. Mövcud təhsil pillələri arasında düz-

gün və rəvan keçidi təmin etmək üçün ibtidai siniflərdə öyrənmə strategiyalarına oyun elementlərini və əyləncəli dərsləri daxil etmək lazımdır. Hər iki təhsil fazasında oyun elementlərinin daha çox olması, əyləncəli dərslərin mövcudluğu, təlim prosesində uşaqların bir-birilə ünsiyyətinin bolluğunun təmin olunması zəruridir.

Fikrimizcə, məktəbəqədər və ibtidai sinif müəllimlərinin hazırlığı proqramlarında müvafiq uyğunluğun təmin edilməsi, bu sahədə inteqrativ kurs keçən müəllim ordusunun formalaşması daha məqsədəuyğun olardı. Hansı ki, həmin müəllimlər məktəbəqədər və ibtidai təhsilin xüsusiyyətlərinə bələd olmaqla yanaşı, həmdə təlimdə tələb olunan strategiyalara da yiyələnməlidirlər. Pedaqoji yönümlü fakültələrdə inteqrativ kurs keçən müəllimlər ordusu yaranarsa, onlar həmin keçidi daha yaxşı təmin edə bilərlər.

Məktəbəqədər və ibtidai təhsilin məzmununda musiqi, idman məşğələlərinin, hərəkətli dərs strategiyalarının tətbiqinə diqqət yetirmək lazımdır. Məktəbəqədər təlimlə məktəb təlimi arasında varisliyi və rəvan keçidi təmin etmək üçün qanunvericiliklə müəyyən olunmuş qaydada işlər görülməlidir. Azərbaycan Rebpublikasının Təhsil Qanununda məktəbəqədər təhsilin icbariliyi vurğulanır və bu səbəbdən məktəblərin nəzdində hazırlıq sinifləri fəaliyyət göstərir.

Qeyd edək ki, Azərbaycanda bəzi ümumtəhsil məktəbləri həm də məktəbəqədər təhsil pilləsini əhatə edir. Təhsilin keyfiyyətli, səmərəli və davamlı olması və müxtəlif fərqliliklərin tətbiqi üçün təhsil pillələri və səviyyələri arasında varisliyin təmin edilməsi vacibdir. Burada hər bir bağça-məktəb kompleksinin özünəməxsus yanaşması, özünəməxsus təlim strategiyası ola bilər. Bu da fərqliliyi təmin edən amildir. Ali məktəblərin pedaqoji fakültələrində təlim vahid proqram, vahid standartlar əsasında aparıldığından burada fərqlilikləri nəzərə almaq çox çətindir. Məktəb-bağça komplekslərində isə yaradıcılıqla yanaşıldıqda fərqlilikləri nəzərə almaq və təmin etmək olar. Bu həm də valideynlərə və uşaqlara seçim imkanı yaradır. Belə halların araşdırılması eyni zamanda məqsədyönlü eksperimentlərin aparılmasına da imkan verir. Bu zaman hansı halda hansı təcrübənin və ya yanaşmanın daha uğurlu olduğunu izləmək olar. Bu da gələcəkdə pedaqoji ali məktəblərin tədris proqramlarında müvafiq dəyişikliklərin edilməsi üçün faydalı material toplamağa imkan verir.

- Məktəbəqədər və ibtidai təhsil pillələri arasında varisliyi və fasiləsizliyi təmin etmək məqsədilə məktəbdənkənar fəaliyyətin sayını artırmaq lazımdır. Bu fəaliyyətlər uşaqların öyrənmə prosesinə marağının qorunmasına, təhsil prosesində rəngarənglik yaradılmasına, müəllim-şagird, tələbə-şagird, məktəb və valideynlər arasında münasibətlərin bərqərar olmasına kömək edir. Təhsilin hər iki pilləsində də mənəvi məsələlərə, birgə fəaliyyətlərə, münasibətlərə, bir-birinə hörmətə, təbiətə vicdanlı münasibətə, ekoloji təhsil məsələlərinə vacib yer ayırmaq lazımdır.

- Təlim prosesində uşaqların yaradıclığına təkan verən əl işləri, yaradıclıq işləri nümayiş etdirilməlidir. Uşaqların bu sahədə uğurları qeyd olunmalıdır. Məktəbəqədər və ibtidai təhsil pillələri arasında varisliyi və fasiləsizliyi təmin etmək məqsədilə musiqi fəaliyyətinin elementləri, idman məşğələləri, həmçinin sinifdə mobil oyun strategiyasına diqqət yetirməlidir.

-Təhsildə əsas dəyər uşaqdır. Məktəbəqədər yaş dövrü isə məktəb həyatına hazırlıqla yanaşı, həm də insan həyatının bütün mənəvi dəyərlərinin təməlinin qoyulduğu dövrdür. Bu aspektdən yanaşdıqda həm məktəbəqədər həm də ibtidai təhsil

pillələrində uşaqların şəxsiyyət kimi formalaşması gündəmə gəlməlidir. Onlara milli dəyərlərlə yanaşı, ümumbəşəri dəyərlərin aşılanmasının təməli qoyulmalıdır. Hər iki təhsil pilləsində mənəvi tərbiyə məsələləri, birgə fəaliyyət, bir-birinə münasibət, bir-birinə dəyər vermək, bir-bir ilə paylaşmaq, təbiətə münasibət və ekoloji tərbiyə məsələləri önəmli olmalıdır. Eyni zamanda qloballaşmanın mənfi təsirlərindən uzaqlaşmaq lazımdır. Milli oyunlar və oyuncaqlara üstünlük verilməlidir. Yad təsirlərdən uşaqlar qorunmalıdır. Bu dövrdə onların sinir sisteminə təsir edən amillər ömür boyu onları təqib edir. Milli profil formalaşmalıdır. Milli profil formalaşmadıqda, millilik qorunmadıqda, dəyərlərin bir-birinə qarışması, çaşqınlıq yaranır ki, bu da dəyərlər sisteminin pozulmasına gətirib çıxardır, bu isə öz növbəsində uşaqların ailədən qaçması, intihar halları ilə nəticələnir. Mühüm olan uşaqlarda dəyərlər sisteminin formalaşdırılmasıdır. Təlimdən daha vacib olan məsələ, tərbiyə faktorlarıdır. Və bu məsələ xüsusilə vurğulanmalıdır.

- Məktəbəqədər və ibtidai təhsilin varisliyini təmin etmək üçün təhsil və təlim strategiyaları kontekstində uşaqların psixikasının inkişaf xüsusiyyətlərini və onların aparıcı fəaliyyətinin xüsusiyyətlərini bilmək və nəzərə almaq vacibdir. İbtidai təhsildə uşağın müstəqil fikir yürütmək, münasibət bildirmək, müəyyən işləri sərbəst şəkildə görə bilmək imkanı yaradılmalıdır.

Birgə təlim fəaliyyətinin vacib komponenti olan uşaq xorlarının mövcudluğu bərpa edilməlidir. Ü.Hacıbəyli bildirirdi ki, xor oxumaq bacarığına malik olan insanlar bir ideya ətrafında birləşməyə daha yaxşı hazır olurlar. Əvvəllər məktəb təcrübəsində olan bu ideya yenilənməlidir. Milli zəmində xalq mahnıları, xalq rəqsləri milli təfəkkürün, milli ideyanın formalaşmasının vacib komponentlərindən biri olmalıdır. Uşaqlarda milli alətlərə pozitiv münasibət, milli alətlərdə ifa və milli musiqiyə maraq yaratmaq onların daxili aləmlərinin zənginləşməsinə şərait yaradır.

Uşaq orqanizminin, psixikasının inkişaf xüsusiyyətlərinə istinad edərək məktəbəqədər yaşlı uşaqlar üçün məktəb təliminə adekvat hazırlıq sistemini təkmilləşdirmək olar. Hazırda bu sahə "Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu" və bir sıra digər normativ-hüquqi aktlarla tənzimlənir. Qanunda 5 yaşlı uşaqlar üçün məktəbəqədər təhsilin zəruri olduğu bildirilir. Məktəbdə alınan təhsilin daha effektiv olması və uşağın erkən yaşlarından etibarən formalaşması, məktəbəqədər və ibtidai təhsil pillələri arasında varisliyi təmin etmək üçün məktəbəqədər hazırlıq böyük əhəmiyyət kəsb edir. İbtidai təhsil məktəbəqədər təhsilin davamı kimi vahid sistemdə birləşdirilməlidir. Yalnız bu halda uşağın psixoloji və mənəvi cəhətdən məktəb təliminə hazır olmasından danışıla bilər. Varislik, ilk növbədə, inkişafa xidmət etməli, hər hansı yenilik özündən əvvəlkilərin mahiyyətcə zənginləşməsi və əhatə dairəsinin genişlənməsi üzərindən təqdim edilməlidir.

Müasir cəmiyyətin inkişafı məktəbəqədər təhsil sahəsinin, xüsusilə də məktəbəhazırlıq prosesinin qarşısına yeni tələblər qoyur. Bu tələblərə cavab vermək üçün, ilk növbədə, uşaqların hər bir təhsil pilləsində hərtərəfli, milli və bəşəri dəyərlər zəminində inkişafı, qloballaşmanın mənfi təsirlərindən qorunması, valideynlərin maarifləndirilməsi, tərbiyəçi, müəllim və digər pedaqoji kadrların peşəkarlıq səviyyəsinin təkmilləşdirilməsi çox vacib məsələlərdəndir.

***Rəyçi: prof. H.Əlizadə***

## İstifadə edilmiş ədəbiyyat

1. Преемственность между дошкольной и начальной ступенями образования как фактор реализации задач ФГОС/ Сборник материалов международной научно-практической конференции. АЛЕФ, Грозный 2017.

2. Лункина Е.Н. Подготовка детей к школе. Программа и методические рекомендации, ВЛАДОС

3. Коломинский Я.Л., Стрелкова О.В. Психологическая культура детства.

4. http://edu.gov.az/az/page/255/2243 Məktəbəqədər təhsilin dövlət standartı və proqramı (20.12.2017).

**Э.Бейляров,**
**Б.Алекперова,**
**Х.Бейлерова**

**Ступени между дошкольным и начальным образованием, как наследственный фактор, влияющий на качество образования**

**Резюме**

В статье рассматривается вопрос преемственности в дошкольном и школьном образовании как одной из актуальных проблем современного образования.

Для обеспечения данной преемственности обосновывается важность учета особенностей развития детского мышления и их ведущей деятельности в школьном и дошкольном возрасте.

Подчеркивается важность поиска новых подходов, форм обучения, значительных изменений в содержании образования, стратегий обучения для обеспечения правильного и плавного перехода между уровнями дошкольного и начального образования.

**E.Baylarov,**
**B.Alekperova,**
**H.Beylerova,**

**Steps between preschool and primary education, as a hereditary factor, affecting the quality of education.**

**Summary**

The article considers the question of continuity of school and preschool education as one of the actual problems of modern education.

For the purpose of ensuring such continuity the necessity of children’s thinking development and their leading activity at school and preschool age is justified.

The importance of searching new approaches, teaching methods, significant changes in the content of education, learning strategy in order to ensure right and smooth transition between school and primary education is emphasized.

**Elxan Bəylərov,**
***psixologiya üzrə elmlər doktoru***

**Bahar Ələkbərova,**
***Azərbaycan Respublikası Təhsil İnstitutunun böyük elmi işçisi***

**Həlimə Bəylərova,**
***199 saylı uşaq bağçasının musiqi rəhbəri***



# RƏŞİDBƏY ƏFƏNDİYEVİN İRSİNDƏ QADIN TƏHSİLİ MƏSƏLƏLƏRİ

**Hüseyn Əhmədov**
***Akademik***

Azərbaycanın qabaqcıl ziyalılarının elmi-pedaqoji fəaliyyətində qadın azadlığı və qadınların təhsili problemi mühüm yer tutmuşdur. Onlar çox yaxşı dərk edirdilər ki, beş-on ziyalı ilə iş görmək olmaz. Qarşıda duran böyük ictimai-siyası vəzifələrin öhdəsindən gəlmək üçün geniş xalq kütləsinin, o cümlədən qadınların savadlanması lazımdır.

Arxiv sənədləri və dövrü mətbuatla tanışlıqdan məlum olur ki, hələ XIX əsrin ortalarından üzü bəri istər Bakıda, istərsə də Cənubi Qafqazın inzibati mərkəzi ilə bərabər həm də mədəni mərkəzi olan Tiflis şəhərində qadınların təhsili qızğın mübahisələrə və müzakirələrə səbəb olmuşdur. Bu müzakirələrdə məsələnin tərəfdarları ilə əleyhedarları arasında gedən mübahisələr barəsində dövrü mətbuatda, o cümlədən rus dilli mətbuatda iri həcmli məqalələr dərc edilirdi. 1896- cı ildə "Qafqaz" qəzetinin 52-ci sayında dərc edilmiş "Tiflisdə müsəlman qadın məktəbi açılması məsələsinə dair" adlı iri həcmli məqalə bu cəhətdən çox xarakterikdir.

Məqalədən məlum olur ki, ölkənin müsəlman əhalisinin qadınları üçün xüsusi məktəb açılması barədə hələ 1883-cü ildə hökümətin razılığı olmuşdur. Lakin keçən müddət ərzində müsəlmanların nadanlıq inamında qalan hissəsi şəriətlə müsəlman qızlarının sivil xalqlara məxsus məktəblərdə oxumasını yol verilməz hesab edirdilər.

Məqalədə bu məsələ barəsində Zaqafqaziya Şeyxülislami ilə Zaqafqaziya müftisi Hüseyn Əfəndinin mövqeyi xüsusi vurğulanır və göstərilir ki, Hüseyn Əfəndi məsələnin əleyhedarlarının fikirlərinin əsassız olduğunu və şəriətə zidd olduğunu göstərmiş, müsəlmanların müqəddəs kitabı olan Qurandan sitatlar gətirərək qızların elm öyrənmələrini, başqa xalqların dilini mənimsəməsini şəriətin vacib hesab etdiyini qeyd etmişdi. Məqalədə deyilir ki, cənab Qayib təsdiq edir ki, təhsil almaq, elm öyrənmək kişilərə nə qədər faydalıdırsa, qadınlara da o qədər faydalıdır və lazımdır.

Məqalənin sonunda o da qeyd olunur ki, cənab Qayıbovun özünün oğlanları və qızları təhsilin rus dilində verildiyi orta məktəblərdə oxuyurlar. Onun böyük qızı üç il bundan əvvəl Zaqafqaziyada qızlar institutunu (1, səh. 2) bitirmişdir (görünür general Əli Ağa Şıxlinskinin həyat yoldaşına işarədir

- H.Ə.). "Qafqaz" qəzetinin növbəti sayında (1896, № 44, səh. 2) dərc edilmiş məlumat xarakterli bir yazıda deyilir ki, "Kaspi" qəzetinin yaydığı xəbərə görə Moskva universitetində təhsil almış Həsən bəy Məlikov Zərdabi Bakı qubernatoruna müraciət edərək Bakıda müsəlman qızları üçün rus-tatar məktəbi açmağa icazə verməsini xahiş etmişdir. 3 illik təhsil müddəti olan bu məktəbdə ümumi təhsil fənləri ilə yanaşı, ailə həyatı üçün faydalı olan müxtəlif əl işləri də öyrədiləcəkdir. Müəllimliyə Tiflis "Müqəddəs Nina" qız məktəbini bitirənlər qəbul olunacaq (2, səh. 2).

Azərbaycan maarifçiləri, başda Həsən bəy Zərdabi olmaqla, qadınların ümumi təhsilini irəli sürür və onu qızğın müdafiə edirdilər. Həsən bəy Zərdabi "Əkinçi" qəzetində yazırdı: "Kişilər üçün nə qədər məktəb açsaq da arzu etdiyiniz məqsədə çata bilməyəcəyik. Qadınlar elmdən və təhsildən kənarda qalırlar. Halbu ki, gənc nəslin tərbiyəsində qadın böyük rol oynayır" (3, № 11).

Dövrün məşhur maarifçisi və pedaqoqu olan Firidun bəy Köçərli də bu fikirləri müdafiə edirdi. O, məqalələrinin birində yazırdı. "Müsəlman qız məktəbinin açılması Qafqaz müsəlmanlarının tarixində yeni dövrün başlanğıcı olacaqdır. Belə ki, müsəlman qızları təhsil alması ilə vəzifələrini yaxşı başa düşən evdar qadın və analar meydana gələcəkdir (4).

Böyük çətinliklər olsa da bütün bunlar onunla nəticələndi ki, H.Z.Tağıyevin Qafqaz Tədris Dairəsinə müraciəti, məktəb üçün yeni və müasir bina tikdirməsi, məktəbin illik xərcini öz öhdəsinə götürməsi sayəsində 1901-ci il oktyabr ayının 7- də bütün Qafqazda ilk dəfə olaraq Bakıda müsəlman qız məktəbi meydana gəldi. (5, səh. 376). Bu ilk müsəlman qız məktəbinin müvəffəqiyyəti sonralar Tiflisdə, İrəvanda, Naxçıvanda və başqa yerlərdə də yeni qız məktəblərinin meydana gəlməsinə, xüsusilə də Azərbaycan ziyalılarının qadın azadlığı və qadın təhsili problemi ilə bağlı fikir və mülahizələrin inkişafına bir növ yeni təkan verdi.

Belə ziyalılardan biri də XIX əsrin sonları və XX əsrin birinci yarısında yaşamış məşhur Azərbaycan pedaqoqu və maarifçisi, tanınımış publisist, etnoqraf və yazıçı Rəşid bəy Əfəndiyev idi (1863-1942).

Rəşid bəy Əfəndiyev 1863-cü ildə Azərbaycanın qədim elm və mədəniyyət mərkəzlərindən biri olan Nuxa (Şəki) şəhərində anadan olmuşdur. İlk təhsilini ənənəvi ruhani məktəbində almış, sonralar isə burada açılmış təhsilin əsasən rus dilində verildiyi şəhər məktəbində davam etdirmişdir.

1879-cu ildə Qori şəhərində əsası qoyulan Zaqafqaziya Müəllimlər Seminariyasının Azərbaycan şöbəsinə qəbul olunan ilk seminaristlərdən biri olmuşdur. 1882-ci ildə oranı bitirib bir müddət Qutqaşendə (Qəbələ) açılmış ikisinifli ibtidai məktəbə müdir və müəllim təyin olunmuşdur. Rəşid bəy bu dövrdə həm də Qafqaz Arxeoloji Cəmiyyətlə əməkdaşlıq etmiş, özünün ilk əsərlərini o cümlədən "Nour gölü", "Qutqaşen kəndi haqqında bir neçə

məlumat", "Nuxa qəzasında xalq səhiyyəsi" adlı məqalələrini də burada çap etdirmişdir.

Rəşid bəyin yüksək bilik və savadı tez bir zamanda onun Tiflisdə, sonra isə Qori Müəllimlər Seminariyasında təhsil almış, müəllimlik vəzifəsinə qədər yüksəltmişdir. Qafqaz Təhsil Dairəsinin popeçiteli tərəfindən fərqlənmə medalı ilə təltif olunan Rəşid bəy daha sonralar İrəvan Quberniyasında müsəlman məktəblərinin müfəttişi, Naxçıvanda və Kuban vilayətində qısa müddətli pedaqoji kursların təşkilatçısı olmuş, 1918-1919-cu illərdə Bakıda Müəllimlər Seminariyasının direktoru vəzifəsində, ömrünün sonuna qədər Nuxa pedaqoji məktəbində rus dili müəllimi vəzifəsində işləmişdir. Rəşid bəy Əfəndiyev ömrünü şam kimi xalqın istiqbalı, istiqlalı, tərəqqisi və milli mədənyyətinin inkişafı yolunda əritmişdir (7, səh. 29).

Rəşid bəy Əfəndiyev 1942-ci il avqust ayının 31-də doğma şəhərində 79 yaşında vəfat etmişdir. Onun yaşadığı ev ölkəşünaslıq muzeyinə çevrilmişdir.

Onun pedaqoji görüşlərində dövrünün təlim-tərbiyə sisteminin bir sıra məsələlərinə aid maraqlı və bu gün də əhəmiyyətini itirmiəyən cəhətlər vardı. Onlardan biri də qadın azadlığı və qadın təhsili problemidir.

R.Əfəndiyev təhsil və elm öyrənmək məsələsində qadınların kişilərlə bərabər hüquqa malik olmasını qızğın müdafiə etmişdir. Bu məsələ onun pedaqoji görüşləri içərisində mühüm yerlərdən birini tutur. Onun qadın azadlığı və qadın təhsilinə aid fikirləri 1914-cü ildə nəşr etdirdiyi "Arvad məsələsi" adlı məşhur kitabında və bir sıra məqalə, şeir və hekayələrində öz əksini tapmışdır.

O, dövründəki qadın əsarətini görmüş, qadınları əsarətdə saxlayanlara, onların təhsil almasına mane olanlara qarşı barışmaz mübarizə aparmış və qadınların cəhalətdə qalmasını böyük "uçurum" və "fəlakət" hesab etmişdir. R.Əfəndiyev qadın azadlığı və təhsili məsələsində öz sələflərinin ideyalarını davam etdirmişdir.

Məşhur din xadimləri Şeyx-ül-İslam və müfti kimi, Rəşid bəy də qadın azadlığı və qadınların təhsili məsələsini "Qurani-Əzimşan"ın və şəriətin tələbləri və peyğəmbərimizin işlətdiyi və söylədiyi hədislərlə izah etmişdir. Əsərin müqəddəməsində deyilir: "Müsəlman olan şəxs gərəkdir ki, tutduğu əməlini şəriətə uyğunlaşdırsın". Lakin "camaatlarımız arasında şəriətimizdən xəbəri olmayan bir para bidətlərimiz (köhnə fikirli adamlarımız-H.Ə.) vardır ki, məzərrəti (zərərləri) həddən aşıb, hələ də islam aləminin başına böyük-böyük müsibətlər gətirməkdədirlər…" Onun fikrincə bu köhnə fikirli adamların günahlarından biri də analarımızı və bacılarımızı, arvadlarımızı və qızlarımızı avam saxlayıb elmdən faydasız qoymaq və beləliklə onları heyvan dərəcəsinə endirib şəriətdən və mərifətdən məhrum etməkdir. Müəllifin fikrincə belə analardan törəyən övlad da analarına bənzəyəcəklər. Müəllif daha sonra deyir ki, təbiətin qanunu belədir ki, xoruzdan və toyuqdan qızılquş və tərlan törəməz. Tülküdən və çaqqaldan aslan və pələng törəməz" (6, səh. 1).

O, qadınların elm öyrənməsinin

əhəmiyyətini gənc nəslin tərbiyəsi ilə əlaqələndirir və göstərir ki, qadınların savaddan, elmdən məhrum olması onların övladlarının inkişafına da mənfi təsir göstərir.

Rəşid bəyin fikrincə hər hansı bir xalqın mədəni cəhətdən tərəqqi etməsi və xoşbəxtliyi həm də qadınların savadlı olmasından asılıdır. O, yazmışdır: "Təcrübə ilə isbata yetmişdir ki, hər millətin, hər bir tayfanın səadəti və xoşbəxtliyi arvadların dərəceyi-elmiyyəsindən asılıdır".

R.Əfəndiyev qadın azadlığı və qadın təhsili məsələsini onların çadranı atması ilə əlaqələndirir. O göstərir ki, bütün yer üzündə yaşayan arvadların hamısı üzlərini örtürsə, onda bizim arvadların da üzlərini örtmələri vacibdir. Çadıra məsələsində Rəşidbəy kişilərin müdaxiləsinin əleyhinə çıxaraq yazmışdır: "Üz arvadlarındır, açmaq və örtmək haqqı dəxi arvadlara məxsusdur".

Rəşid bəyin fikrincə ana təbii tərbiyəçidir. O, göstərir ki, uşağı bəsləyən, onun qayğısını çəkən, onu tərbiyə edən, elmi-hali öyrədən, halal və haramı ayırd edən anadır. O, qadınlara bəzəyə-düzəyə, zərə-ziynətə uymamağı tövsiyə edir. Onun fikrincə qadının ən böyük bəzəyi onun ailəsi və düzgün tərbiyə etdiyi uşaqlar olmalıdır. R.Əfəndiyev "Ana kimdir" şeirində kişilərə müraciət edərək deyir ki, sizi doğanı, yedirdib, içirdən, hər cür bəlalardan qoruyan, qayğınıza qalan Anadır. O yazmışdır:

"Kim sizi hifz edir bəlalardan?
Əl çəkib qövmi əqrabalardan,
Qaçmayıb cövrüdən-cəfalardan,
Qara günlü, yazıq, cavan ananız.!
Cani-candan sizə yanan ananız!"(6, səh.2)

O, qadınları başa salırdı ki. Sizin Nüşabə və Şirin kimi, qəsbkar şahlarla vuruşan, öz haqqını və namusunu qəhrəmanlıqla müdafiə edən çox ağıllı əcdadınız olmuşdur. Siz də onlar kimi azad və qəhrəmancasına mübarizə aparıb haqq və hüququnuzu müdafiə edin.

Rəşid bəy şəriətdə anaların dərəceyi-elmiyyəsini də göstərir.

O yazırdı ki, bir gün Rəsullahın (s.ə.s.) hüzuruna bir ərəb gəlib sual elədi: "ya nəbiyyən, mən dünyada yaşadıqca bacardığım yaxşılığı və ehsanı kimə eləyim?" Peyğəmbər buyurdu: anana. Yenə ərəb soruşdu: sonra kimə eləyim? Peyğəmbər buyurdu: Sonra yenə anana elə. Ərəb bir də soruşdu: Peyğəmbər yenə cavab verdi: yenə anana elə. Ərəb dördüncü sual elədi və salavatullah bu dəfə cavab verdi: atana elə".

İş bu hədisi-şərifdən görünür ki, şəriətdə ananın hörməti və xidməti üç və daha çox dərəcədə atanın hörmətindən və xidmətindən artıqdır. Analar arvad taifəsinə, atalar kişi taifəsinə mənsub olduqları üçün arvadların kişilərə nisbətən artıq dərəcələrə layiqincə hörmət və müdafiə edilmələri açıq izah edilmişdir.

Bu barədə başqa-başqa hədislər dəxi vardır, məsələn:

Behişt analarınızın ayaqları altındadır.

Cənnətdən müqəddəs və behiştdən ali Haqqtəala nə bu dünyada və nə axirətdə bir şey xəlq etməməsi cümlənin məlumudur. O müqəddəs məkanda övliyaların və başqalarının gözəl məqamları vardır. Bu sayaq müqəddəs və möhtərəm bir məqamı anaların

ayağının altına salmaqdan murad cənnət həqir olmaqçün buyrulmayıblar. Və lakin analarımızın qədr və məzilətini ali, olduqca ali və müqəddəs, olduqca müqəddəs tutmaq üçün buyurulmuş bir hökmü qatidir...Varmı yer üzündə Adəm əleyhissalamdan başqa anasız vücuda gələn bir nəfər? Və varmı yer üzündə həmçinin bir nəfər ünas taifəsi ki, analıq vəzifəsindən qeyri surətdə xəlq olunsun? Əlcavab: "xeyr, yoxdur!" pəs arvad layiq hörmətdir və cənnət (arvadların) ayağının altındadır demək iş bu hədisi şərifin mənasını xətaya verməz zənnindəyəm".

Elm fərzdir. Cəmi müsəlman kişilərinə və müsəlman arvadlarına bir bərabərdi. Bu hədisi şərifə görə elm oxumaq dinimizdə bir "fərizə" dən hesab olunur, yerinə yetirilməsi vacib olan işlərdəndir.

Rəşid bəy elm oxumağın vacibliyini dönə-dönə qeyd edir və göstərir ki, hansı kəslərin ki, qəlbləri elmdən bixəbərdir, gözləri həqiqəti görməkdən kordur, qulaqları həqiqəti eşitməkdən kardır, onlar heyvan kimidirlər və doğru yoldan azmış halındadırlar. Arvad da, kişi də insandır, pəs arvadın da qəlbi elmi ilahidən bixəbər olsa, arvadın da gözü həqiqəti seçməkdən kor kimi olsa, qulağı da eşitməkdən kar kimi olsa, arvadlar da heyvandır, zəlalət içində azğındır. Açıq-aydındır ki, elmi-biliksiz arvadlar da cəhənnəmlikdir.

Salavatullaha ən əvvəl nazil olmuş ayeyi-şərifdə Haqqtəala buyurubdur:

"Oxu ya Məhəmməd! Sənin xaliqin çox mərhhəmətlidir ki, qələm ilə yazmaq və oxumaq peşəsini öyrətdi və insana öyrətdi ol şeyi ki, insan bilməzdi. Əgər cəmi Allah nemətlərindən yazmaqdan və oxumaqdan daha ali və daha müqəddəs bir nemət təsəvvür olunsaydı, Haqqtəala bu məqamda onun haqqında da zikr edərdi..əgər elm və bilik yalnız kişilərə məxsus olsaydı...o surətdə elmül-insan buyurmazdı... çünki, kişi də, arvad da insandır, hər ikisi də elmə və mərifətə istedadlı xəlq olunublar.

Quranın hökmünə görə elm Allahın sifətidir. Hər kəsdə bu sifətdən bir əsər olsa onun dərəcəsi ali olar (6, səh. 4).

Bütün bunları göstərən Rəşidbəy oxuculara müraciət edərək oxudun qızları, ey camaat, onlara ali məktəblər açın. Zəmanəmizdə əsrin tələbi başqadır,- deyir."

Şeirlərindən birində bir qız molladan sual edib deyir ki, "nə üçün oğlanlar elm alır yalqız? Nə olar biz də elm öyrənsək?" Qız sualın cavabını da özü deyir. "Elm insan üçün şərafətdir. Nə olar biz də elm öyrənsək?"

Müqəddəs Quranın tələblərini bir yana qoyub, şəriətə böhtan söyləyən "arvadlara yazı-yazmağı haram" buyuran nadan mollaya qız belə cavab verir:"oxuyub şəriətimizin əmrini bilmək, alim olmaq bir özgə nemətdir".

Rəşid bəy ananın məişətdəki vəzifəsini dəryada üzən bir gəminin kapitanına bənzədir və yazır ki, gəminin sahilə salamat çatdırılması kapitanın elmli və təcrübəli olmasından asılı olduğu kimi, ailənin də maddi və mənəvi xoşbətliyi məhz anaların

elmli və ziyalı olmasından asılıdır.

Rəşid bəy Əfəndiyevin "Qadın məsələsi" əsərinin bir hissəsini onun öz şeirləri təşkil edir. Bu şeirlərdən biri "Anamıza xitab", digəri isə "Qaragünlü arvadlarımızın halından şikayət" başlığı altındadır. Müəllif burada da qadınları elm-bilik əldə etməyə çağırır. "Anamıza xitab" şeirində deyilir:

"Qalx ayağa, ayıl, oyan anamız!
Toxta, bir hala gəl, dayan anamız!
Get oxu, elmini avam qalma
Nökər oğlu nökər adın alma
Şahlardan, bac alan anamız!
Lərzələr canlara salan anamız!"

Rəşid bəy "Müəllim həqiqi Allahdır" adlı digər şeirində ananı ailəni bəxtəvər edən şəxs kimi tərənnüm edir, millətin anası adlandırır. "Vətəninə, millətinə, dininə, xadim olacaq, mərifətli ananı ərsəyə məktəb gətirir" deyir.

Rəşid bəy Əfəndiyevin "Qadın məsələsi" adlı əsərində şəriətə görə müsəlmanların ictimai və ailə vəziyyəti qələmə alınmışdır.

Müəllif bu əsərində tərbiyə məsələlərindən də bəhs edir. Kitabda "tərbiyə xüsusunda" adlı ayrıca bir bəhs vardır. Burada insanların tərbiyəsi ilə bağlı dəyərli fikirlər şərh olunmuşdur. Müəllifin fikrincə "İnsanları bəsləyib onun bədəninə, ruhuna və əxlaqına yavaş-yavaş qüvvət kəsb etdirməyə tərbiyə deyilir" (6, səh. 6).

Müəllifin fikrincə hər bir kəs bədəncə, ruhca və əxlaqca üç qism tərbiyəyə möhtacdır. Birinci qism bədəndə mövcud olan üzvlərin hər birinin maddi və mənəvi cəhətinin bəslənməsi ilə bağlıdır. İkinci qism həm ruhun, həm də qəlbin tərəqqisinə dairdir. Üçüncü qism tərbiyə əxlaq ilə əlaqədardır.

Rəşid bəyin fikrincə bu üç qisim tərbiyədən məhrum olan  şəxs həqiqətdə adam cərgəsindən sayılmaz. Çünki zəif bədəndə ruh da zəif olur. Əxlaq cəhətincə də öz nəfsinin əsiri olacaqdır. "Quran buyurur: Adəm övladını biz daha qiymətli və nəcib xəlq elədik, fəzilət (bilikli, istedadlı, alicənab- H.Ə.), mərifət və mərhəmət sahibi yaratdıq. Həqiqətdə isə hər kəs bilsə ki, mən adamam, mərifət sahibiyəm, alicənabam heç vaxt "Ədəb və tərbiyə dairəsindən çıxmaz, yırtıcılığı və vəhşiliyi özünə ar bilər". Bu keyfiyyətlər insanda anadangəlmə, yəni fitri deyil, sonradan tərbiyə sayəsində kəsb olunur. Müəllif öz fikrini təbiət hadisələri ilə, hətta heyvanat aləmindən gətirdiyi misallarla təsdiq edir. O yazır ki, meşələrdə, tərbiyəsiz qalmış göyərtilər də vəhşi halında meyvələr verir. Vəhşi canavarlar da tərbiyə olunduqda təbiətini dəyişib ünsiyyətə adət edirlər..

Bunların hamısı tərbiyənin bərəkətindən əmələ dəlir. Müəllifin fikrincə, insana uşaqlıqda nə qərarda tərbiyə verilsə, ölənə qədər o tərbiynin vacibliyi ilə yaşayacaqdır. Bu isə tərbiyə verən anaların özlərinin tərbiyəli olub, dərəceyi-elmiyyəsindən asılıdır. Elmli və tərbiyəli anaların qucağında səidlər (xoşbəxtlər-H.Ə.) ərsəyə gələr. Elmsiz, avam anaların qucaqlarında şərarlar-fəlakət və şəqilər (yaramaz adamlar-H.Ə.) bəslənər" (6, səh. 7).

Rəşid bəy bütün bunlardan sonra ailə tərbiyəsini, ata-ananın vəzifələrini göstərir və qeyd edir ki, bu vəzifələri kamalınca bilmək "ancaq təlim və tərbiyə sayəsində mümkün olur". Hər bir ailənin xoşbəxt olması və bəxtəvər yaşaması dəxi o külfətin başçıları olan ata və analıq vəzifəsini layiqincə yerinə yetirmələrindən asılıdır. Bu işdə ananın vəzifəsi həm ağır, həm də məsuliyyətlidir. O, ananı evin hər səliqəsini əmələ gətirən hesab edir. Ana öz körpə balasını yedizdirmək, bəsləməsindən uşaq dil açıb danışmasından tutmuş onun əqlini, əqidəsini inkişaf etdirəndir, yaxşını pisdən, haramı halaldan, savabı günahdan, ədəbi ədəbsizlikdən fərqləndirən də anadır. Burada o peyğəmbər əleyhissəlamdan gətirdiyi bir misal da maraqlıdır. Orada deyilir: "Arvadlar hamilə qalırlar, doğurlar, uşaqlarını əmizdirirlər, övlada rəhimli və şəfqətli olurlar. Əgər ərləri ilə gözəl rəftar etsələr cənnətə daxil olmaqlarına şübhə yoxdur". Bütün bunlardan sonra müəllifin gəldiyi nəticə belədir: Ananın öhdəsinə düşən vəzifələrin hamısını nəzərə alanda görünür ki, "hamıdan artıq elm oxumaq arvadlara vacibdir" (6, səh. 8).

Böyük maarifçi, tanınımış müəllim Rəşid bəy Əfəndiyevin və onun sələflərinin, məsləkdaşları olan müasirlərinin arzuları zəmanəmizdə həyata keçmişdir. Bu gün Azərbaycan qadını nəinki özü elm oxuyur, təhsil alır, minlərlə balalarımıza təhsil verir. Bu gün Azərbaycan qadını müstəqil Azərbaycan dövlətinin, dövlətçiliyimizin keşiyində durur.

## İstifadə edilmiş ədəbiyyat


1. К вопросу об открытии женского мусульманского училища в Тифлис / газ. «Кавказ» № 52, 1896 г.

2. Баку, газ. «Кавказ» № 44, 1896 г.

3. "Əkinçi" qəzeti, № 11,1876- cı il.

4. Фирудин бек Кочарлинский. «О положении женщин и воспитание детей у мусульман». / Газета «Новое образование», № 4115, 1895 г.

5. Əhmədov H. XIX əsr Azərbaycan məktəbi. Bakı-Təhsil NPM, 2006-cı il. 580 s.

6. Рашид бек Эфендиев. Женский вопрос. Общественное и семейное положение мусульман по шариату. Тифлис, 1914, 27 с.

7. Əhmədov H.H. Azərbaycan təhsilinin inkişaf strategiyası. Bakı: Elm, 2010, 800 s.



# İRƏVAN MAARİFÇİLİYİ

**Rüfət Hüseynzadə,**
***pedaqogika üzrə elmlər doktoru, professor, əməkdar müəllim***

***Açar sözlər:*** *İrəvan Müəllimlər Seminariyası, pedaqoji kadrlar, müəllimlər, məzunlar.*
***Ключевые слова:*** *Иреванская Учительская Семинария, педагогические кадры, преподавателей, студентов.*
***Key words:*** *Irevan teachers' seminary, teachers personnel, teachers, students.*

Qədim Azərbaycan torpağı olan İrəvanın maarifçilik mühiti ilə tanış olan müasir oxucu, xüsusilə gənclərimiz bizim qədim, ulu torpaqalrımızın Qərbi Azərbaycan dediyimiz məkanda, əzəli Azərbaycan torpaqlarında xalqımızın necə zəngin maarif və mədəniyyətə sahib olduğunun, necə dəyərli məktəblər, texnikumlar, ali məktəblər yaratdıqlarının, bu təhsil ocaqlarında necə fədakar, səriştəli, peşəkar pedaqoji kadrların, elm xadimlərinin yetişməsini öyrəndikcə milli iftixar hissi keçirir və qürur duyurlar.

Ölkə Prezidenti cənab İlham Əliyev YAP-ın VI qurultayındakı nitqində demişdir: "Onu da qeyd etməliyəm ki, biz tarixi torpaqlarımızı da unutmamalıyıq və unutmuruq. Bu da gələcək fəaliyyətimiz üçün istiqamət olmalıdır, necə ki, biz bu gün də bu istiqamətdə iş görürük. Bizim tarixi torpaqlarımız İrəvan xanlığıdır, Zəngəzur, Göyçə mahallarıdır. Bunu gənc nəsil də, dünya da bilməlidir. Mən şadam ki, bu məsələ ilə bağlı - bizim əzəli torpaqlarımızın tarixi ilə bağlı indi sanballı elmi əsərlər yaradılır, filmlər çəkilir, sərgilər təşkil olunur. Biz növbəti illərdə bu istiqamətdə daha fəal olmalıyıq və dünyanın müxtəlif yerlərində sərgilər, təqdimatlar keçirilməlidir. Çünki İrəvan bizim tarixi torpağımızdır və biz azərbaycanlılar bu tarixi torpaqlara qayıtmalıyıq. Bu, bizim siyasi və strateji hədəfimizdir və biz tədricən bu hədəfə yaxınlaşmalıyıq" (1).

Mənbələrdən məlum olur ki, İrəvanda dünyəvi məktəblər açılana qədər hələ XIII, XIV əsrlərdə Novruzəli bəy məscidi, Abbas Mirzə məscidi, Şah Abbas məscidi və digər adlarla məscidlər inşa edilmişdir ki, bu məscidlərin nəzdində mollaxana və mədrəsələr fəaliyyət göstərmişdir. XVIII əsrdə İrəvan xanı Hüseyn Əli xanın əmriylə 1766-cı ildə burada möhtəşəm Göy Məscid inşa edilmişdir ki, bu İrəvan şəhərində o dövrdə inşa edilən məscidlərin ən böyüyü hesab edilmiş və onun nəzdinə məktəb və mədrəsələr fəaliyyət göstərmişdir (3 səh, 14).

Daha sonralar xanlıqlar Rusiya

tərəfindən işğal olunduqdan sonra İrəvanda Qəza məktəbləri, progimnaziyalar, gimnaziyalar, realni məktəblər və s. məktəblər yaranmışdır.

XIX əsrin sonlarında pedaqoji kadr hazırlığında Qori Müəllimlər Seminariyasının və İrəvan Müəllimlər Seminariyasının azərbaycanlı məzunlar yetişdirməsində böyük rolu olmuşdur. 1879-cu ildə Qori Müəllimlər Seminariyasının Azərbaycan şöbəsi yaradıldı ki, burada 40 il müddətində 300-ə qədər azərbaycanlı məzun təhsil almışdır. Onların arasında Nəriman Nərimanov, Firudin Bəy Köçərli, Rəşid Bəy Əfəndiyev, Cəlil Məmmədquluzadə, Üzeyir Hacıbəyli, Süleyman Sani Axundov, Səfərəli bəy Vəlibəyov, Mirzə Əliməmməd Xəliov, Məmmədəli Sidqi Səfərov, Əlirza Rasizadə, Əli Səbri Qasımov, Fərhad Ağazadə və başqaları olmuşdur (4, səh. 45).

1880-ci illərin əvvəllərində İrəvanda kadr hazırlayan üç böyük tədris müəssisəsi yaranıb fəaliyyət göstərmişdir. Onlardan biri 1881-ci ildə açılmış İrəvan Kişi Gimnaziyası, ikincisi yenə həmin il - 1881-ci ildə yaranmış İrəvan Müəllimlər Seminariyası və üçüncüsü 1884-cü ildə yaranmış İrəvan qız progimnaziyasıdır. İrəvan Müəllimlər Seminariyası 1881-ci ilin 8 noyabrında fəaliyyətə başlayan və 37 il fəaliyyət göstərən bu təhsil ocağı 1918-ci il avqustun 6-da İrəvan gimnaziyası və Uluxanlı məktəbi ilə eyni vaxtda bağlanmışdır.

Qori Müəllimlər Seminariyasını bitirən məzunların bir çoxu İrəvan Müəlimlər Seminariyasında da dərs demişlər ki, onlardan Firudin Bəy Köçərlini, Cəlil Məmmədquluzadəni, İsmayıl bəy Şəfibəyovu və başqalarını göstərə bilərik. Ümumiyyətlə İrəvan Müəllimlər Seminariyasının müəllimlərindən aşağıdakıların adlarını çəkə bilərik: Axund Məmmədbağır Qazızadə 1883-cü ildən Seminariyada Azərbaycan dili və şəriət dərslərini tədris etmişdir. Mirzə Məmmədvəli Qəmərli, Rəhim Xəlilov, Məmməd Axundov, K.Şulgin, Mixail Klopov, Mirzə Abbas Məhəmmədzadə, İsmayıl bəy Şəfibəyov, Cabbar Məmmədzadə və başqalarını göstərmək olar (5, səh. 35).

F.Köçərli dərs deyərkən İrəvan mədəni mühitinin köhnə ənənələrdən uzaqlaşması, yeni müasir elmi dünyagörüşünün formalaşması uğrunda mübarizə aparırdı. Yeni dünyagörüşünün yayılması qarşısında xüsusilə cəhalətpərəst din xadimləri dururdular. İrəvana gəldikdə mühitlə yaxından tanış olan F.Köçərli öz təəssüratlarını belə bölüşürdü: “İrəvan 202 üləmaları çox geridə qalmış, onlar o dərəcədə cəhalətə qapılıblar ki, hətta “Tərcüman” qəzetini oxumağı, mühəriri sünni olduğu üçün qadağan edirlər. Bunlar başa düşmürlər ki, inkişaf üçün nəinki Şərqdən, hətta xristian Qərbindən də kitab, qəzet gətirmək vacibdir”.

İrəvan Müəllimlər Seminariyasının məzunlarından isə aşağıdakıların adlarını çəkə bilərik: Həbib bəy Səlimov, Nəcəf bəy Vəzirov, Haşım bəy Vəzirov, Mirzə Abbas Məhəmmədzadə, Cabbar Məhəmmədzadə, İbadulla bəy Muğanlinski, Vahid Musabəyov, Həmid bəy Şahtaxtinski, Hüseynəli bəy Rüstəmbəyov, İbadulla bəy Muğanlinski, Tağı bəy Səfiyev, Mirzə Cəlil Şürbi, Eynəli bəy Sultanov, Sadıq Xəlilov, Vahid Musabəyov, Fərrux Ağakişibəyov və başqaları (5).

İrəvan Kişi Gimnaziyasının məzunları sırasında isə Mustafa bəy Topçubaşov, Abbasqulu bəy Şadlinski, Yusif Məmmədəliyev, Hüseyn Şahtaxtinski, Miryusif Mirbabayev, Əsədulla bəy Kəngərlinski,

Teymur Makinski, Hüseynağa Şahtaxtinski, Məmməd bəy Qazıyev, F.Ordubadski və başqaları olmuş, Əziz Əliyev isə 1917-ci ildə İrəvan Kişi Gimnaziyasını qızıl medalla bitirərək Sankt Peterburq Hərbi Tibb Akademiyasına qəbul olunmuşdur (5).

XIX əsrin əvvəllərindən başlayaraq 1920-ci ilə qədər İrəvan sürətlə inkişaf etmiş və bu bölgə böyük mədəniyyət mərkəzlərindən biri olmuşdur. İrəvan şəhəri Bakı, Təbriz, Naxçıvan, Xoy və başqa şəhərlər kimi Azərbaycanın aparıcı elm və mədəniyyət mərkəzi olmuşdur. Buna görə də Şərq elmi tarixində xeyli “İrəvani” təxəllüslü məşhur şəxslərə rast gəlmək olur. Məsələn, Mirzə Qədim İrəvani (1825-1875) məşhur rəssam və nəqqaş olmuşdur. Hacı Süleyman ibn Salman Qacar İrəvani - XVIII əsrdə yaşamış görkəmli Azərbaycan həkimi və alimi olmuş, 600-dən çox dərman bitkisi haqqında məlumat vermişdir. İrəvanın ruhani ziyalıları içərisində dövrün məşhur ülamələrindən olmuş, eyni zamanda incə ruhlu şeirlərin müəllifi kimi tanınmış Fazil İrəvaninin xüsusi yeri olmuşdur. 1782-ci ildə İrəvan şəhərində anadan olmuş Fazil İrəvani ilk təhsilini ənənəvi molla məktəbində almış, 20 yaşında Qahirəyə gedərək buradakı məşhur “Əl-Əzhər” mədrəsəsində təhsil almışdır. İsfahan və Təbriz şəhərlərində axundluq edən Fazil İrəvani doğma şəhərinə qayıtdıqdan sonra Göy məscidin axundu olmuş və bu illərdə müctəhid rütbəsi almışdır. 1843-cü ildə Qafqaz müsəlmanları Şiə Ruhani idarəsi sədrinin müavini, 1846-cı ildə isə şeyxülislam olmuşdur.

ADPU -nun filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov yazır: "Təsadüfi deyil ki, pedaqoji kadrlara olan ehtiyacı ödəmək üçün XX əsrin 20-ci illərindən başlayaraq İrəvanda hazırlıq kursları təşkil olunmuşdur. 1923-cü ilin sonlarında təşkil olunmuş bu hazırlıq kurslarında 1926-cı ilin sonlarına qədər 143 müəllim hazırlanmışdı. İrəvanda hazırlıq kurslarının təşkilində Bala Əfəndiyevin, Mehdi Kazımovun, Mustafa Hüseynovun və digərlərinin xidmətləri böyük olmuşdur. Bu texnikum müəllim kadrlarına olan ehtiyacı ödəmək üçün xeyli iş görmüşdür. Texnikumun direktoru Mehdi Kazımov, ictimaiyyət müəllimi Bala Əfəndiyev, ana dili müəllimi Əsgər Əsgərzadə, təbiət müəllimi Cəmil Əliyev olmuşdur" (6).

Bu dəyərli məlumatlardan məlum olur ki, 1924-cü il, 15 oktyabrda İrəvan Türk Pedaqoji Texnikumu açılmış və texnikum 1949-cu ilə qədər fəaliyyət göstərmişdir. Bu texnikumun yaradılmasının ilk təşəbbüskarı Mehdi Kazımov (1890-1954) olmuş və özü də buranın ilk direktoru olmuşdur. O İrəvan Kişi Gimnaziyasını bitirmişdi. Bu qocaman pedaqoq ömrünün 50 ilini İrəvanda Azərbaycan maarifinin, mədəniyyətinin inkişafına sərf etmişdi. Kitabda İrəvan Türk Pedaqoji Texnikumunda fəaliyyətə başlayan Yusif Məmmədəliyev, Ələşrəf Bayramov, Əsgər Əsgərzadə, Bülbül Kazımova, Miryusif Mirbabayev, Məhəmməd Əzimzadə, İsmayıl Babayev və digər ziyalılardan bəhs olunur. Pedaqoji Texnikumda “Mədəniyyət ocağı”, “Mədəni hücum”, “İrəli” adlı divar qəzetlərinin çap olunmasından, texnikumun ilk məzunlarından (Əmir Abasquliyev, Adil Axundov, Nəriman Əliyev, Rübabə Bağırbəyova, Nəsir Əliyev, Nəzər Paşayev və s.) söhbət açılır. Orada, həmçinin 1936-cı ildə Pedaqoji Texnikumun Pedaqoji Məktəb adlanmasından və s. məsələlərdən bəhs olunur. İrəvan Pedaqoji Məktəbinin 1948-ci ildə Azərbaycanın Xanlar (indiki Göygöl) rayonuna köçürülməsi və 1972-ci ilə qədər ¬orada

fəaliyyət göstərməsi bir daha təsdiq edir ki, bu təhsil müəssisəsi Azərbaycan təhsilinin tarixində silinməz iz qoymuşdur.

Qeyd edim ki, İstiqalal" ordenli, Əməkdar müəllim, dosent atam Lətif Hüseynzadə 1930-cu illərdə bir müəllim, pedaqoq olaraq Azərbaycan dili və ədəbiyyatdan Azərbaycan Dövlət Universitetinin 1930-cu il məzunu kimi təyinatla İrəvan pedaqoji məktəbində və daha sonralar isə İrəvan Pedaqoji İnstitunun Azərbaycan şöbəsində dərs demiş, pedaqoji kadrların hazırlığında dəyərli xidmətlər göstərmiş və İrəvan yazıçı və şairlərinin ədəbi orqanı olan "Ədəbi Ermənistan" almanaxının redaktoru vəzifəsində də çalışmışdır. İrəvan Pedaqoji Məktəbinin məzunları olmuş sonralar yüksək elmi dərəcələrə nail olmuş, uzun illər elm və təhsil sahəsində çalışmış, akademik Budaq Budaqov, akademik Zərifə Budaqova, prof. Əli Fərəcov, prof. Yusif Yusifov, prof. Cəfər Cəfərov, prof. Süleyman Məmmədov, prof. Nəriman Əliyev, prof. Fərhad Fərhadov, prof. Qasım Mustafayev, prof. Tapdıq Əmiraslanov, Əməkdar müəllim, filologiya üzrə fəlsəfə doktoru, dosent Nəcəf Nəcəfov, ictimai xadim Qəşəm Aslanov, dosent Zəhra Əliyeva və ADPU-nun professoru olmuş Kövsər Tarıverdieva və başqaları da bu məktəbin fəal məzunları olmuş, xalqımızın fədakar, peşəkar müəllimləri, elm adamları, ictimai xadimləri kimi xalqa, vətənə ləyaqətlə xidmət etmişlər. Azərbaycanın bir çox görkəmli ziyalıları - Cəlil Məmmədquluzadə, Əli Nazim, Mir Cəlal Paşayev, Səməd Vurğun, Mikayıl Rəfili, Yusif Məmmədəliyev və başqaları bu pedaqoji məktəbdə olmuş, tələbələrlə görüşmüş, müəyyən dövrlərdə dərs də demişlər (2, səh. 25).

Məlumdur ki, 1936-cı ildə İrəvan Dövlət Qiyabi Pedaqoji İnstitutu, 1937-ci ildə iki illik Müəllimlər İnstitutu daha sonra isə 1945-1988-ci illərdə isə İrəvan Pedaqoji İnstitutunun Azərbaycan şöbəsi fəaliyyət göstərmişdir. Burada dərs deyən müəllimlər haqqında oranın tələbələri, məzunları haqqında dəyərli məlumatların verilməsi bu gün təhsilimizin tarixinin öyrənilməsində önəmli yer tutur.

“İrəvanda milli maarifçilik mühiti” kitabının müəllifləri çalışmışlar ki, heç kim, heç nə yaddan çıxmasın. Mən bu kitabda öz adıma da rast gələndə sevindim. Mən də İrəvan Pedaqoji İnstitutunda oxumuşam. Kitabda bu institutun adlı sanlı məzunlarının adları çəkilir: Akademik Zərifə Budaqova, prof. Mirəli Seyidov, prof. İbrahim Bayramov, prof. Hüseyn Əmirov, Zəhra Əliyeva, Aidə Salahova və başqaları.

Görkəmli təhsil işçisi, təhsil mətbuatımızın tanınmış nümayəndəsi, İrəvan təhsil mühitinin yetişdirməsi, "Azərbaycan məktəbi" jurnalının baş redaktoru, Əməkdar müəllim, dosent Nəcəf Nəcəfov İrəvan maarifi haqqında dəyərli məqaləsində yazır: "İrəvan Pedaqoji İnstitunda dərs demiş Əkbər Yerevanlı, Lətif Hüseynzadə, Əli Dalqılıcov, Adil Süleymanov, Sabir Əsədov, İsrafil Məmmədov, Mehdixan Erivanski, Fərrux Rzayev, Hüseyn İsmayılov, Məhərrəm Hüseynov, Arzuman Qəmbərov kimi tanınmış pedaqoq alimlər pedaqoji fəaliyyətlə bərabər elmi-tədqiqat işləri aparmış, yaradıcı işlər görmüşlər. Prof. Fərhad Fərhadov 1942-43-cü illərdə İrəvan Pedaqoji Texnikumnda və İrəvan Pedaqoji İnstitutunda dərs demiş və 1945-ci ildə İrəvanda "Qədim və orta əsrlər ədəbiyyatına dair oçerklər" kitabını nəşr etdirməyə nail olmuşdur (8). 1960-cı illərdə Amerika yaşa-

yan bir eməni 270 ədəd Şərq əlyazmalarını İrəvan Mətndaranına bəxşiş olaraq göndərmişdir. Lətif Hüseynzadə İrəvanda çalışdığı müddətdə XV əsr Qaraqoyunlu dövlətinin başçısı Cahan Şah Həqiqinin 500 il itmiş hesab edilən, bir çox ölkələri "gəzmiş" şeirlər Divanını Mətndarandan əldə edərək, çətinliklə də olsa onun mikrofilmini çıxarmağa nail olmuş və ilk dəfə olaraq "Həqiqi" divanını İrəvanda 1966-cı ildə 12.500 tirajla nəşr etdirərək Həqiqinin həqiqi varislərinə çatdırmışdır(9). Daha sonralar isə Həqiqinin farsca Divanını tərcümə edərək Bakıda 2000-ci ildə nəşr etdirmişdir. Filologiya elmləri doktoru, Nyu-York Elmlər Akademiyasının üzvü, prof. Əsgər Zeynalovun “İrəvan ziyalıları” kitabı bakıda (1999), Sankt-Peterburqda (2011), Moskvada (2013), ABŞ-da (2016) nəşr olunmuşdur. Kitabda çox dəyərli məlumatlar vardır.

İrəvan elmi, mədəni və pedaqoji mühitinin formalaşmasında, inkişafında Azərbaycanın görkəmli şəxsiyyətlərinin, o cümlədənM.S.Ordubadinin, M.Müşfiqin, Mehdi Hüseynin, Cəlil Məmmədquluzadənin, Mir Cəlal Paşayevin, Əziz Əliyevin, Yusif Vəzir Çəmənzəminlinin, Əziz Şərifin, Hacı Kərim Sanılının, Mirzə Ələkbər Elxanovun və başqalarının böyük xidmətləri olmuşdur ki, kitabda bunlar haqqında da ətraflı yazılmışdır (10).

İrəvanda "Sovet Ermənistanı" qəzeti nəşr olunurdu ki, bu mətbuat orqanı da İrəvanda maarif və mədəniyyətin, əverişli pedaqoji mühitin yaranmasında böyük rol oynamışdır ki, bu qəzetin redaktoru o zaman professor Teymur Əhmədov olmuş, bu gün də o "Respublika" qəzetinin baş redaktoru kimi peşəkarcasına uğurla fəaliyyət göstərir.

Kitabda İrəvan Pedaqoji mühitinin yetişdirmələri olmuş, "Əməkdar müəllim" və digər fəxri titullara layiq görülmüş müəllim, ziyalıların, həmçinin 1930 -cu illərdə represiyaya məruz qalmış azərbaycanlı ziyalılarının siayhısı verilmişdir ki, bu da kitabın məlumatlılıq baxımından əhəmiyyətini xeyli artırmış və bir növ ensiklopedik xarakter daşımasına səbəb olmuşdur.

İrəvan pedaqoji İnstitutunda dərs demək üçün müxtəlif illərdə Bakıdan da müəllimlər dəvət olunmuşdur: Prof. İnayət Bektaşi, prof. Firudin Hüseynov, prof. Əkbər Bayramov, prof. Əhməd Seyidov, prof. Hüseyn Əhmədov, prof. Xalid Əlmirzəyev, prof. Cəfər Cəfərov, prof. Abbas Zamanov, prof. Mürsəl Həkimov, prof. Nizami Xudiyev, prof. Cəlil Nağıyev, Bəxtiyar Vahabzadə və başqalarının xalqa, millətə fədakar xidməti unudulmazdır.

Bu əsərdə verilən maraqlı xatirələr xüsusi yaradıcılıq məharəti ilə işlənmişdir ki, onların da tarixi əhəmiyyəti yüksəkdir. Burada professor Cəfər Cəfərovun İrəvan Pedaqoji məktəbində oxuyarkən tələbəlik illərindən xatirələri, tanınmış elm xadimləri professor Həsən Mirzəyevlə, professor Mirabbas Heydərov, professor Qasım Müstafayevlə, professor Budaq Budaqovla bağlı xatirələri elmi ictimaiyyətimiz üçün böyük maraq kəsb edir.

Həmçinin İrəvan pedaqoji mühitinin yetişdirdiyi görkəmli elm xadimlərinin, tanınmış ziyalı alimlərimizdən ADPU -nun filologiya fakültəsinin dekanı professor Buludxan Xəlilov, tanınmış ictimai xadim Mehdi bəy İsmayılov, tanınmış aktyor Rza Şeyxzadə, Milli maarif və mədəniyyətimzin inkişafında böyük xidmətləri olan Əkbər Rzayevin və onun oğlu, sənətşünaslıq dok-

toru, Sabir Rzayevin və başqalarının adları indi hörmətlə çəkilir.

Bu kitabın dəyərli cəhətlərindən biri də müxtəlif illər üzrə müəllim və tələbə kollektivinin vinetkaları, dərs deyən, pedaqoji ictimayyətin nümayəndələrinin, İrəvan pedaqoji mühiti ilə bağlı olan şəxslərin foto şəkillərinin yer almasıdır.

"İrəvanda milli maarifçilik mühiti" adlı kitab təhsil tariximiz, pedaqoji fikir tariximiz, maarif və mədəniyyətimiz inkişaf tarixi üçün əhəmiyyətli əsərdir. Bu əsərin maarif və mədəniyyət tariximizin tədqiqində davamlı öyrənilməsini, tədqiqat işlərinin yazılmasını xeyli faydalı və əhəmiyyətli hesab edirəm.

ADPU - nun professoru C.Cəfərov və dosent C.Allahverdiyevin "İrəvanda Milli maarifçilik mühiti" adlı kitabı nəşr edilmişdir. Bu dəyərli kitabın elmi redaktorları: prof. Buludxan Xəlilov və tarix üzrə fəlsəfə doktoru, Dövlət Mükafatı laureatı Nazim Mustafadır. Rəyçiləri, prof. Əjdər Ağayev, prof. Rüfət Hüseynzadə, prof.Mahirə Nağı qızı və pedaqoji elmlər doktoru Həsən Bayramoğludur.

ADPU-da bu əsərin təqdimat mərasimi keçirildi. ADPU-nun rektoru professor Cəfər Cəfərov bu kitabın maarifpərvər ziyalılarımızın həyat və fəaliyyətinin öyrənilməsi, tədqiq edilməsi üçün əhəmiyyətli mənbə olduğunu dedi. O, İrəvan maarifçilik mühitinin təmsilçilərinin xalqımızın mənəvi təkamülündə, ölkəmizin mədəni inkişafında sanballı xidmətlər göstərdiyini diqqətə çatdırdı.

Təqdimat mərasimini yüksək səviyyədə aparan filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov bildirdi ki, "İrəvan təhsili Azərbaycan təhsilinin bir parçasıdır. Bu baxımdan "İrəvanda milli maarifçilik mühiti" kitabı yeni axtarışlara, araşdırmalara, elmi-tədqiqatlara istiqamət verir. İrəvan təhsil mühitinin yetirmələrinin bir çoxu ADPU-da çalışaraq universitetimizin inkişafında mühüm rol oynamışlar.

Təqdimat mərasimində Professor Rüfət Hüseynzadə, Bakı Dövlət Universitetinin professoru Əyyub Əzizov, prof. Cəlil Nağıyev, Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü Vəli Əliyev, prof. Fərrux Rüstəmov və başqaları "İrəvanda milli maarifçilik mühiti" kitabının müəlliflərinə uğurlar arzuladılar.

İrəvan maarifçilik mühitinin milli təhsilimizin, maarif və mədəniyyətimizin inkişafında xüsusi yeri və əhəmiyyəti vardır. İrəvan maarifçilik mühitinin öyrənilməsi pedaqoji fikir tariximizi, təhsil tariximizi yeni bilik və məlumatlarla xeyli zənginləşdirər və dəyərli ensiklopedik mənbəyə çevrilər.

Ümummilli liderimiz Heydər Əliyev haqlı olaraq deyirdi ki, gənc nəslimiz öz milli-mənəvi dəyərlərini öyrəndikcə, öz keçmişindən qürur duyur və onlarda öz soyuna, kökünə, millətinə bağlılıq daha da möhkəmlənir.

***Rəyçi: prof. İ.İsayev***

## İstifadə edilmiş ədəbiyyat

1. İlham Əliyev. YAP-ın VI qurultayında nitq. 08 fevral, www. yap.org.az/az/view/news/25136/

2. Zeynalov Ə. İrəvan ziyalıları. Bakı: Oğuz eli, 1999.

3. Zeynalov Ə. İrəvan məktəbləri. Bakı: Mütərcim, 2011.

4. Hüseynzadə R. Zaqafqaziya Müəl-

limlər Seminariyasının naxçıvanlı məzunları. // Azərbaycan məktəbi. 2010 № 1.

5. Hüseynzadə R. Pedaqoji kadr hazırlığında İrəvan Müəllimlər Seminariyasının fəaliyyəti və onun azərbaycanlı məzunları. "Təhsil sistemində gənc nəslin təlim-tərbiyəsi üzrə işin təşkili və onun yaxşılaşdırılması istiqamətləri" Respublika elmi konfransının materaialları. Bakı: Mütərcim, 2012, s.247-248.

6. Xəlilov B. Təhsil tariximizdən: İrəvan pedaqoji məktəbi. /Xalq, 25 iyul, 2017.

7. Məhərrəmov Z. İrəvanda məktəbdarlıq və maarifçilik (1800- 1920-ci illər). Bakı: Nurlan, 2010, 320 s.

8. Nəcəfov N. İrəvan Pedaqoji İnstitutunun Azərbaycan bölməsinin acı taleyi. //Azərbaycan müəllimi,1 mart, 2013- cü il.

9. Hüseynzadə L.Həqiqi. Şeirlər. İrəvan, 1966.

10. Cəfərov C., Allahverdiyev C. İrəvanda maarifçilik mühiti. Bakı: Şərq-Qərb, 2017, 440 s.

**Р.Гусейнзаде**

**Иреванские образавательные среда**

**Резюме**

До российского завоевания в начале 19-го века абсолютное большинство населения Иреванского ханства составляли азербайджанские тюрки. Иреванское ханство ничем не отличалось от прочих азербайджанских ханств, существовавших в тот период. За все время его существования на территории Иреванского ханства строились многочисленные азербайджанские села и города, тысячами возводились исторические памятники - крепости, мечети, минареты, караван-сараи, бани. Все названия мест - топонимы - в этом регионе имели азербайджанское происхождение. В этих периодах при мечетов существовали мусульманские мектепи и медресе.

При Эриванской ханство существовало мужская и женская гимназии и учительский институт в Эривани, женская прогимназия в Александрополе, городских училищ 5, городских начальных общественных — 12, городских начальных казенных — 1, сельских казенных нормальных — 4, сельских — 12, министерства народного просвещения — 18, начальных — 39 и частных — 8. Учащихся в 1900 году было 6983. При некоторых училищах ремесленные и сельскохозяйственные отделения.

Захват Иреванского ханства, расположенного на границе между Османским государством и Каджарским Ираном, также входил в завоевательные планы Российской империи, и в этих периодах организовано русские школы, прогимназии, гимназии, реальные школы, воскресные школы и т.д.

Делается экскурс в историю возникновения, развития и деятельности Иреванский Учительской Семинарии, анализируется прогрессивная деятельность Семинарии в подготовке педагогический кадров. Материал построен на основе архивных документов, педагогических и литературных источников. В работе перечисляются азербайджанские выпускники Иреванской Учительской Семинарии и их дальнейшая деятельность за её пределами.

После возглавещения в Армении Советской Социалистической

Республики в Иреване 1924 году организовано Тюркские Педагогические училище и другие образовательные предприятии, которые в этом статье говориться

**R.Huseynzadeh**

**The Irevan imagery**

**Summary**

Before the Russian conquest in the beginning of the 19th century, the absolute majority of the population of the Irevan Khanate was Azerbaijani Turks. The Irevan khanate was no different from the other Azerbaijani khanates that existed at that time. During its existence in the territory of the Irevan Khanate, numerous Azerbaijani villages and towns were built, thousands of monuments were erected - fortresses, mosques, minarets, caravanserais, baths. All names of places - place names - in this region were of Azerbaijani origin. During these periods Muslim mosques and madrassas existed with mosques.

Under the Erivan Khanate, there were male and female gymnasiums and a teacher's institute in Erivan, a women's gymnasium in Alexandropol, urban schools, 5 initial urban public schools, 12 initial urban public institutions, 1 official rural public institutions, 4 rural ones, 12 public education ministries, 18 , primary - 39 and private - 8. Students in 1900 were 6983. With some schools handicraft and agricultural departments.

The article contains material on the establishment and further development of Irevan Teachers' Seminary. Make an excursion into the history of the origin, development and operation of Irevan Teachers' Seminary, a progressive analysis of the activities of the Seminary in the preparation of teachers. The material is based on archival documents, educational and literary sources. The paper lists the Azerbaijani graduates Irevan Teachers Seminary and their further activities beyond its borders.

The seizure of the Irevan khanate located on the border between the Ottoman state and the Kajar Iran was also part of the conquest plans of the Russian Empire, and in these periods Russian schools, progymnasiums, gymnasiums, real schools, Sunday schools, etc. were organized.

After the leadership of the Soviet Socialist Republic in Armenia in Irevan in 1924, the Turkic Pedagogical School and other educational enterprises were organi-

***Arxivimizdən***

# İRƏVAN MÜƏLLİMLƏR SEMİNARİYASI

Zaqafqaziyada xalq maarifinin təşəkkülü və inkişafı tarixində İrəvan müəllimlər seminariyasının özünəməxsus yeri vardır. O, Ermənistanda müəllim kadrları hazırlayan ilk maarif ocağı olmuşdur. Lakin seminariyanın fəaliyyəti təkcə Ermənistan məktəbləri üçün milli kadrlar hazırlamaqla məhdudlaşmamışdır. O, qardaş Gürcüstan və Azərbaycan, həmçinin Şimali Qafqaz məktəbləri üçün də müəllimlər hazırlanmasında böyük xidmətlər göstərmişdir. Rusiyada ilk müəllimlər seminariyası olan və 1859-cu ildə təşkil edilmiş Peterburq müəllimlər seminariyasından 22 il sonra fəaliyyətə başlayan bu tədris ocağı dövrünün qabaqcıl pedaqoji fikrinin əsas mərkəzlərindən biri kimi tanınmışdır.

Araşdırmalar göstərir ki, İrəvan müəllimlər seminariyasının fəaliyyətə başladığı 8 noyabr 1881-ci ilə qədər Rusiyada artıq onlarca seminariya var idi. Yeni tədris ocağı özünə qədərki seminariyaların mütərəqqi ənənələrindən bəhrələnməyə çalışaraq dövrünün qabaqcıl maarif müəssisəsi kimi şöhrətlənmişdir.

İlk dövrdə seminariyanın müdiriyyəti xeyli çətinliklə qarşılaşmalı olmuşdur. Belə ki, maarif ocağına müəllimlərin cəlb edilməsi, şagird qəbulu, xüsusən də maliyyə məsələləri çətinliklə həll edilirdi. Məsələn, təkcə ilk dərs ilində kirayə haqqı üçün 5 min manat pul verilmişdir. Seminariyanın direktoru, görkəmli maarifçi Jakob Stepanoviç Suşevski əsas diqqəti tədris ocağını müəllim kadrları və şagird kontingenti ilə təmin etməyə yönəltmişdi. Onun səyi nəticəsində birinci il seminariyaya 9 müəllim və 42 şagird cəlb edilmişdi, 1885-ci ildə müəllimlərin sayı 12-yə, 1889-cu ildə isə 13-ə çatdırılmışdı. Müəllim kollektivinə təcrübəli pedaqoqların cəlb edilməsi seminariyada təlim-tərbiyə işinin vəziyyətinin ildən-ilə yaxşılaşmasına və onun nümunəvi tədris ocağına çevrilməsinə səbəb olmuşdur.

Ölkədəki bir sıra digər seminariya kimi İrəvan müəllimlər seminariyası da öz tərkibinə görə beynəlmiləl tədris ocağı idi. Belə ki, fəaliyyətə başladığı ilk dərs ilində burada təhsil alan 42 şagirdin 8-i rus, 28-i erməni, 6-sı azərbaycanlı idi. 1882-ci ilin sonunda isə şagirdlərin sayı 54-ə çatmışdı. Onlardan 7-si rus, 23-ü erməni, 23-ü azərbaycanlı idi. Göründüyü kimi, seminariyada azərbaycanlı şagirdlər də çoxluq təşkil etmişdir.

Seminariyanın fəaliyyətində Qori seminariyasının məzunları olan azərbaycanlı müəllimlərin böyük bir dəstəsinin mühüm rolu olmuşdur. Görkəmli maarifçi-demokratlar Firudin bəy Köçərli, İsmayıl bəy Şəfibəyov, Cahangir Ələkbərbəyov, Cəlil Məmmədquluzadə, Məmməd Terequlov və başqalarının ilk pedaqoji fəaliyyəti İrəvan oğlan gimnaziyası, Uluxanlı kənd məktəbi ilə yanaşı İrəvan müəllimlər seminariyası ilə də sıx bağlı olmuşdur.

Seminariya fəaliyyətə iki qrupla başlamışdır – böyük hazırlıq qrupu və birinci qrup. Sonrakı dərs ilində ikinci sinif, 1883-cü ildə isə üçüncü sinif təşkil edilmişdir. Beləliklə, Zaqafqaziyada olan bütün müəllimlər seminariyası kimi, İrəvan müəllimlər seminariyası da sonadək 4 qrupdan ibarət olmuşdur. 1883-1884-cü dərs ilində hazırlıq qrupunda həftəlik dərslərin miqdarı 36 saat, I sinifdə 38, II sinifdə 39, III sinifdə isə 40 saat olmuşdur.

Hər il müəllimlər seminariyasının hazırlıq qrupuna və I sinfə qəbul elan edildi. II-III siniflərə isə, müdavim qəbul olunmağa icazə verilmirdi. Əsasnaməyə görə seminariyaya yaşlı vətəndaşlar (oğlanlar) qəbul oluna

bilərdi. Onlar ümumtəhsil məktəblərinin II sinfi səviyyəsində qəbul imtahanları verməli idilər. Qəbul imtahanları II sinfin proqramına uyğun olaraq ilahiyyat, rus dili, hesab, həndəsə, coğrafiya, tarix və biologiya fənlərindən aparılırdı.

Müəllimlər seminariyası nəzdində ibtidai məktəb fəaliyyət göstərirdi. Seminaristlər pedaqoji təcrübələrini həmin məktəbdə keçirdilər. 1882-1883-cü dərs ilində ibtidai baza məktəbində 61 şagird təhsil almışdır. Onların 38-i erməni, 10-u rus, 13-ü azərbaycanlı idi. 1889-1900-cü dərs ilində şagirdlərin sayı artaraq 82 nəfərə çatmışdı. Ordubad şəhər məktəbi həmin seminariyanın filialı hesab olunurdu. Məktəbin müdiri A.Suvorov, ilk azərbaycanlı müəllimi isə Məşədi Bağır Qazızadə olmuşdur.

İrəvan müəllimlər seminariyasında müxtəlif fənlər tədris edilməklə yanaşı, bir sıra peşələr də öyrənilirdi. Tədris planı, proqramlar yerli şəraitə uyğunlaşdırılmışdı. Ümumiyyətlə, o dövrdə Zaqafqaziyada fəaliyyət göstərən müəllimlər seminariyasında ilahiyyat, pedaqogikanın əsasları, rus dili, hesab, həndəsə, torpaqşünaslığın əsasları, rəsmxət, rus tarixi, ümumi tarixdən qısa məlumatlar, hüsnxət, nəğmə və bədən tərbiyəsi fənləri tədris edilirdi. Bunlardan başqa, ayrı-ayrı seminariyalarda yerli şəraitdən asılı olaraq bir sıra əlavə fənlər də keçilirdi. Bu cəhətdən İrəvan müəllimlər seminariyasında erməni və Azərbaycan dilləri, xarratlıq, cildçilik işi, tərəvəzçilik və ipəkçilik fənləri könüllü surətdə tədris olunurdu.

Seminariya müdavimlərin tərkibinə görə beynəlmiləl olduğu kimi pedaqoji kollektivinin tərkibinə görə də beynəlmiləl xarakter daşıyırdı. Burada rus, erməni, Azərbaycan, Ukrayna, Gürcü xalqlarının tanınmış maarif xadimləri, təcrübəli pedaqoqlar çalışırdı.

Y.Suşevski, Axund Məmmədbağır Qazızadə, Rəhim Xəlilov, N.Qasaradze və başqaları belələrindən idi. Onlar Zaqafqaziyada xalq maarifinin inkişafında və getdikcə çiçəklənməsində böyük əmək sərf etmişlər.

İrəvan müəllimlər seminariyasında dərs deyən ilk azərbaycanlı müəllim dövrünün görkəmli alimi, maarifçi-pedaqoq Axund Məmmədbağır Qazızadə olmuşdur. O, seminariya açılan gündən 1897-ci ilə qədər burada ilahiyyatdan və Azərbaycan dilindən dərs demiş, 1897-ci ildən 1917-ciilədək isə təkcə təkcə ilahiyyat fənnini tədris etmişdir. 1892-ci ildən başlayaraq seminariyada Azərbaycan dili dərslərini Mirzə Rəhim Xəlilov tədris etmişdir. Maraqlıdır ki, M.R.Xəlilov özü 1881-ci ildə həmin seminariyanı bitirmiş və bu vəzifəyə də sevimli müəllimi Axund Məmmədbağır Qazızadənin təqdimatı ilə götürülmüşdür. Seminariyada Azərbaycan məktəbləri üçün müəllimlər hazırlanmasında Axund Məmmədbağır Qazızadənin böyük xidmətləri olmuşdur. İstər xalq arasında, istərsə də seminariyada və yuxarı maarif ocaqlarında böyük nüfuz qazanan A.M.Qazızadə bütün bilik və bacarığını müəllim kadrların hazırlanmasına və məktəblər yaradılmasına sərf etmişdir. Bunu seminariyanın 1886-cı dərs ilindəki hesabatından da aydın görmək olar. Hər bir müəllimin pedaqoji işi, qabiliyyəti və təcrübəsi geniş təhlil olunmuş bu hesabatda maarif fədaisi A.M.Qazızadəyə də bir neçə səhifə həsr olunmuşdur. Burada onun seminariya təşkil edilən gündən ən fəal maarif işçisi olması, müəllim və şagird kollektivi ilə mehriban işləməsi, xalq arasında geniş hörmət qazanması, pedaqoji ustalığı, ikiillik işləməsi, hər şagirdlə fərdi məşğul olması, müəllim kadrları hazırlanmasında xidmətləri xüsusi qeyd edilmişdir. Dövrünün qabaqcıl maarifçisi olduğu üçün ona Axund ləqəbi verilmişdir. Bütün ömrünü pedaqoji fəaliyyətə sərf etməsi, gənclərin təlim-tərbiyəsi ilə nümunəvi məşğul olmasını nəzərə alıb 1882-ci ildə onu gümüş medalla təltif etmişdilər. Bu, qocaman xalq maarifçi-

sinin əməyinə verilən böyük qiymət idi.

İrəvan müəllimlər seminariyasında da, başqa seminariyalarda olduğu kimi, təhsil pullu idi. Lakin şagirdlərin müəyyən hissəsi dövlət hesabına oxuyurdu. Qəbul olunanlar birinci dərs ilində 210 manat, sonrakı illərdə isə 180 manat təhsil haqqı ödəyirdilər. Maraqlı budur ki, seminariyada oxuması və qurtarması haqqında məzunlara verilən şəhadətnamələrə onların məktəbə ödədiyi təhsil haqqının miqdarı da qeyd olunurdu. Seminariyanın bütün şagirdləri internatda qalırdılar (öz hesabına oxuyanlar isə ayrıca yataqxanada yaşayırdılar). Öz hesabına oxuyanların sayı azlıq təşkil edirdi. Məsələn, 1907-ci dərs ilində burada təhsil alan 70 şagirddən 50-si dövlət, qalanı isə öz hesabına oxuyurdu.




Seminariyanın müdavimlərinin sinfi tərkibi də diqqəti cəlb edir. Belə ki, burada təhsil alanlar əsasən əsilzadələr, şəhərlilər, kəndlilərdən ibarət idi. Həm də qeyd edilməlidir ki, başqa qrup və təbəqələrə nisbətən əsilzadələr həmişə azlıq təşkil etmişdir. Bu da səbəbsiz deyildi. Çünki həmin dövrdə sadə kənd müəllimi olmaq zadəgan nəslinə hörmət gətirmirdi, buna görə də onlar seminariyaya o qədər də maraq göstərmirdilər. Əgər 1890-cı ildə seminariyada oxuyan 69 müdavimdən 23 nəfəri əsilzadə idisə, 1896-cı ildə bunların sayı azalaraq 59 müdavimdən 8-ə, 1907-ci ildə isə 71 nəfərdən 3 nəfərə enmişdi.

İrəvan müəllimlər seminariyasının ilk buraxılışı 1884-cü ildə olmuşdur. Həmin il məktəbi 5 nəfər bitirmişdir. Seminariyanın onuncu buraxılışı 1893-cü ildə, iyirminci buraxılışı 1903-cü ildə, otuzuncu buraxılışı 1913-cü ildə olmuşdur. Oranı hər il 13-15 nəfər azərbaycanlı, rus, erməni, gürcü, yunan və s. millətlərin nümayəndələri bitirmişlər. XIX əsrin sonlarında Zaqafqaziyada işləyən kənd məktəbləri müəllimləri və müdirlərinin xeyli hissəsi müxtəlif illərdə ekstern yolu ilə ilə imtahan verərək həmin seminariyada müəllimlik hüququ almışdır. Onların arasında azərbaycanlılar da olmuşdur. Seminariyanın pedaqoji şurasının qərarına əsasən 1895-ci ildə Cəlil Mirzəyev, Tağıbəy Səfiyev, Məmmədbəy Qazıyev, 1902-ci ildə isə İbadullabəy Muğanlinski, Cabbar Məmmədov və başqalarına kənd müəllimi adı verilmişdir. Bu nəcib işin də təşəbbüsçüsü və təşkilatçısı qocaman maarif xadimi Axund Məmmədbağır Qazızadə olmuşdur.

Seminariyanın məzunları Zaqafqaziyanın müxtəlif vilayət və qəza məktəblərinə göndərilirdilər. Onlar işlədikləri yerlərdə təkcə dərs deməklə, məktəbdarlıqla kifayətlənməyib xalqın hərtərəfli tərəqqi və inkişafına, onun ictimai şüurunun oyanmasına böyük təsir göstərirdilər.

Beləliklə, İrəvan müəllimlər seminariyası Zaqafqaziyada müəllim kadrları hazırlayan ilk tədris ocağı kimi məktəb və pedaqogika tarixində şərəfli yer tutmuşdur.

**Nurəddin İbrahimov,**
***İrəvan şəhəri, respublikanın əməkdar müəllimi***
**Azərbaycan məktəbi jurnalı, 1982, №7**



# MOLLANƏSRƏDDİNÇİLƏRİN MAARİFÇİLİK İDEYALARINA HƏSR OLUNMUŞ LAYİQLİ TÖHFƏ

**Hümeyir Əhmədov,**
***pedaqogika üzrə elmlər doktoru,***
***Rusiya Təhsil Akademiyasının xarici üzvü***

Azərbaycan Respublikasının əməkdar müəllimi, pedaqogika üzrə fəlsəfə doktoru, dosent Kamal Camalovun "Mollanəsrəddinçilərin maarifçilik ideyaları" adlı monoqrafiyası bu gün də aktuallıq kəsb edən mollanəsrəddinçilər hərəkatının maarifçilik ideyaları probleminə həsr olunub. Çünki mədəniyyət, ədəbiyyat, maarif sahəsində XX yuzilin ən böyük ədəbi hadisələrindən biri "Molla Nəsrəddin" jurnalının yaranması, məktəb formalaşdırması və özündən sonra ədəbi ənənə qoymasıdır. Müəllif bu dəyəri monoqrafiyanın girişində özünəməxsus şəkildə vurğulamağa çalışır. K.Camalov qeyd edir ki, "Molla Nəsrəddin" ədəbi məktəbinin nümayəndələri öz sələflərinin maarifçilik haqqındakı ideyalarını bir az da cilalayaraq yeni fikir, yeni düşüncə və milli təfəkkür baxımından qiymətli fikirlər söyləmiş və bununla da milli mənafe uğrunda mübarizədə Azərbaycan məktəb və pedaqoji fikir tarixinin inkişafına dəyərli töhfələr vermişlər. Mollanəsrəddinçilər, Azərbaycanın mədəniyyət tarixində əhəmiyyətini yerini təyin etməyi, milli-azadlıq hərəkatından ilham almağı və o hərəkata xidmət etməyi, Azərbaycan torpağına, onun qəhrəmanlıq tarixinə, zəngin mənəvi sərvətinə, habelə dünya xalqlarının mədəni irsinə, xəlqilik prinsiplərinə bağlı olmasını işdə və əməldə müdafiə etmişlər.

Monoqrafiyanın mövzusu bilavasitə ümummilli lider Heydər Əliyevin mollanəsrəddinçilər və "Molla Nəsrəddin" jurnalı haqqında söylədiyi orijinal fikirlərlə tam uyğundur. Ümummilli lider Heydər Əliyevin haqlı fikrinə görə, yazıçı, şair dövrün nəbzini tutmağı bacarmalı, aktual mövzuları gündəmə gətirməli, ideya və bədii cəhətdən onları yüksək səviyyədə həll etməyi bacarmalıdır. Çünki cəmiyyətin inkişafının bütün mərhələlərində pedaqogikanın əsas vəzifəsi tərbiyələndirmək olmuşdur. Elə bu mənada da "Xalqımızın milli şüurunun formalaşmasında məhz "Molla Nəsrəddin" jurnalının və Cəlil Məmmədquluzadənin fəaliyyətinin rolu əvəzsizdir".

Bir sıra mövzular, o cümlədən "xalqçı və realist" "Molla Nəsrəddin" jurnalı XX ərin əvvəllərində Azərbaycanda maarifçi hərəkatın xarakterik xüsusiyyətlərinə aydınlıq gətirmiş, ideya-siyasi mədəniyyətin mahiyyətini, rolunu və mövqeyini üzə çıxarmışdır; jurnalın əsas məqamlarından biri də, müəllim hazırlığı məsələsində müəllimlərin tərbiyəvi fəaliyyətə hazırlanmasına imkan yaradan mühiti və pedaqoji-psixoloji şəraiti müəyyən etmək; təlimin ana dilində aparılması, bu dildə dərslik və dərs vəsaitləri hazırlamaq, proqram tərtib etmək kimi siyasi-strateji problemlərə işiq tutmuşdur. Mollanəsrəddinçilər tərəfindən Azərbaycan dili təlimi uğrunda ictimai-mədəni şərait səciyyələndirilmiş; təhsil və tərbiyənin

məqsədi, məzmunu, mahiyyəti və komponentləri ilə bağlı verilmiş fikirlər müqayisəli şəkildə təhlil edilmişdir. Bu baxımdan, mollanəsrəddinçilərin mənəvi-əxlaqi kamilliyə və insani davranışa çağırış və əxlaqi keyfiyyətlərin təbliği ilə bağlı mövqelərini müəyyənləşdirmək, mollanəsrəddinçilərin bədii yaradıcılığında və publisistikasında maarifçi pedaqoji-psixoloji prinsiplərin inikasını izləmək və sistemləşdirmək, bu əsərin dəyərli məziyyətlərindəndir. “Molla Nəsrəddin” jurnalında çap olunmuş müxtəlif ədəbi-bədii, siyasi yazılarla gənc nəsli vətənə və xalqa məhəbbət ruhunda böyütmək, onlara mədəni vərdişlər, müsbət əxlaqi normalar aşılamaq yollarının üsul, vasitə və tərzlərini üzə çıxararaq elmi-pedaqoji cəhətdən əsaslandırmaq da mövzunu aktual edən problemlərdəndir.

Qeyd etdiyimiz kimi, Kamal Camalovun monoqrafiyası məhz bu problemin həllinə xidmət edən elmi-tədqiqat işidir. Bu problemin həlli həm qeyd olunduğu kimi, ali və orta məktəb müəllimləri, tərbiyəçilər, pedaqogika sahəsində tədqiqat aparan dissertant və doktorantlar, monoqrafiya, dərslik və dərs vəsaitləri hazırlayan ziyalılar üçün və yaxud müntəxəbatların, antologiyaların hazırlanmasında, həm də təhsil tarixi ilə bağlı Azərbaycançılıq ideologiyası, pedaqoji-psixoloji, həmçinin, ədəbi-nəzəri problemlərlə məşğul olan tədqiqatçılar üçün də zəruridir.

Mollanəsrəddinçilərin (Cəlil Məmmədquluzadə, Ömər Faiq Nemanzadə, Əbdürrəhim Bəy Haqverdiyev, Mirzə Ələkbər Sabir, Əliqulu Qəmküsar, Qurbanəli Şərifzadə, Salman Mümtaz, Məmməd Səid Ordubadi, Əli Nəzmi, Mirzə Əli Möcüz və b.) həyat və yaradıcılığı, ictimai-siyasi istiqamətləri, etik görüşləri, təhsil-tərbiyə problemlərinin həlli istiqamətində həm respublikamızda (Əziz Şərif, M.İbrahimov, Ə.Mirəhmədov, F.Hüseynov, A.Hacıyev, Turan Həsənzadə, Sabir Əmirov, Əkbər (Məftun) Əkbərov, N.Axundov, M.Ağamirov, A.Zamanov, İ.Həbibbəyli, Sahilə Orucova, Zemfira Mehrəliyeva, Tovuz İmanlı, Rəşidə Məmmədova, Lətif Hüseynzadə və b.), çox dəyərli tədqiqatlar aparılmış, dissertasiyalar, monoqrafiyalar, pedaqoji, psixoloji və metodik əsərlər yazılmışdır. Mövzu ilə bağlı Rusiya, Türkiyə, İran, Fransa və başqa ölkələrdə dəyərli tədqiqat işləri əldə edilmişdir. Lakin müəllifin haqlı olaraq qeyd etdiyi kimi bu sahədə iş davam etdirilməlidir. Mollanəs-rəddinçilərin həyat yoluna və zəngin ədəbi-pedaqoji irslərinə dərindən nüfuz etdikcə, onların yaradıcılığı ətrafında tədqiqat və tapıntılar genişləndikcə öyrənilməmiş problemlər daha bariz, daha qabarıq şəkildə nəzərə çarpır. Mollanəsrəddinçilərin çoxcə-hətli pedaqoji-ictimai fəaliyyətində elə məsələlər, elə problemlər vardır ki, bunlara indiyə qədər ya heç toxunulmamış, yaxud da ötəri və ümumi şəkildə bəhs olunmuşdur. Bu mənada, müəllif haqlı olaraq qarşıya qoyulmuş problemin həllində çıxış yolunu mollanəsrəddinçilərin maarifçilik ideyalarını yeni fikir, yeni düşüncə və milli təfəkkürün inkişafı baxımından incələməkdə görür. Əsərdə “Molla Nəsrəddin” jurnalı, digər jurnal və qəzetlərdə Azərbaycan, Avropa, rus və Şərq maarifçiliyinin bir-birinə təsir məsələsi müqayisəli şəkildə araşdırılır, mollanəsrəddinçi maarifçilərin ictimai, ideya-siyasi görüşlərini müasir pedaqoji aspektdə təhlil edilir. Kitabda, ana dilinin tərəqqisi uğrunda mübarizədə mollanəsrəddinçilərin rolunu və fəaliyyətini, ana dilinin tədrisinin zəruriliyi və əhəmiyyəti haqqındakı fikirləri təhlil edən müəllif bir sıra elmi ümumiləşdirmələr

əldə edir: məktəbin demokratik əsaslarla qurulması ideyaları pedaqoji aspektdə təhlil etmək; yeni elmi konsepsiya irəli sürmək; mollanəsrəddinçi maarifçi pedaqoqların müəllim və müəllim kadrları hazırlığı, müəllimlik fəaliyyətləri, həmçinin, müəllim şəxsiyyəti kimi fikirlər və düşüncələrini bu günün məktəb, maarif işığında öyrənilməsinin işə yararlılığı önə çəkilir. Xalq pedaqogikasından istifadənin əhəmiyyətini, təsvirini, təşəkkül və inkişafını mollanəsrəddinçilərin görüşləri baxımından təhlil tədqiqata elmi sanbal verir. C.Kamalov nəhayət, mollanəsrəddinçi maarifçilərin yaradıcılığında xalqa, vətənə, ailəyə və əməyə münasibət, onların səmərəli təşkili məsələləri haqqında fikirləri müasir pedaqoji elmi tələblər baxımından təhlil etməkdə görür.

K.Camalovun "Mollanəsrəddinçilərin maarifçilik ideyaları" adlı monoqrafiyası ilə tanışlıq və onun təhlili göstərir ki, o, dərin elmi axtarışlar, araşdırmalar və təhlillər sayəsində ərsəyə gəlmişdir. Monoqrafiya tamamlanmış müstəqil elmi-tədqiqat əsəridir. Müəllif əsəri ərsəyə gətirmək üçün geniş mənbələrdən və pedaqoji ədəbiyyatlardan istifadə etmişdir. Tədqiqatçı alim keçən əsrin 60-cı illərinin əvvəllərindən etibarən Respublikamızda nəşr olunan monoqrafiyalarda, metodik və ali məktəblər üçün nəzərdə tutulmuş əsərlərə müraciət etmiş, müqayisəli təhlillər, ümumiləşdirmiş, eləcə də ciddi elmi yaradıcı axtarışlar aparmış və onları ümumiləşdirməyin öhdəsindən gəlmişdir. Tədqiqatçının gərgin əməyi nəticəsində problemin mahiyyəti, qoyuluşu və tədqiq olunma vəziyyəti öyrənilmiş, qarşıya qoyulmuş məqsədə çatmaq üçün aparılmış tədqiqat metodlarının yeri düzgün müəyyənləşdirilmiş, optimal yolları üzə çıxarılmış, elmi şəkildə əsaslandırılmış, bu sahədə çox əhəmiyyətli elmi nəticələr əldə edilmişdir.

Monoqrafiyanın birinci fəsli "Mollanəsrəddinçilərin maarifçilik görüşləri" adlanır. Birinci fəsil iki yarımfəsildən ibarətdir.

Birinci yarımfəsil "Milli təfəkkürün inkişafında mollanəsrəddinçilərin yeri və rolu", ikinci yarımfəsil isə "Mollanəsrəddinçilərin ideya-siyasi görüşləri və tarixi faktlara münasibət" adlanır. Qeyd olunur ki, xalq arasında milli təfəkkürün, ictimai-ideya-syasi fikrin, baxışın inkişafında "Molla Nəsrəddin" jurnalının müstəsna xidmətləri vardır. Xalqı inkişafdan, tərəqqidən saxlayan ruhanilərə, fırıldaqçı din xadimlərinə qarşı mübarizə apararaq milli oyanışa ciddi cəhd göstərən mollanəsrəddinçilərin və həmçinin xalqda milli təfəkkürün inkişafı, bu mənada onları oyatmağı, ayağa qaldırmağı, hərəkətə gətirməyi, düşündürməyi, zülm və əsarətə qarşı mübarizəyə ruhlandırmağı, "camaatın bəsirət gözünü açıb dost ilə düşmənini ona tanıtmağı" qarşılarına məqsəd qoymaqla öz ölməz əsərləri ilə xalqı bəsirət sahibi etmələri lazımi dərəcədə təhlil olunur. Qeyd olunur ki, mollanəsrəddinçi maarifçilər güney və quzey Azərbaycanda, İranda, həm də türk dünyasında baş verən zərərli ictimai-siyasi hadisələrə qarşı sərt reaksiya vermişlər. Mollanəsrəddinçilər çar Rusiyasının, İran, Türkiyə və hətta Sovetlər dönəmində Nikolayları, Stolıpinləri, Məmmədəli şahları, Zilli-Sultanları, Sultan Əbdülhəmidləri və b. azadlıq və insan hüquqlarının tapdalamasını, onlar tərəfindən özbaşınalığın, istismarın hökm sürdüyünü, xalqın istək və arzularını öz şeir və felyetonlarında məharətlə təsvir etmişlər. Hadisələrin səbəbkarlarının tənqid atəşinə tutulma-

ları əxlaqi, tərbiyəvi mühiti pozanlara qarşı sərt yazılar yazmaları pedaqoji fikir tarixi üçün mühüm əhəmiyyət kəsb edir. Tədqiqatçı bütün bunlarla yanaşı 1960-cı ildən başlayaraq Respublikanın müstəqillik qazandığı dövrə qədər, həm də müstəqillik dövründə yazılmış ədəbiyyatlarda problemin işlənmə vəziyyətini və elmi-nəzəri əsaslarını lazımi dərəcədə təhlil edən müəllif, burada da mövzu ilə əlaqədar nəşr olunmuş kitabçalara, yazılmış dissertasiya işlərinə cəsarətli tənqidi münasibətini bildirməkdən çəkinmir. Burada müəllif milli, rus, türk və internet saytlarına qədər bir çox bədii, elmi, pedaqoji, psixoloji və metodik ədəbiyyatlara kimi mövzu ilə bağlı geniş ədəbiyyatı təhlil edərək müəyyənləşdirir ki, mollanəsrəddinçilər həyat hadisələrinə nikbin baxışlı olmuş, böyük arzularla yaşamış, gələcəyin səsini eşitmişlər. Qeyd olunur ki, mollanəsrəddinçilər həm çar Rusiyasının, həm də Sovet imperiyasının təsiri altına düşdüyünü görmüş, bu imperiyanın Azərbay-canda apardığı mənfur milli siyasətinə qarşı açıq mübarizə aparmışlar. Azərbaycanın yenidən müstəqilliyini əldə edəcəyinə inanan mollanəsrəddinçi maarifçilər bu arzularının həyata keçiriləcəyinə dərin inam bəsləmişlər. Müəllif uzunmüddətli araşdırmalar nəticəsində sübut edə bilmişdir ki, mollanəsrəddinçi maarifçilər, hər şeyə rəğmən ictimai-siyasi həyatın, pedaqoji-psixoloji, ədəbi-mədəni həyatın inkişafı üçün geniş imkanlar, insanların məişətində və şüurunda mühüm dönüş yaratmış, böyük ideallar uğrunda mübarizə aparmışlar. Hər iki yarımfəsil elmi və nəzəri cəhətdən diqqəti daha çox cəlb edir. Burada tədqiqatçı müstəqil münasibəti, tədqiqatçının məsələyə elmi yanaşması  razılıq doğurur.

Monoqrafiyanın “Təhsilin demokratikləşdirilməsi uğrunda mübarizədə mollanəsrəddinçilərin rolu” adlanan ikinci fəsli daha maraqlı və əhəmiyyətlidir. Fəsildə dörd yarımfəsil verilmişdir. Bu fəsildə “Ana dilinin tədrisi və tərəqqisi uğrunda mübarizədə mollanəsrəddinçilərin rolu və fəaliyyəti”, “Məktəbin demokratik əsaslarla qurulmasında mollanəsrəddinçilərin fikirləri”, “Mollanəsrəddinçilərin müəllim kadrları hazırlığında pedaqoji əlaqələri”, “Uşaq əsərləri və xalq pedaqogikasından istifadənin əhəmiyyəti mollanəsrəddinçilərin təhlilində” araşdırılmış, xarakterik xüsusiyyətlər və problemlər üzə çıxarılmış və əsaslandırılmışdır. XX əsrin əvvəllərində Azərbaycanda genişlənən təlimin ana dilində aparılması ideyasının birmənalı şəkildə mollanəsrəddinçilərin tərəfdar olmaları, ictimai-siyasi və pedaqoji əhəmiyyəti baxışında, həmçinin mollanəsrəddinçilərin müəllim kadrlarının hazırlanması, onların Rusiya və Avropanın klassik pedaqoqlarının, ilk növbədə dünya pedaqoji elminin banisi Yan Amos Komenski, İohan Henrix Pestalossi, Rusiyada elmi-pedaqoji fikrin görkəmli nümayəndəsi olan Konstantin Dimitriyeviç Uşinski kimi mütəfəkkirlərin ideyaları ilə sintez edilmiş, şərh edilmiş və bir sıra müsbət və mənfi cəhətlət xarakterizə edilmişdir.

Monoqrafiyanın bu fəslindəki əhəmiyyətli cəhətlərdən biri də tədqiqatçı tərəfindən mollanəsrəddinçilərin gənc nəslin əqli və əxlaqi inkişafında uşaq ədəbiyyatına olan münasibətini, həmçinin mollanəsrəddinçilərin yaradıcılığında xalq pedaqogikası nümunələrinin – nağıllar, tapmacalar, bayatılar, xalq mahnıları, mövsüm-mərasim nəğmələri, aşıq şeirləri, dastanlar, xalq tamaşaları və s. mənəvi keyfiyyətlərin elmi təhlilə cəlb olunması məsələsidir. Tədqiqatçı tərəfindən qeyd edilir ki, mollanəs-

rəddinçilər Azərbaycan təhsilinin Avropa və dünyanın qabaqcıl ölkələri ilə inteqrasiya olunmasına tərəfdar olmaqla bu işə əməlləri ilə yardım etmişlər.

Monoqrafiyanın III fəsli "Mollanəsrəddinçilərin şəxsiyyət tərbiyəsi haqqında ideyaları" məsələlərinə həsr olunmuşdur. Fəsil üç yarımfəsildən ibarətdir. Bu fəsildə ədalətsizliyin təsviri, mənəvi-əxlaqi kamilliyə və insani davranışa çağırışı, əxlaqi keyfiyyətlərin təbliği, xalqa, vətənə, ailəyə və əməyə münasibət tərbiyəsi kimi məsələlərdən bəhs olunur.

Tədqiqatçının göstərdiyi kimi, doğrudan da "Molla Nəsrəddin" jurnalının və eləcə də mol-lanəsrəddinçilərin tərbiyəvi fikirləri və görüşləri Azərbaycan məktəb və pedaqoji fikir tariximizi zənginləşdirən ən dəyərli pedaqoji örnəklər hesab olunur. Bu mənada jurnalın səhifələrindəki tərbiyəvi fikirləri, mollanəsrəddinçilərin pedaqoji görüşlərini daha geniş tədqiq etmək zəruridir. Mollanəsrəddinçilərin mənəvi-əxlaqi kamilliyə və insani davranışa çağırışı, əxlaqi keyfiyyətlərin təbliği, ictimai həyat haqqındakı fikirləri Azərbaycan və ümumən Şərq mədəniyyətində, maarifində yeni bir cığır açmışdır.

III fəslin "Mollanəsrəddinçi maarifçilərin yaradıcılığında xalqa, vətənə, ailəyə və əməyə münasibət" adlı sonuncu yarımfəslində, tədqiqatçı, tərəfindən inandırıcı arqumentlərlə sübut olunur ki, mollanəsrəddinçilər pedaqoji fikir və ideyalarında ailə tərbiyəsi məsələlərinə mühüm yer vermiş, ailə və məktəbin birgə işini, bunlar arasında vahid tələblərin gözlənilməsini, valideynin nümunəsini uşağın tərbiyəsində mühüm şərt saymışlar. Mollanəsrəddinçilər böyüyən nəslin tərbiyəsinin məzmunu, məqsədi, həyata keçirilmə imkanları ilə bağlı dəyərli fikirlər irəli sürmüş, əmək tərbiyəsini əxlaq tərbiyəsi ilə əlaqədə götürmüş, əməyin tərbiyəedici xüsusiyyətini önə çəkmiş, böyüyən nəsildə əməyə və əməkçi insanlara məhəbbət tərbiyə etməyi, sənət öyrətməyi vacib bilmişlər.

Ümumən, bu fəsilin elmi-nəzəri və metodik baxımdan işlənməsi uğurlu sayıla bilər.

Monoqrafiyanın sonunda verilmiş nəticələr də elmi maraq doğurur. Dərin elmi təhlilə əsaslanan nəticələr təqdirəlayiqdir, yenidir, elmidir. Monoqrafiyanın biblioqrafik bazası da zəngindir.

Beləliklə, pedaqogika üzrə fəlsəfə doktoru, dosent, əməkdar müəllim Kamal Camalovun "Mollanəsrəddinçilərin maarifçilik ideyaları" adlı kitabı, fikrimizcə, bu sahədə olan boşluğu doldurmaqla yanaşı, Azərbaycan mətbuat tarixində ən uzun ömürlü satirik məcmuə olan jurnalın istər yaradıcıları, istərsə də, orada nəşr edilən materialların milli məktəb, maarif, tədris işinə verdiyi elmi biliklərin, yönlərin üslub və verdişləri öyrənmək, incələımək baxımından əvəzsiz irs olduğuna diqqəti bir də yönəltmək gücündə olmasıdır. Bu əsər bir daha subut edir ki, "Molla Nəsrəddin" məktəbi XX yuzilin böyük bir yazarlar, müəllimlər ordusunu birləşdirən, Azərbaycanda maarif işini yönəldən əvəzsiz Universitet rolunu oynamışdır.



# AZƏRBAYCANDA PEDAQOJİ FİKRİN FORMALAŞMASININ İLK MƏRHƏLƏSİNDƏ JURNALLARIMIZDA TƏRBİYƏ MƏSƏLƏLƏRİ (1920-30-cu illər)

**Elnarə Məmmədova,**
***pedaqogika üzrə fəlsəfə doktoru,***
***ADPU-nun elmlər doktoru hazırlığı üzrə dissertantı***

Məqalədə Azərbaycanın ilk pedaqoji jurnallarında tərbiyə məsələlərinin qoyuluşundan danışılır, sonra 1920-1930-cu illərdə Azərbaycanda nəşr olunan "Xalq maarifi", "Xalq müəllimi", "Yeni məktəb", "Maarif işçisi", "Müəllimə kömək" jurnallarında tərbiyəyə dair məqalələr təhlil olunur, bütün bunların Azərbaycanda pedaqoji fikrin formalaşmasına təsirinə toxunulur.

***Açar sözlər:*** *pedaqoji mətbuat, pedaqoji fikir, tərbiyə nəzəriyyəsi, təlim prosesi.*
***Ключевые слова:*** *педагогическая пресса, педагогическая мысль, теория воспитания, процесс обучения.*
***Key words:*** *pedagogical press, pedagogical thought, theory of upbringing, the process of education.*

Mənəvi dəyərlərin təsiri altında püxtələşən Azərbaycan pedaqoji fikrinin formalaşdırılmasında pedaqoji mətbuatın rolu danılmazdır. Azərbaycan pedaqoji fikrinin inkişafında onun mətbuat səhifələrinə çıxarılması zəruri mərhələ təşkil edir. Aydın həqiqətdir ki, pedaqoji fikrin, pedaqoji elmin dəyərləndirilməsində pedaqoji mətbuat həmişə aparıcı mövqedə olmuşdur.

Azərbaycanda pedaqoji fikrin sistemli şəkildə tədqiqi və öyrənilməsinə əsasən ötən əsrin 20-ci illərindən başlanmışdır. XX əsrin birinci yarısını əhatə edən zaman kəsiyində müxtəlif pedaqoji jurnalların bu sahədəki fəaliyyəti dünya pedaqoji fikrinin tərkib hissəsi olan Azərbaycan pedaqoji fikrinin formalaşmasında əsaslı amil kimi çıxış edir.

Azərbaycan mədəniyyətinin pedaqoji salnaməsi, ilk növbədə, maarifçilik hərəkatından qaynaqlanır. İlk maarifçilərimiz olan A.Bakıxanov, M.Kazımbəy, M.Ş.Vazeh, M.F.Axundov və başqalarının pedaqoji fikirləri maarifçilik konsepsiyasını zənginləşdirmiş, ona yeni çalarlar vermişdir. XIX əsrdə yetişən maarifçilərin yeni nəsli elmi-pedaqoji fəaliyyəti ilə bu sahədə böyük canlanma yaratdı. Zaqafqaziya (Qori) müəllimlər seminariyasının Azərbaycan şöbəsinin fədakar məzunlarının fəaliyyəti xüsusi qeyd edilməlidir.

Azərbaycanda pedaqoji fikir quru yerdə deyil, möhkəm zəmin üzərində yaranmış, Nizami, Füzuli, M.F.Axundov, C.Məmmədquluzadə, N.Nərimanov kimi mütəfəkkirlərin elmi düşüncələrinə əsaslanmışdı.

Ulu öndərimiz Heydər Əliyev demişdir: "Azərbaycanın təhsili, məktəbləri sona çatan XX əsrdə çox böyük nailiyyətlər əldə edib. Əsrin əvvəllərində Azərbaycanın mütəfəkkir şəxsləri, maarifçiləri, ziyalıları, müəllimləri xalqımızı savadsızlıqdan, ətalətdən çıxartmaq, maarifləndirmək, təhsili inkişaf etdirmək üçün çox işlər görmüşlər. Əgər

Azərbaycan Respublikasının təhsil tarixi yazılsa (bu tarix yazılmalıdır), şübhəsiz ki, hər mərhələdə görülən işlər orada əksini tapacaq və öz qiymətini alacaqdır".

Tarix göstərdi ki, Azərbaycan pedaqoqları maarif, təhsil sahəsində qarşıya qoyulan bu vəzifəni doğrultdular, öz dəyərli məqalələri ilə pedaqoji irsimizi zənginləşdirdilər. XX əsrin əvvəllərində bir sıra pedaqoji jurnallarımız bu sahədə ilk addımlar atmışlar. Azərbaycan mətbuatı tarixində ilk pedaqoji orqan kimi 1906-cı il aprelin 16-da Bakıda Əli İskəndər Cəfərzadə və Məmməd Həsən Əfəndizadənin naşirliyi ilə ərsəyə gələn "Dəbistan" jurnalı 1908-ci il martın 1-dən fəaliyyət göstərmişdir. "Dəbistan"la Nəriman Nərimanov, Həsənbəy Zərdabi, M.Ə.Sabir, S.M.Qənizadə, Məhəmməd Hadi, Fərhad Ağazadə, Abbas Səhhət, F.Köçərli, R.Əfəndiyev, Ə.Əfəndizadə və başqa tanınmış qələm sahibləri əməkdaşlıq etmişlər. Jurnalda çap olunan məqalələrdə valideynlərin uşaq təlim-tərbiyəsi istiqamətində maarifləndirilməsi, məktəblərin təşkilində onların yaxından iştirakının təmin edilməsi məsələləri qoyulur və bir sıra tövsiyələr verilirdi. Jurnalda çap olunan bu tipli yazılar maarifçi-demokratik səciyyə daşıdığı üçün işıqlı fikirli ziyalıları bu jurnalda ardıcıl yazılar verirdilər.

"Dəbistan"la yanaşı "Rəhbər" jurnalı da fəaliyyətə başladı. "Rəhbər" aylıq pedaqoji jurnal idi. Onun ilk nömrəsi 1906-cı il sentyabrın 24-də, sonuncusu 1907-ci il yanvarın 17-də (cəmi 5 nömrə) çıxmışdı. "Rəhbər"də təlim-tərbiyəyə, ictimai məsələlərə dair məqalələr, Azərbaycan, rus və dünya ədəbiyyatından nümunələr dərc olunurdu. "Rəhbər", əsasən, demokratik istiqamətli olmuş, siyasi fikirləri, elmi bilikləri təbliğ etmiş, Azərbaycanda pedaqoji fikrin formalaşmasında, təhsilimizin inkişafında onun da mühüm xidmətləri olmuşdur.

Onu da qeyd etmək lazımdır ki, ömrü az olsa da "Rəhbər" məcmuəsi də öz zamanında az iş görməmişdir. Onun redaktoru S.M.Qənizadə, C.Məmmədquluzadə, N.Nərimanov, F.Köçərli, M.Ə.Sabir, A.Səhhət, Ü.Hacıbəyli, A.Şaiq kimi şəxsiyyətlərin dostu olan Mahmudbəy Mahmudbəyov idi. M.Mahmudbəyov (1863-1923) görkəmli müəllim, metodist, maarif xadimi, məktəb dərslikləri müəllifi kimi tanınır. O da 1883-cü ildə Qori Seminariyasını bitirmişdir. O, heç bir gün də öz sevimli peşəsindən ayrılmamışdır. Onun zəhməti ilə "Rəhbər" ixtisaslı pedaqoji jurnal kimi tanınırdı. Elə bu səbəbdən də, "Rəhbər"in nəşri ziyalılar tərəfindən daha böyük sevinclə qarşılanmışdı. Təsadüfi deyil ki, 1907-ci ilin yanvarında "Rəhbər"in nəşrinin dayandırılması Azərbaycan ziyalılarını çox məyus etmişdi.

Jurnalda dəfələrlə qeyd edilirdi ki, tərbiyənin müxtəlif sahələrinə aid nəzəri məsələləri bilmədən bu vəzifənin öhdəsindən gəlmək olmaz. Bu baxımdan S.M.Qənizadənin "Körpə uşaqların tərbiyəsi" (1906, №2-4, 1907, №5) məqaləsində tərbiyə üsulları, "pedaqogika" və onun yaranma tarixi haqqında maraqlı məlumatlar vardır.

"Dəbistan" və "Rəhbər" məcmuələrinin davamı kimi 1911-ci ildən nəşr olunan "Məktəb" jurnalında da zəmanəsinin mühüm pedaqoji problemlərinə, o cümlədən tərbiyə məsələlərinə toxunan məqalələr çap edilirdi. Doqquz ildə onun 100-ə yaxın nömrəsi çıxmışdır. 1918 və 1919-cu illərdə "Məktəb"in cəmi bir neçə nömrəsi işıq üzü görmüş, 1920-ci ildə cəmi 3 nömrəsi çıxandan sonra martın 21-dən nəşri dayandırılmışdı.

"Məktəb" jurnalının ilk nömrəsindən başlayaraq təlim və tərbiyə məsələlərinə

geniş yer verilmişdir. Jurnal yeni üsullu məktəbləri alqışlayırdı. Onun səhifələrində yeni üsullu məktəblərin tərbiyə üsulları inandırıcı boyalarla təbliğ edilirdi.

Beləliklə, hər üç jurnal, əsasən, uşaqlar üçün nəzərdə tutulsa da, burada təlim-tərbiyə məsələlərinə də geniş yer verilmişdir. Təəssüf ki, onların heç biri zamanın sərt qanunlarına axıradək sinə gərə bilməmiş, qısa ömür yaşamışdır.

Qeyd etmək lazımdır ki, elmi-ədəbi jurnallardan fərqli olaraq ən böyük ölkələrdə belə pedaqoji mətbuatın nəşri xeyli gecikmişdir. Məsələn, 1950-ci illərdən başlayaraq Qərb ölkələrində, o cümlədən, Fransa, ABŞ, İtaliya və bir sıra digər ölkələrdə müxtəlif pedaqoqlar birləşərək, pedaqoji dərgilər, toplular, jurnallar çap etməyə başlamışdır. Onlar təlim, tərbiyə və təhsil sahəsində apardıqları tədqiqat işlərinin nəticələrini həmin informasiya vasitələri ilə təşviq edirdi.

Azərbaycanda uzunmüddətli pedaqoji mətbuat orqanlarının yaranması ötən əsrin 20-ci illərinə təsadüf edir. Bu zaman pedaqoji yönümlü jurnalların nəşrinə şəraitin yaradılması pedaqoji xarakterli mətbuat orqanlarının zəruriliyini praktikada təsdiq etdi. Yeni quruluşun qanunlarına uyğun fəaliyyət göstərən bu jurnallar dövrün pedaqoji fikirlərinin daşıyıcısı kimi çıxış edirdilər. Azərbaycanda sovet hakimiyyəti qurulana qədər maarifə, məktəbə xidmət edən ziyalıların, xalq maarifi, məktəb sahəsində çalışanların bir çoxu yenidən bu cəbhəyə qatıldılar. Azərbaycan XMK-nın qərarı ilə işıq üzü görən “Xalq maarifi” jurnalı (1920) ilk təşəbbüs kimi müsbət hal idi. Çox təəssüf ki, jurnalın ancaq bir nömrəsi işıq üzü gördü. Lakin buradakı bəzi məqalələr təlim-tərbiyə məsələlərinə yeni münasibətin ifadəsi idi. Jurnal elə bu nömrəsindən tərbiyə məsələsini yaddan çıxarmamış, Fərhad Ağazadənin “Tərbiyənin tarixçəsi” adlı məqaləsini dərc etmişdir. Bu məqalə sonrakı tədqiqatçıların da diqqətini cəlb etmişdir.

Azərbaycanda sovet hakimiyyəti qurulduğu ilk günlərdən etibarən xalq kütlələri arasında maarif və mədəniyyətin yayılmasına maraq yarandığından pedaqoji mətbuata da maraq artırdı. Xalq maarifi məsələləri ilə yaxından məşğul olan pedaqoji orqanların zəruriliyinə dair çağırışlar səslənirdi.

Müəllimlərə pedaqoji-metodiki yardımı gücləndirmək, sovet məktəbində təlim-tərbiyənin məzmununu geniş təhlil etmək, proqram və dərsliklərdən istifadə etməyə əməli kömək göstərmək məqsədilə 1923-cü ildən “Maarif və mədəniyyət”, 1924-cü ildən “Xalq müəllimi”, “Yeni məktəb”, 1925-ci ildən isə “Maarif işçisi” kimi pedaqoji jurnallar nəşr olunmağa başladı.

1924-cü ilin oktyabrında nəşrə başlayan “Xalq müəllimi” jurnalı məhz belə fikirlərin nəticəsi kimi təsis edilmişdir. Azərbaycan maarif işçiləri həmkarlar ittifaqının aylıq orqanı olan bu jurnalın qarşısında maarifimizin inkişafına kömək etmək məqsədi qoyulmuşdu. Xatırladaq ki, pedaqoji mətbuatımız tarixində 1920-ci ildə cəmi bir nömrəsi işıq üzü görən “Xalq maarifi” jurnalının da aqibəti “Xalq müəllimi” kimi olmuşdur. Təəssüf ediləsi haldır ki, “Xalq müəllimi” nə “Yeni məktəb”, nə də “Müəllimə kömək” kimi sabitqədəm ola bilməmişdir. Necə deyərlər, dövrün təzyiqi onun da qəddini sındırmışdı.

Lakin ədalət naminə demək lazımdır ki, ötən yüzilliyin 20-ci illərində Azərbaycanda tarixi-pedaqoji irsin araşdırılmasında, pedaqoji fikirlərin təbliğində böyük zəruriyyət yarandığı zaman işıq üzü görən “Xalq müəllimi” jurnalı elə ilk məqalələrində öz

oxucusunun diqqətini Azərbaycan məktəbinin gündəlik problemlərinə, ayrı-ayrı şəxsiyyətlərin təlim-tərbiyəyə dair fikirlərinə, pedaqoji sahədə qarşıda duran vəzifələrə cəlb edirdi. Lakin müəyyən səbəblər üzündən bu jurnal öz ideyalarını axıra çatdıra bilməsə də, az müddətdəki fəaliyyəti ilə o özünü tarixdə qalan bir jurnal kimi təqdim edə bilmişdir.

"Xalq müəllimi" jurnalına ön sözü o dövrün söz sahiblərindən biri olan, redaktor Pənah Qasımov özü yazmışdır. "Müqəddimə əvəzinə" başlığı ilə verilən bu yazıda jurnalın qarşısında duran mübariz vəzifələr və onun gələcək planları oxuculara çox inam və ümidlə çatdırılırdı. Burada Azərbaycanda maarifin inkişafı üçün "uzun və inadlı mübarizə aparmağın" vacibliyi qeyd olunur və bu illər inqilabi işimizin davamı kimi göstərilirdi. Məqalədə o zamankı ideologiyanın əsas prinsipləri müdafiə olunurdu.

Jurnal Azərbaycan maarifinin işıqlı gələcəyinə, respublikada elm və mədəniyyətin yüksəlişinə, gənc nəslin təlim-tərbiyəsinə böyük ümid və inam bəsləyir, eyni zamanda oxuculara bu yolun çətin və məsuliyyətli olduğunu xatırladırdı.

Jurnalın pedaqoji şöbəsi "Dünyanın ən böyük pedaqoqları" başlığı ilə Sədi Şirazinin tərbiyəyə dair fikirlərini vermişdir. Jurnalın ilk nömrəsi üçün Sədinin seçilməsi təsadüfi deyildi. Çünki Sədi (1184-1291) Yaxın və Orta Şərq xalqlarının ədəbiyyatına, eləcə də ictimai və etik fikrinə güclü təsir etmiş mütəfəkkirlərdəndir. Onun ölməz əsərləri Yaxın Şərq xalqlarına ağıllı nəsihətlər, bəşəri düşüncələr, nəcib duyğular aşılayırdı. Onun həm "Gülüstan"ı, həm də "Bustan"ı İran, Türkiyə, Hindistan, Orta Asiyada olduğu kimi, Azərbaycanda da dərslik rolunu oynamışdır. O zaman məktəblərimizdə dərs aparan yaşlı müəllimlər Sədinin əsərləri ilə tanış idilər. 1905-ci ilə kimi mədrəsə və məktəblərimizdə Qurandan sonra mütləq "Gülüstan"dan dərs verilərdi. Azərbaycanda bir adam tapılmazdı ki, Sədinin adını eşitməmiş olsun. "Gülüstan"ın, "Bustan"ın bir çox parçaları bu günə kimi əski oxumuşlarımızın yaddaşından silinməmişdir. Görkəmli tədqiqatçı S.Mümtazın sözləri ilə desək: "Sədinin "Gülüstan" əsəri başdan-başa əxlaqa, tərbiyəyə dair və onunla bərabər bir çox nəsihətlərə və həkimanə sözlərə havidir".

Məqalədə Sədinin müəllim haqqında bu gün də öz əhəmiyyətini itirməyən fikirləri də verilmişdir: "Müəllim özünü olduqca təmkinli aparmalıdır; çox qəzəbli olmaq müəllimə yaraşmadığı kimi, çox da mülayim olmaq müəllim üçün böyük nöqsandır". Sədi məktəbin və müəllimin vəzifələrini düzgün qiymətləndirir, müəllimə olan məhəbbətini ata məhəbbətindən üstün tuturdu. Müəllimin tələbkar olmasını zəruri sayırdı, uşaqlara fərdi yanaşmanı da vacib bilirdi. Onun fikrincə, cavahir daşdan çıxsa da, hər daşdan cavahir olmaz. O uşaqların tərbiyəsinə kiçik yaşdan başlamağı tövsiyə edirdi.

Məqalədə Sədinin tərbiyə haqqında bəzi fikirləri Avropa pedaqoqlarının nəzəri fikirləri ilə müqayisə olunurdu. O da Qərb mütəfəkkirləri kimi, irsiyyət, tərbiyə və mühitə insan şəxsiyyətinin formalaşmasına təsir edən amillər kimi baxırdı. O da maraqlıdır ki, uzun səyahətlərdən sonra Sədi 1257-ci ildə vətəni Şiraza qayıtmış, ömrünün axırına qədər öz doğma şəhərində yaşamış, burada da mühitinin müdrik filosofu, alimi,

pedaqoqu kimi şöhrət tapmış, 1291-ci ildə elə orada vəfat etmişdir. Oxuculara o da aydın olur ki, Sədi “Büstan”ı 1257-ci ildə, yəni 63 yaşında, “Gülüstanı”ı isə 1258-ci ildə, 64 yaşında ikən yazmışdır. Sədi bu əsərləri ilə dünya ədəbiyyatına böyük moralist şair və nasir kimi daxil olmuşdur. O yaxın Şərqdə didaktik poema janrının ən gözəl nümunələrini yaratmışdır. Böyük pedaqoq bu əsərlərində ata-ananı uşağın tərbiyəsinə fikir verməyə çağırır, uşağa peşə öyrətməyi tələb edir. Əsərdə bizim əsrimiz üçün də öz tərbiyəvi əhəmiyyətini itirməyən ağıllı öyüdlər, ibrətamiz fikirlər, tərbiyəvi nəsihətlər çoxdur.

“Xalq müəllimi” jurnalının öz oxucularının diqqətini belə bir mütəfəkkirə cəlb etməsi bu gün də düzgün anlaşılmaqdadır.

Jurnalda Əliskəndər İskəndərzadə ilə birlikdə S.M.Qənizadə də iştirak etmişdir. M.S.Qənizadə pedaqoji irsin öyrənilməsində mətbuatın qüvvəsinə arxalanır və “hal-hazırda nəşr olunan pedaqoji jurnallarımız bu mətləbin müzakirəsi üçün geniş meydandır” – deyirdi. Bütün ömrünü xalq maarifinin inkişafına sərf edən pedaqoq jurnalda işıq şöləsi kimi parlayırdı.

“Xalq müəllimi”nin gələcək planları ilə tanış olan M.S.Qənizadə gənc müəllimlərin məqalələrinin, xüsusən pedaqoji tariximizə dair yazıların jurnalda geniş yer tutacağına ümid bəsləyirdi. Böyük həyat təcrübəsi olan belə ağsaqqal pedaqoqun fikirləri oxucular tərəfindən ümidlə qarşılanırdı.

Jurnalda tanınmış pedaqoq, yazıçı A.Şaiqin “İnsanların həyatında şeir və ədəbiyyatın mövqeyi və əhəmiyyəti” adlı məqaləsi də çap olunmuşdur. Müəllimlərin bədii-estetik görüşlərinə kömək etmək baxımından A.Şaiqin məqaləsi çox əhəmiyyətli idi. Müəllif şeir və ədəbi əsərlərin digər janrlarının estetik təsirindən danışır, şeir tarixinə ötəri də olsa nəzər salırdı. O, şeiri “ruhun ən ülvi ifadəsi” adlandırırdı. Ədəbi əsərin tərbiyəvi təsirini göstərən müəllif yazırdı ki, “ədəbiyyat füsunkar təsiri ilə insanların ruhuna, qəlbinə girir, orada istədiyi kimi əməliyyat aparır”. Görkəmli şair, gözəl müəllim olan A.Şaiq ədəbiyyatın ən qiymətli məziyyətini onun tərbiyəviliyində görürdü. Belə həlim, munis münasibəti A.Şaiqin dilindən eşitmək elm-ürfün sahiblərini ruhlandırırdı.

Jurnalın əsas işi maarif məsələlərinin təbliği olsa da, tərbiyə məsələləri də unudulmamışdı. Jurnal müəllimləri öz işini sevməyə, bacarıqlı, elmi-metodiki cəhətdən hazırlıqlı olmağa çağırırdı. “Məslək eşqi” məqaləsi də bu məsələlərə həsr olunmuşdu.

“Xalq müəllimi” ölkəşünaslıq məsələlərinə də ayrıca yer ayırmışdı. “Yurdumuzu öyrənməliyik” adlı məqalədə məktəbdə ölkəşünaslıq işlərinin tərbiyəvi əhəmiyyətindən danışılır və müəllimlərə dəyərli fikirlər aşılanırdı. Burada ölkəşünaslıq dərnəklərindən xüsusi bəhs edilirdi. Bu məzmunlu yazılara sonralar digər pedaqoji jurnallarda da rast gəlmək olurdu.

Beləliklə, jurnal öz proqramını həyata keçirmək üçün gözəl bir başlanğıc götürmüşdü. Lakin o da bir sıra səbəblər üzündən öz nəşrini elə birinci nömrədən sonra dayandırmalı oldu.

Azərbaycan pedaqoji mətbuatı tarixinin araşdırılmasında o qədər də diqqəti cəlb etməyən, necə deyərlər, pedaqoji təhsilimiz tarixində tədqiqatdan kənarda qalan “Xalq müəllimi” məcmuəsi özünün bircə nömrəsi ilə də tarixə düşmüş, yaddaşlarda iz salmışdır.

Göründüyü kimi, pedaqoji mətbuatımızın tarixinin araşdırılması və tədqiqi bu gün də təlim-tərbiyə işlərinin düzgün qurulmasına kömək edən dəyərli məxəzlərdəndir.

Azərbaycan təhsili iki ilə yaxın pedaqoji jurnalsız qaldı. 1923-cü ildə bu fasiləyə son

qoyuldu və Tağı Şahbazlının redaktorluğu ilə "Maarif və mədəniyyət" jurnalı nəşr olundu. Bir məsələni nəzərə almaq lazımdır ki, "həmin illərdə bir qisim yazıçı və ədəbiyyatşünas pedaqoji işdə çalışır, əməli ictimai fəaliyyətlərdə və yaradıcılıqlarda pedaqoji təmayülə meyil göstərirdilər. Onlar həmin jurnallarda həm yazıçı, şair, həm də pedaqoq kimi çıxış edirdilər" (Ə.Ağayev). "Xalq maarifi", həmçinin "Maarif və mədəniyyət" jurnallarında maaarif, elm, mədəniyyət, ədəbiyyat və incəsənətə aid materiallar da onlar tərəfindən çap edilirdi. 1923-1927-ci illərdə Azərbaycan XMK-nın orqanı kimi fəaliyyət göstərən "Maarif və mədəniyyət" jurnalı da pedaqoji təmayüllü məqsədi ilə yaradılsa da, burada bədii əsərlər pedaqoji təmayüllü məqalələri üstələyirdi. Ona görə də, tezliklə jurnalın təmayülü tamam dəyişdi və jurnalın özü də birbaşa Azərbaycan Yazıçılar Cəmiyyətinin orqanına çevrildi.

1924-cü ilin aprelindən nəşr olunmağa başlayan "Yeni məktəb" "Maarif və mədəniyyət" məcmuəsinin elmi-pedaqoji fikirlərinin davamçısı olsa da o, pedaqoji məsələləri jurnalın ümdə məqsədi səviyyəsinə qaldıraraq sələfindən fərqləndi. Daha doğrusu, "Yeni məktəb"in bütün məzmunu və mündəricəsi ilə pedaqoji mahiyyət daşıyan elmi-pedaqoji və metodik jurnal idi.

Jurnalın qarşısında çox mühüm və şərəfli vəzifələr dururdu. O, "bütün Azərbaycan qəzalarının, maarifinin, buradakı tərbiyə məşğələlərinin bir ağac ətrafında toplamalı", "hər müəllimin, hər məktəbin təlim və tərbiyə işləri ilə əlaqədar olan təsvir və düşüncələrin göstərməsi", "pedaqoji, psixoloji, tərbiyə tarixi, tədris üsulu, metadoloji didaktika, fəlsəfə, ictimaiyyət, bədiyyat, sənət və bunlar kimi yaxın elmlərin" müəllimlik ixtisası dairəsində tədqiq və təhrif etməli, qabaqcıl təcrübəni yaymalı idi. "Yeni məktəb"də deyilirdi: "Cəmiyyətin ehtiyacına müvafiq fərdlər yetişdirmək üçün irəlidən müəyyən edilmiş sistem və məqsədsiz tərbiyə işləri qurula bilməz". (1930, №3) "Yeni məktəb" jurnalı uşaqların tərbiyəsində məktəblə ailənin sıx əlaqəsini də vacib sayırdı. "Mümkün olan vaxtlarda ata-analaların yığıncaqları çağırılmalı, bu və ya digər yığıncaqlarda, məsələn, çocuqları tərbiyə etməli", "Nə üçün çocuqlara cəza vermək olmaz" kimi mövzularda məruzələr söylənməlidir (1928, №10). Jurnal düzgün tərbiyəni hər şeydən əvvəl kollektiv daxilində görürdü.

"Yeni məktəb"də dərc olunan məqalələrdə nəsihətamiz fikirlər, hikmətli sözlərin deyilişi ilə diqqəti cəlb edən sərlövhə və yarımbaşlıqlar, fərqləndirici şriftlərlə yığılmış cümlələr də bəzən kursiv formasında çap olunaraq nəzərə çarpdırılmışdır. "Məktəbin birinci səciyyəsi tərbiyəvi olmasıdır", "Məktəbin ən mühüm, ən ümdə vəzifəsi budur: azad, fədakar və müşfiq (şəfqətli, mehriban) insan yetişdirmək"; "Məktəbin qayəsi şagirdi həyata hazırlamaqdır"; "Həyat gözüaçıq, həqiqəti qanan, vəzifəsini bilən, həmcinsinin hörmətini saxlayan, sadiq, namuskar, hürr və fədakar insanlar istəyir, bu da tərbiyə və elm ilə qabil olur. İştə bunun üçün də məktəb həyatın qapısı, həyatın fabrikasıdır". Bu fıkirlər İsmayıl Hikmətin məcmuənin 1924-cü ilin mayında çıxan 2-ci nömrəsindən götürülmüşdür.

"Yeni məktəb"də tərbiyə məsələləri ön plana çəkilirdi. Orada deyilirdi: "təlim uşaqlara yalnız biliklər qazandırmaq üçün deyildir, bəlkə onun ən böyük vəzifələrindən biri

cocuğu əxlaqa yüksəldib alicənab etmək, həyatın çürük səfsətə və əqidələrindən uzaqlaşdırmaq, ona gözəl məfkurələr qazandırmaq və onun əql və zəkasını inkişaf etdirməklə hisslərini yumşaltmaqdır ” (yenə orada, səh. 117).

“Yeni məktəb”də tanınmış pedaqoq M.Rəhimlinin məqalələri də maraqla qarşılanırdı. O, öz fikirlərinin şərhində pedaqoji irsimizi öyrənməyi vacib sayırdı. M.Rəhimlinin “Tədris və tərbiyənin nəzəri işi” məqaləsində deyilirdi: “.... biz pedaqoji irsimizdə instiktlər haqqında bunu bilməliyik: instinkt zövq ilə (yəni daxili həyatımız, hissiyyatımız və duyğularımız) sıx rabitədə olan irsi əməllər və təşəbbüsdür. İnstinktlər şəxsiyyətin təşkilində, insanın dünyanı düşünməsində, onun maraq və hərəkətlərində böyük rol oynayır. Buna görə də, tərbiyə işimizdə bu instiktləri unuda bilmərik”. O, bir qədər də irəli gedərək, “gənc nəslin əski həyat şəcərəsindən aşıb onlardan “yeni insanlar yetişdirmək məsuliyyəti, bu gün ən çox məktəbin öhdəsinə düşmüşdür”, -deyərkən yanılmamışdır. Bəzən müəlliflər hissə qapılsalar da, öz məqsədindən yayınmır, müəllimləri pedaqoji, psixoloji qanunlara tabe olmağa çağırırdı. Hər sətrində ideologiyanı təsiri hiss olunsa da, müəllif bütün yazısı boyu pedaqoji prinsiplərə sədaqətli qalmışdır.

“Tədris və tərbiyədən nəzəri iş” adlı başqa məqalədə (“Yeni məktəb”, 1988, №8-9) yenə də pedaqoq M.Rəhimli məktəblərimizdə tərbiyə işinin qoyuluşuna dair məsələləri şərh etməyə çalışmışdır. O yazırdı ki, bu vaxta qədər məktəbimizdə ən çox savad məsələsinə yer verilmişdir, tərbiyə cəhətinə səthi yanaşılmışdır. Halbuki, tərbiyə məsələləri bu gün bütün məktəb işlərinin əsası olmalıdır, məktəbdə tərbiyə işləri yüksək mövqe tutmalıdır.

“Yeni məktəb”də tərbiyə məsələlərinə geniş yer verilir. Tərbiyə işlərinin təşkilinə dair fikir və mülahizələrdə dövrün ideologiyası ön planda gedirdi. Bunların hamısı kommunist tərbiyəsinə dair prinsiplərlə əlaqələndirilirdi. Bununla yanaşı məqalələr pedaqogikanın əsas tələblərindən tam uzaqlaşmaq təsiri bağışlamırdı. Jurnal sərbəst tərbiyənin tərəfdarı deyildi. Nəticə olaraq bu qənaətə gəlirdi ki, “şagird məktəbin məqsədəuyğun olaraq əvvəldən qərarlaşdırılan bütün iş quruculuğuna və imtiyazlarına tabe olmalıdır” (“Yeni məktəb”, 1930, №3, səh.36). Tərbiyə işində məqsəd “yeni insan kütlələri hazırlamaqdır” (Yenə orada, 1924, №3-4).

“Maarif işçisi” jurnalında da tərbiyə məsələləri çox ciddi qoyulurdu. O, bu işə yaradıcılıqla yanaşmağı tövsiyə edirdi: “Tərbiyənin məqsədi yalnız təbii təmayülləri inkişaf etdirmək deyil, eyni zamanda onlara yeni şəkil-keyfiyyət və istiqamət verməkdir”. “Maarif işçisi”ndə “Məktəb intizamı” adlı bir məqalədə qayda-qanunu pozmuş şagirdlərin cəzalandırılmasından danışılır və üç cür cəza növünü tətbiq etmək məsləhət görülürdü:

1. Nəsihət
2. Öz nöqsanı üzərində düşündürmək
3. Tərbiyə və məsləhət (1926, №2)

Jurnal fiziki cəzanın tam əleyhinə idi. Bir müddət pedaqoji jurnallarla paralel nəşr olunan “Maarif işçisi” tərbiyə nəzəriyyələrinə dair bir sıra qiymətli fikirlərin də müdafiəçisi və təbliğatçısı olmuşdur.

“Müəllimə kömək” jurnalında da tərbiyə məsələlərinə geniş yer verilmişdir. Jurnalın baş məqalələrinin birində təlimlə tərbiyənin qarşılıqlı vəhdətindən danışılaraq deyilirdi ki, sistemli təlimsiz tərbiyə, aydın məqsədli tərbiyə olsa da təlim kifayətləndirici olmaz.

“Müəllimə kömək” jurnalı göstərirdi ki,

məktəbdə şagirdlərin tərbiyəsi həmişə ilk plana çəkilməlidir. Bütün fənlərin tədrisində şagirdlərin dünyagörüşünün genişləndirilməsinə diqqət yetirilməlidir, orada konkret deyilirdi ki, şagirdlərin tərbiyəsini yüksəltməyə xidmət etməyən dərs yoxdur (1938, № 5-6). Sonra bu fikir inkişaf etdirilərək belə bir qənaətə gəlinirdi ki, "tərbiyə işində vahidlilik və ardıcıllıq prinsipinə, inandırmaya, hər bir şagirdə fərdi yanaşmaya, təşviqat işinə ciddi riayət edilməlidir". Ötən əsrin otuzuncu illərində pedaqoji mətbuatda şüurlu intizam tərbiyəsindən geniş söhbət açılırdı. "Müəllimə kömək"də "Məktəbdə şüurlu intizam uğrunda mübarizə" adlı məqalədə (1938, № 8,9) şüurlu intizamı möhkəmləndirməyin yolları da göstərilirdi. Bu zaman müəllimin şüurlu davranışı, şagirdlərin məktəbə sədaqətli olması, şagirdlərlə rəftarın düzgünlüyü, müəllimlərin tərbiyə işində pedaqoji ustalığı, tədris prosesinin düzgün təşkili, məktəb işlərinə düzgün rəhbərlik və b. şərtlər irəli sürülürdü. Burada uğurlu intizamın mahiyyəti tam açılmasa da, verilən məsləhətlər faydalı idi. Jurnalın sonrakı nömrəsində (1938, №8-9) şüurlu intizamın mahiyyətinə toxunulur və ona aşağıdakı şərhi verirdi: "Şüurlu intizam - bu, adamın digər adamla, böyüyə, yoldaşa, özündən kiçiyə münasibətdir, adamın əməyə, ictimai mülkiyyətə və öz-özünə münasibətidir". "Şüurlu intizam yeni əlaqələrdə, əməkdə, ictimai həyatda və mübahisədə iştirak edən adamlar arasında həmrəylik, sıxlaşmaq və birlikdən ibarətdir". Burada şüurlu intizama bir qədər "siyasi don geydirilsə" də, əsas məsələdən uzaqlaşmaq halı yox idi. Məqalələrin əsas məxəzi ondan ibarət idi ki, şüurlu intizamda şəxsi və ictimai maraq birləşdirilməlidir. Şagirdlər anlamalıdırlar ki, intizam olmadan səmərəli təlim olmaz. Bir sözlə, şagirdlərin şüurlu intizamı onun dərs prosesinə müsbət təsir göstərmişdir.

"Müəllimə kömək"də tənbeh məsələlərinə də toxunulur və bəzi məsləhətlər verilirdi: "Həvəsləndirməni tətbiq etməklə qurulmuş dərs, müəllimin və məktəb rəhbərlərinin məsləhətləri və inandırmaları, uşaqları tərbiyə edən şərait və b.".

30-cu illərdə müəllimin "Pedaqogika" dərslikləri olmadığı dövrdə "Müəllimə kömək"dən bu məqalələr müəllimlərə düzgün məsləhət verən bu məsələlər nəzəri cəhətdən rəhbərliyi öz üzərinə götürmüşdür.

20-30-cu illərdə "Maarif və mədəniyyət", "Kommunist tərbiyəsi uğrunda" jurnallarında pedaqoji yönümlü məqalələrində tərbiyə məsələlərinə dair bir sıra fikirlər söylənmişdir. Qeyd etmək lazımdır ki, pedaqoji fikir tarixində az tədqiq olunan "Kommunist tərbiyəsi uğrunda" jurnalı ilk vaxtlar "Yeni məktəb"in davamı kimi adlandırılsa da, sonra o daha əhəmiyyətli məsələlərin şərhinə yer verdi. Bu jurnal "Yeni məktəb"in ardıcılı "Müəllimə kömək" ilə 1930, 1931, 1932, 1934-cü illərdə paralel nəşr olunmuşdur. 30-cu illərin əvvəllərində pedaqogikanın nəzəri-metodoloji və tarixi problemlərinin araşdırılması, müəyyən elmi-nəzəri fikirlərin formalaşdırılması, elmi həqiqətlərin formalaşması, ümumi icbari təhsilin həyata keçirilməsi, pedaqoji fikrin inkişafı, dünya pedaqoqlarının pedaqoji irsinin azərbaycanlı oxuculara çatdırılması, təlimin həyatla, əməklə əlaqələndirilməsi, şagirdlərin hərbi vətənpərvərlik, vətənə sədaqət, ictimai fəallıq tərbiyəsinə aid pedaqoji mətbuatın çap etdiyi məzmunlu, əməli əhəmiyyətli maarif müəllimlərin şəxsi təhsilinin artması və iş fəaliyyətinin səmərəli, düzgün istiqamətləndirilməsi mühüm rol oynadı (2).

Beləliklə, Azərbaycan pedaqoji jurnalları ölkəmizdə tərbiyə nəzəriyyəsinin formalaşmağa başladığı ilk dövrlərdə onun inkişaf və təkmilləşdirilməsinə təsir edən ən güclü amillərdən biri kimi çıxış edir, məktəblərdə təlim-tərbiyə işlərinin düzgün istiqamətləndirilməsinə yardımçı olurdu. Təsadüfi deyildir ki, Azərbaycan pedaqoqları təlim-tərbiyə nəzəriyyəsinə dair tədqiqlərində 20-30-cu illərin pedaqoji jurnallarına dönə-dönə müraciət etmişlər.

***Rəyçi: prof. M.Həsənov***

## İstifadə edilmiş ədəbiyyat

1. “Yeni məktəb” jurnalı, 1924-1930-cu illər.
2. “Müəllimə kömək” jurnalı, 1930-1941-ci illər.
3. Ağayev Ə. Fərhad Ağazadənin pedaqoji görüşləri və fəaliyyəti. Pedaqoji elmlər namizədi alimlik dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiya. Bakı: DPİ.
4. Muradxanov M. Tərbiyə prinsiplərinin təsnifatında fikir ayrılıqları. //Azərbaycan məktəbi, 1978, №11.
5. Seyidov Ə. Azərbaycan pedaqoji fikir tarixindən səhifələr. Bakı: Çaşıoğlu, 2002.
6. Rüstəmov F. Azərbaycan pedaqogikaşünaslığı, Bakı: Elm və təhsil, 2016, 888 səh.
7. Həsənov M. Azərbaycan pedaqoji jurnallarında təlim-tərbiyə məsələləri (1920-1931), pedaqoji elmlər namizədi alimlik dərəcəsi almaq üçün dissertasiya. Bakı, 1975.
8. Həsənov M. Azərbaycanda sovet məktəbi və pedaqoji elmin inkişafı. // Azərbaycan məktəbi, 1987, №7.

**Э.Маммедова**

**Вопросы воспитания в нашем педагогическом журнале (1920-1930 г.г)**

**Резюме**

В статье рассказывается о вопросах воспитания, которые были рассмотрены на страницах первых азербайджанских педагогических журналов. В последствии были анализированы статьи о воспитании, которые печатались в таких азербайджанских журналах как: «Халг маарифи», «Халг муаллими», «Ени мектеб», «Маариф ишчиси», «Муаллима комек». Также в данной статье отмечено влияния вышеперечисленных событий на формирование педагогической мысли в Азербайджане.

**E.Mammedova**

**The issues of education in our pedagogical journal (1920-1930)**

**Summary**

The article describes the issues of upbringing, which were considered in the pages of the first Azerbaijani pedagogical journals. Later, the articles on education were analyzed, which were printed in such Azerbaijani magazines as "Khalg maarifi", "Khalg muallimi", "Yeni mekteb", "Maarif ishchisi", "Muallima komek". Also in this article, the influence of the above events on the formation of pedagogical thought in Azerbaijan is noted.



# ÜMUMTƏHSİL MƏKTƏBİNİN İDARƏOLUNMASININ TƏKMİLLƏŞDİRİLMƏSİ

**Akif Xalıqov,**
***Lənkəran şəhəri, S.Kazımbəyov adına 6 nömrəli tam orta məktəbin direktoru, pedaqogika üzrə fəlsəfə doktoru, Əməkdar müəllim***

Məqalədə Azərbaycan təhsilinin məzmunca yenilənməsi, ümumi təhsilin idarə edilməsinin beynəlxalq təcrübə əsasında təkmilləşdirilməsi istiqamətləri, şəffaf idarəetmə modelinin yaradılması, milli zəmində təhsil sahəsində böyük idarəetmə məsuliyyətinin fəaliyyətə görə bölüşdürülməsi, müəllim fəaliyyətinin dəyərləndirilməsi imkanları, təhsilin və təlimin keyfiyyətinin yüksəldilməsi yolları oz əksini tapmışdır.

***Açar sözlər:*** *dəyərləndirmə, keyfiyyət, idarəetmə, model, rejim, öyrənən, modernləşmə, strategiya.*

***Ключевые слова:*** *оценка, качество, управление, модель, режим, обучения, модерации, стратегии.*

***Key words:*** *evaluation, quality, management, model, regime, learning, moderation, strategy.*

Azərbaycan təhsili bu gündən sabaha məzmunca yeniləşir və müasirləşir. Son illərdə qazanılan nailiyyətlər aparılan ardıcıl və davamlı islahatlar təhsil siyasətinin nəticəsi kimi qiymətləndirilməlidir. Ulu öndərimiz Heydər Əliyevin "Təhsil millətin gələcəyidir" müddəası ilə özülü qoyulmuş milli təhsil siyasəti uğurla davam etdirilir.

Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasının həyata keçirilməsi ilə bağlı Fəaliyyət planında strateji hədəf olaraq, ümumi təhsilin idarə edilməsinin beynəlxalq təcrübə əsasında təkmilləşdirilməsi, təhsil müəssisələrində nəticəyönlü və şəffaf idarəetmə modelinin yaradılması, təhsilin keyfiyyətinin təminatı üzrə yeni sistemin yaradılması nəzərdə tutulmuşdur. Təhsildə demokratik idarəetmə qeyri-xətti proses olub, ümumi prinsiplər əsasında idarə olunaraq sistemli xarakter daşıyır. Milli zəmində bu məsələni daha zəngin etmək üçün Heydər Əliyev, Mustafa Kamal Atatürk, Nizami Gəncəvi, Nəsirəddin Tusi və digər tarixi şəxsiyyətlərin müdrik fikirlərinə istinad edilərək, idarəçilikdə, kollektivçilikdə, kollegiallıq məsələlərində insanlar bir-birinə kömək etdikdə, məsləhətləşdikdə idarəçiliyin daha səmərəli olmasını qeyd edirlər. A.Bakıxanov təhsildə özünüidarəyə üstünlük verirdi. Onun fikrinə görə cəmiyyət siniflərdən deyil, fərdlərdən ibarətdir. Tam hissəsiz ola bilmədiyi kimi, hissə də tamsız mövcud ola bilməz. Onlar bir-biri üçün olduqca əhəmiyyətlidir. Ona görə də A.Bakıxanov təhsilin kollegial idarə olunmasına üstünlük verirdi. Ümumtəhsil

məktəbinin qarşısında duran vəzifələrin uğurla həyata keçirilməsi məktəbin idarəolunması ona rəhbərlik edilməsi səviyyəsindən əhəmiyyətli dərəcədə asılıdır. Yeni strategiyanı reallaşdırmaq, uğurlu məktəb modelini tətbiq etmək üçün, ilk növbədə, normal mühit yaratmaq lazımdır. Bunun üçün müəllimlərin alternativ qərarlarını dinləməyə, şagirdlərin uğurlarını, işə bağlılıq yaradan amillərdən biri kimi məsuliyyəti müəllim və şagirdlər arasında bölüşdürməklə, yeni məktəb modelinin tərkib hissəsi olan məktəbin idarə edilməsində iki istiqamətin:

- təlim-tərbiyə prosesinin təşkili və idarə olunmasının;

- tədris-maddi bazanın maliyyə təsərrüfat fəaliyyətinə diqqətin artırılmasının xüsusi əhəmiyyəti vardır;

Məktəbi idarəetmə fəaliyyətinin metodoloji əsasını 1) Azərbaycan dövlətinin qanunvericiliyi 2) ölkəmizdə məktəbə rəhbərlik və onun idarəolunması təcrübəsi 3) pedaqoji elmin tarixi irsi təşkil edir. Məktəbə rəhbərlik sosial xarakter daşıdığından, cəmiyyətin və dövlətin irəli sürdüyü məsələlərin kompleks həllində beynəlxalq təcrübənin nəzərə alınması vacib şərtlərdən hesab edilir. İdarəetmə işi bir neçə mərhələdən ibarətdir. Bu gün məktəbin vəzifəsi dəyişib. Artıq biz cəmiyyətin sifariş etdiyi şagirdi hazırlayırıq. Səriştəli məktəb direktoru isə məktəbi dəyişməklə cəmiyyətə təsir göstərə bilir. Hər bir inzibati ərazidə yerləşən məktəbin öz tələbləri var. Uğurlu məktəb modelini şərtləndirən amillərdən biri də təhsil müəssisəsində işin səmimiyyət üzərində qurulmasıdır. Ona görə də idarəetmənin modernləşdirilməsi, təhsilin keyfiyyətinin müəyyənləşdirilməsi məqsədi ilə məktəbdə qiymətləndirmə anketləri əsasında pedaqoji personalın fəaliyyəti obyektiv qiymətləndirilir. Müzakirə zamanı real nəticələrə uyğun kollektivin hər bir üzvü öz reytinqini müəyyən etməklə dəyəndirilir. Nəticədə, dəyərləndirmə bir komponent kimi nəzərə alınır. İdarəetmənin prinsiplərindən biri də planlaşdırma və nəzarətdir. Planlaşdırma idarəetmənin mərkəzi həlqəsi olmaqla şagirdlərin təlim-tərbiyəsinin daha da yaxşılaşdırılması və sistemləşdirilməsi zamanı həyata keçirilir. İdarəetmənin təkmilləşdirilməsi qarşıya qoyulmuş vəzifələrin nəzərdə tutulmuş müddətdə yüksək keyfiyyətlə yerinə yetirilməsi kadr təminatından çox asılıdır. Ona görə də idarəetmədə təkmilləşmə birinci növbədə kadr potensialına görə aparılmalıdır. Məktəbin fəaliyyətində

- kadrla təminatında səriştəli, işgüzar, stabil müəllim kollektivi olmalıdır. Eyni zamanda hər bir müəllimin ixtisasartırma kurslarına göndərilməsi, attestasiyadan keçməsi, DQ-nın aparılması, qabaqcıl iş təcrübə-sinin öyrənilməsi müxtəlif layihələrdə iştirakının təmin olunması;

- məktəbin maddi-texniki bazası möhkəmləndirilməli, müasir təlim avadanlığının, texniki xidmətin, informasiya və kommunikasiya texnologiyalarının, məktəb saytının, müxtəlif beynəlxalq layihələrə çıxışın təmin olunması;

- idarəetmənin demokratikləşdirilməsində idarəetmə fəaliyyətinin qiymətləndirilməsində valideyn, müəllim və şagirdlərin fəal iştirak etməsi;

- ümumtəhsil müəssisəsində idarəetmənin fəaliyyətinin stimullaşdırılması; Bu mexanizm ümumtəhsil müəssisəsi tərəfindən hər iki ildən bir kollektivin və hər bir üzvünün fəaliyyətinin dəyərləndirilməsi üçün kollegial orqanlardan ibarət yaradılmış

komissiya tərəfindən həyata keçirilir və qiymətləndirmə ilə nəticələnir. Keyfiyyətin göstəricisi kimi dəyərləndirmə prosesi kollektivin stimullaşdırılmasında geniş imkanlara malikdir. Bu vəzifələrin yerinə yetirilməsinin yollarından biri məktəbdaxili nəzarətin səmərəli təşkilidir. Fəaliyyətin dəyərləndirilməsi müvafiq meyarlara uyğun şəkildə aparılır. İllik və yarımillik üzrə hər bir müəllimin fəaliyyətinin dəyərləndirilməsi ilə həyata keçirilir. Dəyərləndirmə prosesi üç mərhələdən ibarət olur və hər mərhələ ballarla qiymətləndirilir. Qiymətləndirmə tapşırıqları məktəbin tədris, tərbiyə və ictimai həyatını əks etdirir. Ümumi balları cədvəl əsasında qiymətə çevirməklə, qiymətləndirmə şkalası vasitəsi ilə 2,3,4,5 rəqəmlərlə aparılır. Həmin qiymətə və bala uyğun meyarlar müəyyənləşdirilir. Nəticənin tələblərə cavab verib-verməməsi, qəbuledilməz dərəcədə yerinə yetirilməsi və tövsiyələr verilməsi qərarı müəllimin imzası ilə təsdiq edilir. 451-500 əla nəticə və 351-450- gözlənildiyindən yaxşı nəticə -5, 251-350-tələblərə cavab verir -4,151-250 tələblərə cavab vermir -3,0-150 işini qəbuledilməz dərəcədə yerinə yetirir -2, 251-dən az bal toplayanlara tövsiyələr verilir.

Müasir dövr yüksək ixtisaslı elmi-nəzəri və metodik cəhətdən yetkin və səriştəli müəllim kadrları tələb edir. Belə kadrlar olmasa, məktəbin fəaliyyətini pedaqoji cəhətdən məqsədəuyğun şəkildə təşkil etmək təlim-tərbiyənin keyfiyyətini günün tələbləri səviyyəsinə qaldırmaq mümkün deyil. Təhsil Nazirliyi bunu nəzərə alır, müəllimlərin diaqnostik qiymətləndirilməsi də bu məqsədə xidmət edir. Müəllimlərin elmi-nəzəri və praktik səviyyəsinin yüksəldilməsinə kömək edən amillərdən biri də məktəbdə müəllimlərlə aparılan metodik işlərin səmərəli təşkilidir. Məktəbdə müəllimlərlə aparılan metodik işin məzmunu İKT-nin imkanlarından, internet resurslarını tədris prosesinə tətbiqi bacarıqlarından, treninq və kurslarda fəal iştirakından, məruzə, çıxış və məqalələrin yazılmasından, metodik ustalığının artırılmasından, sinif müəllimlərin, sinif rəhbərlərinin, fənn komissiyaları və metodbirləşmə rəhbərlərin açıq dərslərdə qabaqcıl iş təcrübəsinin öyrənilib ümumiləşdirilməsindən, dərslik, metodik vəsaitlərin müzakirəsində müəllimlərin fəaliyyətini əks etdirən sərgilərin keçirilməsindən və müxtəlif xarakterli işlərdə onların iştirakının təmin olunmasından ibarətdir. Məktəbdə metodik işin təşkilində fənn komissiyalarında idarəetmə məsuliyyətinin fəaliyyətə görə bölüşdürülməsi əhəmiyyətli nəticə verir. Məktəbimizdə idarəetmə işinin səmərəli təşkili məqsədi ilə ayrı-ayrı fənn metodbirləşmədən ibarət metodkomissiyalar yaradılmış, onların fəaliyyət istiqamətləri müəyyənləşdirilmişdir. İdarəetmə işində sinif rəhbərləri ilə yanaşı valideynlər və sinif şagirdlərindən ibarət idarəetmə şurası yaradılmış, onların fəaliyyət funksiyaları bölüşdürülmüşdür. Ötən müddətdə idarəetmədə məsuliyyətin bölüşdürülməsi sferasında standartlara müvafiq öyrənənlərin keyfiyyətə görə səviyyəsinin müəyyənləşdirilməsi öz müsbət nəticəsini vermişdir. Məktəbimizin təcrübəsinə əsaslanıb demək

olar ki, üç texnologiya: məqsədə görə idarəetmə, prosesə görə idarəetmə və nəticəyə görə idarəetmə təhsilin keyfiyyətinin yüksəldilməsinə səbəb olur. Bu zaman ona diqqət yetirmək lazımdır ki, müəllim səviyyəsində təhsilin keyfiyyətinin yüksəldilməsi, yəni öyrənənin tələb etdiyi səviyyədə biliklər, bacarıqlar və müvafiq keyfiyyətlər təmin edilsin. Öyrənən səviyyədə təhsilin keyfiyyəti isə təhsilin məzmununun fəaliyyət üsullarının və s. mənimsəmə dərəcəsinə görə başa düşülməsi deməkdir.

Təhsildə keyfiyyətin cəmiyyətin tələbatına hansı səviyyədə uyğunluğunu və taksonomiya ilə bağlılığını yəni idarəetmənin məqsədinə görə onun fəaliyyət növünün müəyyənləşdirilməsini və təlimin məqsədindən asılı olmasını müəyyənləşdirmək üçün ümumtəhsil müəssisələrini fəaliyyət rejimi ilə işləyən məktəblərə və inkişaf rejimi işləyən məktəblərə ayırmaq lazımdır. Təklif olunmuş modelə görə məktəbin fəaliyyət indikatorları hansı sahədə yüksəkdə durursa, o, fəaliyyət rejimli məktəblərdən hesab edilir.

Bu gün inkişaf rejimi ilə işləyən məktəblər üstünlük təşkil edir.Təkcə məktəbin effektiv idarə edilməsi yox həm də inkişaf dinamikasının təmin edilməsi, müəllimin fəaliyyətinin dəyərləndirilməsi, təhsilin və təlimin məzmununun idarə edilməsi keyfiyyətin yüksəldilməsinə xidmət edir. Bu xidmət, əsasən, üç istiqamət üzrə aparılır: 1. Nəticələrin keyfiyyəti; 2. Şəraitin keyfiyyəti; 3. Prossesin keyfiyyəti.

Nəticələrin keyfiyyəti qarşıda qoyulan hədəfə çatmaq ölçüsüdür və hər bir təhsil müəssisəsi üçün keyfiyyət indikatorları vasitəsi ilə müəyyən edilir.

Öyrədənlər və öyrənənlər üçün nəticələrin keyfiyyət indikatorları müəllim və məzun modelində 2012-ci il üçün məktəbimizin timsalında aşağıdakı şəkildə təqdim olunur. Həmin il ali məktəblərə sənəd verənlər 10 nəfər, qəbul olunan 3 nəfər, 500 bal toplayan yoxdur. Lakin 2016-2017-ci il tədris ilində həmin modeldə 11 nəfər məzundan 10 nəfəri müsabiqədən keçmiş, 4 nəfər 600 baldan yuxarı bal toplamış, bir nəfər qızıl medal almış bir nəfər olimpiadanın respublika turunda medala layiq görülmüşdür.

İdarəetmənin yeni strukturda təqdim olunması, keyfiyyətin səmərəli idarə olunması ilə bağlıdır. Öyrədən üçün şəraitin keyfiyyəti daxili motivasiyanın, stimullaşdırma üsullarının və metodiki işlərin düzgün təşkili ilə təyin olunur. Öyrənən üçün şəraitin keyfiyyəti isə əlverişli təhsil mühitinin, motivasiyanın, sosial qayğının olması ilə bağlıdır. Ona görə də keyfiyyət fəaliyyətin xarakteristikasıdır. Fəaliyyət-cəmiyyətin inkişaf etməsi naminə ümumi təhsil pilləsi üzrə idarəetmənin təkmilləşdirilməsi üçün strateji hədəf olaraq seçilmişdir. Bu baxımdan beynəlxalq təcrübə idarəetmənin modernləşdirilməsində aparıcı variantlardan hesab olunur. Təhsilin dövlət sektorunun idarə edilməsinin beynəlxalq təcrübə əsasında təkmilləşdirilməsi və təhsil müəssisələrində şəffaf idarəetmə modelinin yaradılmasında yeni idarəetmə mexanizminin təqdim olunmasında aşağıdakı amillərin nəzərə alınması önəmli olardı.

- müsabiqə əsasında ehtiyaca görə müvafiq mövzular əsasında təlimlərin

təşkili;

- yekun qiymtələndirmə əsasında müəllimlərin imkanlarının müəyyənləşdirilməsi;
- müsahibə əsasında müəllim və rəhbər vəzifələrə namizədlərin müəyyənləşdirilməsi;
- təhsil müəssisələrinin əməkdaşlıq etdiyi məktəblərin müəyyənləşdirilməsi, nəticələ-rin müqayisəli təhlilinin təqdim edilməsi və ümumi təhsil müəssisələri üzrə layihələrin genişləndirilməsi;

Ümumtəhsil müəssisələrinin idarə olunmasının səmərəli üsullarından biri də odur ki, məktəb rəhbəri pedaqoji prosesi daim nəzarətdə saxlamalıdır. O, müvəffəqiyyət göstəricilərini izləməli, müasir yanaşma və qərarların səmərəliliyini müəyyənləşdirməli, dövlətin təhsil siyasətini gerçəkləşdirməyə nail olmalıdır.

***Rəyçi: dos. İ.Cavadov***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi, 2013, №5.
2. Mehdizadə M. Ümumitəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi. Bakı: Maarif, 1982, səh. 382.
3. Mehrabov A. Təhsildə səriştəli yanaşma: mahiyyəti və məzmunu. // Azərbaycan məktəbi, 2007, № 1.
4. Mehrabov A., Quliyeva S. Ümumitəhsilin keyfiyyəti və onun idarəolunmasında qiymətləndirilmənin rolu. // Azərbaycan məktəbi, 2004, № 1.
5. Mehrabov A. Müasir Təhsilin konseptual problemləri. Bakı: Mütərcim, 2010, səh. 261-269.
6. Cavadov İ. Təhsilin keyfiyyət təminatında monitorinq və qiymətləndirmənin rolu. // Azərbaycan məktəbi, Bakı, 2005, № 1, səh.15-21.
7. Məmmədzadə R. İdarəetmə mədəniyyəti. Bakı: Təfəkkür, 1999, səh. 116.

**А.Халыгов**

**Усовершенствование управления общеобразовательной школы**

**Резюме**

В статье основное внимание уделяется обновлению содержания азербайджанского образования, совершенствованию управления общим образованием на основе международного опыта и созданию прозрачной модели управления. Также здесь отражены распределение обязанностей старшего руководства на национальном уровне в области образования, возможности оценки эффективности учителей, пути повышения качества образования и обучения.

**A.Khalykov**

**Improvement of the management of the general education school**

**Summary**

The article focuses on updating the content of Azerbaijani education, improving the management of general education based on international experience and creating a transparent governance model. It also reflects the distribution of responsibilities of senior management at the national level in the field of education, the possibility of assessing the effectiveness of teachers, ways to improve the quality of education and training.



# KOMPETENSİYALARA ƏSASLANAN MODUL TEXNOLOGİYALARI ƏSASINDA TƏDRİS ZAMANI NƏZƏRİYYƏ İLƏ PRAKTİKANIN İNTEQRASİYASI

**Malik Qurbanov,**
***Azərbaycan Respublikasının Təhsil İnstitunun peşə təhsili şöbəsinin baş mütəxəssisi***

Məqalə peşə təhsili müəssisələrində kompetensiyalara əsaslanan modul texnologiyaları əsasında tədris aparılarkən nəzəri biliklərlə praktik işin inteqrasiya olunmuş şəkildə tədrisi məsələlərinə həsr edilmişdir. Məqalədə Modulun lahiyələndirilməsi zamanı nəzərdə tutulmuş ümumi vaxtın nəzəri və praktiki hissələr arasında bölünməsi, ümumi peşə bölməsindəki fənlərin inteqrasiya olunaraq təlim məqsədlərinə uyğunlaşdırılmış şəkildə tədrisi və s. bu kimi məsələlər də öz əksini tapır.

***Açar sözlər:*** *kompetensiya, modul, modul texnologiyaları, nəzəri material, praktik iş.*

***Ключевые слова:*** *компетенция, модуль, модульные технологии, теоретические материалы, практическая работа.*

***Key words:*** *competence, module, module technologies, theoretical material, practical work.*

Kompetensiyalara əsaslanan modul texnologiyaları (KƏMT) əsasında aparılan tədris prosesinin fənyönümlü ənənəvi metodikadan başlıca fərqi nəzəriyyə ilə praktikanın vəhdətidir. Odur ki, KƏMT əsasında tədrisi həyata keçirmək üçün, ilk növbədə. planlaşdırılası məsələlərdən biri də nəzəri biliklərə praktik işin vaxt (zaman) etibarı ilə nisbətinin təyinidir.

Öyrənən hər hansı praktik bacarığı əldə etmək üçün mütləq şəkildə bəzi nəzəri (akademik) biliklərə sahib olmalıdır. Amma nəzəri biliklər kifayət qədər çox olduğundan onların hamısının dərs zamanı öyrədilməsi heç də məqsədəuyğun deyil. Odur ki, akademik biliklərin çox cüzi və həm də olduqca vacib hissələri öyrədən tərəfindən seçilməli və təlim prosesi zamanı çox yığcam şəkildə şərh edilməlidir. Yerdə qalan daha geniş hissə akademik biliklər isə fərdi şəkildə (müstəqil) öyrənmək üçün öyrənənə əlavə oxu materialı kimi ev tapşırığı formasında verilməlidir. Bura dərslik, elektron dərslik, yaxud internet materiallarının adlarını və onların əldə ediləcəyi ünvanları da əlavə etmək olar.

Tədris ediləcək nəzəri materiallar hansı elmi əsaslarla seçilməli və praktiki işlə necə inteqrasiya olunmalıdır? Nəzəri materialların tədrisinə ayrılan vaxtın cəmi dərs saatına nisbəti necə olmalıdır?

Modulu tərtib edən, həmçinin tədrisi aparan şəxsin bu sahənin bilicisi olması nəzəri və praktik materialların seçilməsi zamanı vacib şərt kimi ortaya çıxır. Məhz mütəxəssis bilir ki, modulda nəzərdə tutulmuş tədris məqsədinə çatmaq üçün öyrənən, ilk növbədə, hansı nəzəri biliklərə sahib olmalıdır. Məsələni bir nümunə üzərində araşdıraq:

"Çilingər" peşəsinin mövcud peşə standartında yazılıb:

"Çilingər çertyoj əsasında təbəqə dəmir, standart profil, pəstah, yaxud sintetik materiallar üzərində nişanlama əməliyyatını apara bilir". Təhsil müəssisəsi "030620. Hərəkət tərkibinin təmiri çilingəri" ixtisası üzrə kadr hazırlamalı, həmçinin hazırlanacaq kadrlarda təlim nəticəsi olaraq yuxarıda qeyd olunan kompetensiyalar aşılanmalıdır.

Bu məqsədlə birinci növbədə peşə standartı əsasında təhsil standartı hazırlanmalı və orada peşə standartındakı kompetensiyaların aşılanması üçün təhsilalana nəzərdə tutulmuş vaxt ərzində öyrədiləcək bilik, bacarıq və vərdişlərin təlim nəticələrinə (hər bir modulun məqsədinə) görə sadədən mürəkkəbə doğru elmi ardıcıllığı olmalıdır. Peşənin standartı bir və ya bir neçə modulda təlim standartına çevrilə bilər. Odur ki, modulların sayı peşənin mürəkkəbliyinə görə artır. Əsas məsələ modulların sayı yox, hər bir modul üzrə alınacaq təlim nəticəsidir. Odur ki, peşənin modulları hazırlanarkən aşağıdakı baza prinsipləri gözlənilməlidir:

- Mürəkkəbliyindən asılı olaraq peşə bir və ya bir neçə modula bölünə bilər, yəni peşə standartında nəzərdə tutulmuş kompetensiyalar öyrənənə bir və ya bir neçə modulda aşılana bilər.
- Hər bir modul üzrə təlim nəticəsi elə formalaşdırılmalıdır ki, tədrisin sonunda onu müvəffəqiyyətlə bitirən şəxsə konkret bilik və bacarıqlar üçün sertifikat verilə bilsin. Təhsil alan isə həyatda aldığı kompetensiyalara müvafiq iş tapa bilsin.
- Modulların hamısını müvəffəqiyyətlə bitirən şəxs peşə standartında nəzərdə tutulmuş bütün kompetensiyalara malik olur və ona peşə (ixtisas) üzrə diplom verilir.

Məhz bu cəhətdən yanaşmaqla hər bir modul üçün konkret tədris vaxtı müəyyən edilir. Nəzərdə tutulmuş tədris vaxtı iki hissəyə bölünür:

1. Nəzəri bilikərin öyrədilməsinə sərf olunacaq vaxt
2. Kompetensiyaların aşılanmasına (praktik işə) sərf olunacaq vaxt

Peşə standartında nəzərdə tutulmuş kompetensiyaların aşılanması üçün hazırlanmış təhsil standartı əsasında tərtib edilən modulda təlim məqsədinə çatmaq üçün lazım olan cəmi vaxt (dərs saatı) nəzəri dərs və praktik məşğələ kimi iki yerə bölünməklə inteqrasiya olunmuş şəkildə - yəni eyni zamanda kompetensiyaların aşılanmasına sərf edilir. KƏMT əsasında tədris proqramları (kurikulumlar) hazırlanarkən birinci növbədə görüləsi iş hər bir modulun tədrisi üçün lazım gələn cəmi saatların miqdarının müəyyənləşdirilməsidir.

Bu mənada ardıcıllıqdakı ikinci vacib məsələ nəzəri materialların seçilməsi və onların tədrisi üçün ayırılacaq vaxtın təyinidir. Cəmi saatlarla nəzəri saatların fərqi kompetensiyaların praktiki olaraq aşılanmasına qalacaq vaxtdır.

Nəzəri materiallar necə seçilməlidir? "Çilingər" peşəsi üzrə modulları planlaşdıran mühəndis-pedaqoq nəzəriyyə ilə praktikaya ayrılacaq vaxtın nisbətini necə təyin etməlidir? İlk növbədə moduldakı təlim məqsədinə çatmaq üçün vacib (zəruri) olan elmi biliklər və onların aid olduqları elm sahələri müəyyənləşdirilməlidir. "030620. Elektrik qatarı (metropoliten)" ixtisas qrupuna daxil olan "Hərəkət tərkibinin təmiri çilingəri" ixtisası üzrə "A.Çilingərlik işlərinin təyinatı" moduluna daxil olan "Nişanlama əməliyyatının çertyoj əsasında aparılması" mövzusu əsasında nəzəri materialların seçilməsi ardıcıllığını şərh edək.

Mühəndis-pedaqoq ali təhsil pilləsində aldığı elmi biliklərə əsaslanaraq bu qərara gəlir ki, mövzu üzrə təlim nəticəsinə nail olmaq üçün şagird (öyrənən), ilk növbədə, çertyoju oxumağı bacarmalı və uzunluq ölçü vahidlərini bilməlidir. Odur ki, ümumtəhsil

orta məktəblərində tədris olunan “Rəsmxətt” dərsliyindəki “Çertyojun oxunması” bölümü öyrənənə yığcam şəkildə xatırladılmalıdır. Çertyoj çəkilən zaman öncə miqyas seçilir və ölçülər əksər hallarda milli metr (mm) ölçü vahidi ilə verilir. Bu fürsətdən istifadə etməklə müəllim uzunluq ölçü vahidlərini qısaca olaraq təkrarlamalı və maşınqayırma çertyojlarında ölçülərin milli metr (mm) ilə verilmə səbəbini izah etməlidir.

Ənənəvi tədrisdə əksər ixtisaslar üzrə “Materialşünaslıq” adı altında tədris olunan ixtisas fənnində kifayət qədər akademik biliklər - dəmir-karbon ərintiləri, o cümlədən polad və onun növləri, karbonun miqdarından asılı olaraq kövrəkliyin artması və möhkəmliyin azalması, dəmir-karbon ərintilərinin fiziki-kimyəvi və mexaniki xassələri, materialın elektrik cərəyanını və istiliyi pis, yaxud yaxşı keçirməsi, yumşaq, yaxud bərk olması, əyilməsi, burulması və s. bu kimi spesifik akademik biliklər verilir. Bunların hamısını dərs zamanı şagirdə öyrətmək mümkün deyil və buna heç ehtiyac da yoxdur. Belə olan halda nişanlama əməliyyatını aparan öyrənənə bu qədər akademik biliklərdən hansıları verilməlidir? Nəzəri materiallar kifayət qədər çoxdur, deməli onların şərhi üçün də kifayət qədər vaxt lazımdır. Amma nə qədər? Tam orta təhsil bazasından qəbul olunmuş və təhsil müddəti bir il olan qruplarda hər həftə 35 saat dərsin keçildiyini və bir tədris ilinin 38 həftə olduğunu nəzərə alsaq, il ərzində tədris keçiriləcək cəmi dərs saatların miqdarının 38 x 35=1330 saat olduğunu hesablaya bilərik. İxtisasın mövcud tədris planının “Peşə hazırlığı” bölməsinin 3.1. Ümumi texniki fənlər bölməsində “Texniki rəsmxətt” fənninə 20 saat, “Elektrotexnika”ya 15 saat, “Bazar iqtisadiyyatı və sahibkarlığın əsasları”na 30 saat və 3.2 Ümumi peşə bölməsi üzrə “Materialşünaslıq” fənninə 25 saat, “Əməyin mühafizəsi və təhlükəsizlik texnikası”na isə 15 saat vaxt verilib. Bu bölmə üzrə cəmi saatların miqdarı 105 saatdır. 3.3.1. Baza kursu üzrə olan cəmi saatların miqdarı isə 185 saatdır ki, onun da 140 saatı istehsalat təlimidir. Bu iki bölmə üzrə saatların cəmi miqdarı 290 saatdır. Deməli, təhsil standartındakı təlim nəticələrinə müvafiq modul tərtib olunarkən ona ayrılacaq cəmi saatların miqdarı 290 saat olmalıdır. Planlaşdırmaya da bu rəqəmə istinad etməklə başlamaq lazımdır. Yəni cəmi 1330 saatdan bu modula ayırılacaq vaxt 290 saat olmalıdır. Aparılmış təcrübələr əsasında bu qənaətə gəlmək olur ki, nəzəri (akademik) materialın qısaca (yığcam) elmi izahı üçün lazım gələn vaxt praktik iş (vərdişlər) üçün tələb olunandan 2-3, bəzən də 4-5 dəfə azdır. Bu rakusdan yanaşmaqla orta rəqəm götürmək olar ki praktik iş üçün nəzərdə tutulan vaxt nəzəri materiallara nisbətən ən azı üç dəfə çox olmalıdır.

Mövzunun spesifik xüsusiyyətlərini, həmçinin biliklərin sadədən mürəkkəbə doğru inkişafını nəzərə almaqla bu nisbəti artırmaq, yaxud azaltmaq olar, bir şərtlə ki, bu dəyişiklik təlim nəticələrinə xidmət etmiş olsun.

KƏMT-nin mahiyyəti fənn yönümlü tədrisdən uzaqlaşmaq, fənləri ayrı-ayrı akademik biliklər şəklində deyil, inteqrasiya olunmuş şəkildə tədris etmək olduğundan 3-cü bölmə üzrə tədrisi nəzərdə tutulmuş və adları yuxarıda sadalanmış fənlərin hamısı bir və ya bir neçə modulda birləşdirilərək inteqrasiya olunmuş şəkildə tədris olunmalıdır. Nəzərdə tutulmuş pedaqoji prosesi ayrı-ayrı fənn müəllimləri yox, bir mühəndis-pedaqoq və bir usta həyata keçirtməlidir.

Ənənəvi tədris metodikasının tərəfdarları iddia edə bilərlər ki, sadalanan beş fənni eyni vaxtda mühəndis-pedaqoqla bir usta tədris edə bilməz! Əslində isə bu çox sadə və real məsələdir. Burda müəllimin

(öyrədənin) şəxsi bilik və bacarıqları xüsusi önəm daşıyır ki, bu da ayrıca şərh olunası bir məsələdir.

Peşə təhsili pilləsindəki mövcud tədris proqramlarının böyük əksəriyyətində bu fənn yalnış olaraq "Çertyojun oxunması" kimi verilir. "Çertyojun oxunması" müstəqil fənn deyil, bu "Rəsmxətt" fənninin sonuncu və həm də ümumiləşdirici bölməsidir. Məhz bu bölmə praktik işlərdə daha çox tətbiq olunur. Müxtəlif qalınlıqda bütöv, yaxud qırıq-qırıq xətlər və üzərində rəqəmlərlə işarə olunmuş ölçülərdən savayı heç nəyi ehtiva etməyən çertyoj özündə adi həndəsi fiqurun xarakteristikası qədər sadə olan informasiyadan tutmuş kosmik raketin quruluşu kimi mürəkkəb məsələlərədək hər şeyi özündə əks etdirir. Çertyojda söz və yaxud elmi şərh yoxdur. Amma mühəndis onu "oxuyur", elə buna görə bölməyə "Çertyojun oxunması" deyirlər.

Peşə təhsili pilləsində 30 saat ərzində tədris olunan "Rəsmxətt" fənni şagirddə çox sadə və elementar bilikləri aşıladığına görə fənnin proqramında verilmiş materialları hər bir mühəndis bilir. Onu ayrıca fənn kimi tədris etməyə ehtiyac yoxdur, əksinə, onun inteqrasiya olunmuş halda digər fənlərlə birlikdə tədrisi daha yüksək effekt verir. Tədris ediləcək "Nişanlama əməliyyatının çertyoj əsasında aparılması" mövzusunda bu fikir yerinə düşür. Çertyojda sadə bir detalın ölçüləri, yəni eni, uzunluğu, hündürlüyü, deşiklərin diametri və s. verilir.

Çertyojda kənarları ox işarəsi ilə məhdudlaşıb üstündə rəqəm yazılmış xətlərin qalınlığı digər xətlərin qalınlığından fərqlidir. Çertyojda qırıq-qırıq çəkilmiş xətlər də var. Dairəvi yerlərdə ölçü xətlərinin üstündə Φ işarəsi də qoyulub. Mühəndis-pedaqoq 15-20 dəqiqə müddətində ölçüləri və ölçü xətlərini şərh edə bilər. Axı sadə detalların proyeksiyalarında onların sayı çox azdır. Dörd-beş ölçü xəttini nümunə üçün verilmiş çertyoj əsasında şərh etmək mühəndis üçün çox sadə işdir.

Tədrisinə 30 saat ayrılmış "Bazar iqtisadiyyatı və sahibkarlığın əsasları" fənni də digər fənlərlə inteqrasiya olunmuş şəkildə tədris olunacaq. Peşə təhsili pilləsində öyrədilən iqtisadiyyat dünya iqtisadiyyatı deyil, öyrənənə elementar iqtisadi biliklər verilir: gəlir və xərclər, rentabellik, bazar münasibətləri, alıcı və satıcı, sahibkar olmaq üçün nələri bilməli və etməlisən və s.

Konkret olaraq tədris olunan mövzu əsasında bunu şərh edək. Qrupda 20 nəfər şagird təhsil alır. Nişanlama əməliyyatını öyrətmək üçün təhsil müəssisəsi tərəfindən alınmış list (tənəkə) dəmirin bir ədədinin qiyməti 10 manatdır. Eni 90, uzunluğu 1 metr 90 santimetr olan bir list (tənəkə) dəmir dörd bərabər yerə bölünərək şagirdlərə verilir. 20 nəfərlik bir qrup üçün 5 list dəmir almaq lazımdır. 20 nəfərdən 4-ü əməliyyatı düzgün aparmayıb. Müəllim onların səhflərini düzəldir, həmin material üzərində şagirdlər nişanlama əməliyyatını yenidən icra edirlər. Bəs istehsal sahəsində necə? Gün ərzində on manat ziyan verən işçini hansı sahibkar işdə saxlayar? Yaxud ziyanla işləyən sahibkar gəlir əldə edə bilərmi? Həmçinin bazara çıxarılan zay məhsulu kim alacaq? Rəqabətə dözmək üçün istehsal edilmiş malın keyfiyyəti yüksək, qiyməti isə ucuz olmalıdır. Belə olan halda peşə sahibi hansı iqtisadi biliklərə sahib olmalıdır?

Fikir verin, nişanlama əməliyyatı aparacaq şagirdlərə on beş-iyirmi dəqiqə müddətində bu istiqamətdə elə yığcam iqtisadi biliklər vermək olar ki, onlar, həqiqətən, öyrənənə bütün ömrü boyu gərəkli olsun! Bunun üçün ixtisasca iqtisadçı olmaq şərt deyil. Bunlar iqtisadiyyatın ən sadə məsələləridir və onları ali təhsilli hər bir şəxs bilir. Daha geniş elmi biliklərə sahib olmaq istəyənlər isə onlara verilmiş nəzəri materiallar paketindən iqtisadiyyata dair

daha çox akademik biliklər öyrənə bilərlər.

Öyrənən nişanlama əməliyyatını tənəkə dəmir materialı üzərində aparır. Tənəkə materialın tərkibi öncə məlum olmasa, öyrənənin təlim məqsədinə necə nail olacağı şübhəli qalar. Tənəkə materialı kövrək, yaxud elastiki, olduqca bərk, yaxud yumşaq ola bilər. İstiliyi, yaxud elektrik cərəyanını pis, yaxud yaxşı keçirdə bilər. Odur ki, öyrənən nəzərdə tutulmuş materialın fiziki-mexaniki xassələri haqqında ilkin biliklərə sahib olmalıdır. Bunun üçün ayrıca olaraq “Materialşünaslıq” fənnini keçməyə ehtiyac yoxdur. Deyilənləri izah etmək heç də çətin deyil və ali texniki təhsili olan hər kəs bunu bilir. Lakin bu biliklər tədris prosesi zamanı olduqca yığcam şəkildə verilməli, geniş biliklər isə mövcud ədəbiyyatdan seçilmiş materiallar və digər resurslar kimi paket materialları şəklində təhsilalana verilməlidir.

Növbəti addımda nişanlama əməliyyatının hansı alət və ləvazimatlardan istifadə etməklə həyata keçirilməsi şərh olunmalıdır. Nəzəri materiallara təhlü-kəsizlik texnikası elementləri də əlavə olunmalı və tədris fənlərin inteqrasiyası şəklində keçirilməlidir.

Müəllim aparılan səhv nişanlamanın materialın zay olması ilə nəticələnəcəyini izah etməlidir. Deməli, nişanlama əməliyyatı zamanı görülən keyfiyyətli iş son nəticədə məhsulun maya dəyərinə öz müsbət təsirini göstərir. Bu isə “Bazar iqtisadiyyatının əsasları” fənninə aid məsələdir. Deməli nəzəri materiallar paketinə “Maya dəyəri”nə aid elementar nəzəri (akademik) biliklər də daxil edilməlidir.

Beləliklə, altı fənnin inteqrasiya olunmuş halda tədrisi təkcə vaxtdan səmərəli istifadə deyil, eyni zamanda modulda nəzərdə tutulmuş kompetensiyaların aşılanmasıdır. Modulu tərtib edən şəxs (yaxud şəxslər, işçi qrupu) öyrədiləcək peşə sahəsinin mütəxəssisi (yaxud mütəxəssisləri) olduğundan vacib (mühüm) nəzəri materialları qabaqcadan planlaşdırır və yuxarıda təklif olunan, yaxud özünün önəmli hesab etdiyi nisbət əsasında alt modullar üzrə bölür.

Bütün bunlar öz həllini tapdıqdan sonra nəzəriyyə ilə praktikanın inteqrasiya olunmuş şəkildə tədrisindən danışmaq olar.

Yuxarıda qeyd olunduğu kimi KƏMT əsasında tədris zamanı nəzəriyyə (akademik biliklər) ilə praktika vəhdətdə tədris olunur. Ənənvi təhsildə akademik biliklər ayrıca (müstəqil) fənlər şəklində tədris edilir. Praktika isə nəzəri fənlər tədris edildikdən sonra qazanılmış biliklərin praktiki tətbiqi və dövlət imtahanı üçün sınaq işlərinin hazırlanması məqsədi ilə həyata keçirilir.

Modul üzrə təlim nəticəsinə çatmaq üçün nəzərdə tutlmuş vaxt yuxarıda şərh olunmuş qaydalara uyğun olaraq ≈1:3 nisbətində bölünür. Tədris prosesi zamanı mühəndis-pedaqoq məsələnin nəzəri hissəsini şərh edir, öyrənənə vacib akademik bilikləri mümkün olan bütün müasir üsullardan istifadə etməklə verir, hətta əlavə elmi biliklərin mövcud ədəbiyyat və ya internetdən necə əldə ediləcəyini də deyir. Usta isə şərh edilmiş nəzəri hissəyə müvafiq praktiki işi şagirdlərə (öyrənənlərə) nümayiş etdirməklə əvvəl özü icra edir, sonra isə öyrənənlərə istiqamət verir.

Qabaqcadan düşünülmüş (planlaşdırılmış) ardıcıllıqla həyata keçirilən iş konkret təlim nəticəsinin alınması ilə yekunlaşmalıdır. Modulda göstərilmiş şərti vaxt bölgüsü nisbidir. Məsələn, şərh etdiyimiz “A.Çilingərlik işlərinin təyinatı” modulundakı “Nişanlama əməliyyatının çertyoj əsasında aparılması” mövzusuna ayrılmış 6 saat vaxtın iki saatı nəzəri (akademik) biliklərə, 4 saatı isə praktik olaraq kompetensiyaların aşılanmasına sərf edilməlidir. Burda dəqiqələri saymağa ehtiyac yoxdur, nəzəriyyəyə, yaxud praktikaya beş-on dəqiqə vaxtın az, yaxud çox verilməsi

qəbahət deyil, ali məqsəd modul üzrə nəzərdə tutulmuş kompetensiyaların aşılanmasıdır.

Bunun necə həyata keçirilməsi təlim aparan mühəndis-pedaqoqla ustanın birgə fəaliyyətindən və pedaqoji ustalıqlarından asılıdır. Amma təklif edəcəyim çox sadə variant hamının qəbul etdiyi sadədən mürəkkəbə doğru inkişaf prinsipinə istinad etməklə aşağıdakı kimidir:

• Mövzuya giriş.

• Mövzunun aktuallığı (problemin qoyuluşu).

• Hər hansı detalın çertyojunun müəllim tərəfindən oxunması.

Bu məsələlər şərh olunduqdan sonra (10-15 dəqiqə) usta müdavimlərin hər birinə nişanlama əməliyyatı aparılacaq ayrı-ayrı detalların çertyojlarını verir. Hər bir öyrənən üç-beş dəqiqə ərzində təqdim edilmiş çertyojla tanış olur və detal haqqında ibtidai biliklər əldə edir (Motivasiya). Nəzəri hissəni tədris edən mühəndis-pedaqoq təlimin növbəti mərhələsinə keçir, yəni nümunə kimi istifadə etdiyi çertyoj əsasında seçilmiş konkret detalın ölçülərini şərh edir. Beş-on dəqiqə çəkən bu prosesdən sonra müəllim öyrənənlərə onlara verilmiş çertyojlardakı ölçüləri araşdırmağı tapşırır.

Nəzəri hissənin bu bölümü başa çatdıqdan sonra usta mühəndis-pedaqoqun təklif etdiyi ardıcıllıqla tənəkə dəmir üzərində nişanlama əməliyyatını həyata keçirir. Növbəti mərhələ bu zaman başlanır.

Müəllim hər bir şagirdə verilmiş tənəkə materialı göstərir və yeri gəldikcə adları yuxarıda sadalanan hər bir fənn üzrə vacib hesab etdiyi bilkləri şərh etməklə modula aid nəzəri (akademik) bilikləri inteqrasiya olunmuş şəkildə (nəzəri hissə) tədris edir. Usta öyrənənlərə (şagirdlərə) tədris edəcəyi nişanlama əməliyyatına başlamazdan öncə bu iş üçün nəzərdə tutulmuş alət və ləvazimatları nümayiş etdirir - onların adlarını və təyinatını deyir. Eyni zamanda bu alətlərdən istifadə edərkən “Təhlükəsizlik texnikası” qaydalarını da şərh etməklə işinə davam edir. Şagirdlər isə hər bir alətin hansı məqsəd üçün nəzərdə tutulduğunu və onlardan istifadə qaydalarını öyrənirlər.

Yeri gəldikcə fənlərarası inteqrasiya aparılır, onlar modulda nəzərdə tutlmuş təlim nəticələrinə uyğun istiqamətləndirilir. Nəhayət, sonuncu mərhələdə qiymətləndirmə aparılır.

KƏMT əsasında tədris proses zamanı çaşqınlıq yarada biləcək bir neçə məsələyə də diqqət yetirməyi məqsədəuyğun hesab edirik.

KƏMT əsasında tədris həftənin konkret günlərində 6 saat olmaqla aparılmaldır. Modul, həmçinin təhsil müəssisəsində dərs cədvəli tərtib olunarkən buna diqqət yetirmək lazımdır;

Mühəndis-pedaqoqla ustanın birgə tədris etdikləri dərsdə nəzəriyyə ilə praktiki işə sərf olunmuş dəqiqələri ayrı-ayrılıqda saymağa ehtiyac yoxdur, bu onların əmək haqlarına heç bir təsir etmir, çünki saatlar modul tərtib olunarkən bölünür. Həm mühəndis-pedaqoqun, həm də ki, ustanın 6 saat ərzində məqsədi birdir – modulda göstərilmiş təlim nəticələrinə nail olmaq;

Müəllimlə ustanın birgə tədris aparmaları problem kimi qabardılmamalıdır. Tədris olunan peşə üzrə usta yoxdursa, bir mühəndis-müəllim də bu işin öhdəsindən gələ bilər. Amma köməkçi heyətin (məsələn, labarantın) olması işin yalnız xeyrinədir.

Bir nəfər müəllimin dərsin sonunda qiymətləndirmə aparması da obyektiv olmur. Odur ki, kadr çatışmazlığı şəraitində fors-mojor hal kimi bir nəfərin tədris aparması mümkün olsa da arzu olunan hal deyil. Təlim prosesini iki nəfərin aparması məqsədə müfaviqdir;

Dərs cədvəli tərtib olunarkən diqqətdə saxlanılmalıdır ki, emalatxana, yaxud laba-

ratoriya 6 akademik saat ərzində yalnız bir qrupun sərəncamında olacaq, tədris prosesi təlimata uyğun fasilələrlə ardıcıl olaraq həyata keçirələcəkdir.

Modul, yaxud alt modul üzrə dərsin sonunda qiymətləndirmə aparılacaqsa, qiymətləndirmə meyarları qabaqcadan hazır olmalıdır. Bu fikir nəzəri materiallar paketinə də aiddir. Hər bir modul, yaxud alt modul üçün nəzəri materiallar paketi qabaqcadan hazır olmalı və hər bir öyrənənə paylanmalıdır.

Şərh olunan metodika az qala 100 ildən çox zaman ərzində hakim mövqe tutmuş fənnyönümlü tədrisə tamamilə ziddir. Azərbaycanda heç bir peşə təhsili müəssisəsində bu metodika əsasında tədris aparılmayıb. Eksperimental qruplarda (Qəbələ və İsmayıllı Peşə Tədrisi Mərkəzində) aparılan tədris prosesi zamanı şərh olunan məsələlərin çox az bir qismi praktiki olaraq həyata keçirilsə də, bütünlüklə tədris KƏMT əsasında aparılmır. İnsanların peşə təhsili haqqında düşüncə tərzlərini nə vaxt dəyişəcəklərini gözləmədən təlim texnologiyalarını dəyişmək lazımdır. Peşə təhsili sisteminə qarşı cəmiyyətdə yenidən maraq oyatmaq, peşənin, peşə sahiblərinin və peşə təhsili müəssisələrinin fəaliyyətini XXI əsrin tələbləri səviyyəsində qurmaq üçün ənənəvi fənnyönümlü təhsildən müasir – kompetensiyalara əsaslanan modul texnologiyaları peşə-ixtisas təhsilində tətbiq etmək lazımdır.

***Rəyçi*: *dos. R.Qəndilov***

## İstifadə edilmiş ədəbiyyat

1. “Təhsil haqqında” Azərbaycan Respublikasının Qanunu. Bakı, 2009.
2. Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı. Bakı: Çaşıoğlu, 1999, 38 səh.
3. Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu) Bakı, 2006, 38 səh.
4. Олейникова О., Муравьева А. Аксенова Н. Обучение в течение всей жизни и профессиональное образование. М., 2011.
5. Олейникова О. «Модульные технологии : проектирование и разработка образовательных программ: учебное пособие. М.: Альфа-М, 2010.
6. Əsgərov R., Qurbanov M. Modul tipli kurikulumlar və peşə-ixtisas təhsili. Metodik vəsait. Bakı: Mütərcim, 2015.
7. Əsgərov R., Qurbanov M. İlk peşə-ixtisas təhsili: Problemlər və prespektivlər – Bakı: Mütərcim, 2016.

**М.Гурбанов**

**Интеграция практики с теорией на основе модульной технологии**

**Резюме**

Статья посвящена в проведении интегрированном форме теории и практики в профессиональных учебных заведениях, основанных на компетенциях. А также в статье нашло своё отражение деление времени между теорией и практикой при проектировании модуля, адаптированное к цели занятий в интегрированном проведение предметов указанных в разделах общепрофессиональной подготовке и других вопросов.

**M.Gurbanov**

**Integration of practice with theory based on modular technology**

**Summary**

The article focuses on the integration of theoretical (academic) knowledge and practical work (practice) on he Computing-Based Modular Technologies in Vocational Training Institutions . İn this article is also reflected how to divide the total time between the theoretical and practical parts of the module, the integration of the subjects in the general vocational unit and the adaptation of the learning objectives and so on.



# DİLİMİZİN SAFLIĞINA DÖVLƏT QAYĞISI

**Pəri Paşayeva,**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti, pedaqogika üzrə fəlsəfə doktoru***

Məqalədə Azərbaycan dilinin türk dilləri ailəsində ən zəngin bir dil olmasından, onun inkişaf yolundan, Azərbaycan dilinin dövlət dili statusuna qaldırılmasından, bu sahədə ümummilli liderimiz Heydər Əliyevin xidmətlərindən bəhs edilir. Həmçinin məqalədə Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin dilimizin təkmilləşdirilməsinə dair son sərəncamlarının əhəmiyyəti vurğulanır.

***Açar sözlər:*** *dövlət dili, türk dilləri, orfoqrafiya, dilçilik.*
***Ключевые слова:*** *государственный язык, тюркские языки, орфография, языкознания.*
***Key words:*** *state language, Turkic languages, orthography, linguistics.*

Azərbaycan dili müasir dünyada öz mahiyyətinə görə, türk dillərinin ən zəngin milli dillərindən biri sayılır. Xalqımızla bərabər yaranmış dilimiz ünsiyyətin, fikir mübadiləsinin ən qüdrətli vasitəsi və silahı kimi tarix boyu xalqımızın xidmətində dayanılmışdır. O insanların bir-birini başa düşməsinə, onların qarşılıqlı əlaqələrinə kömək etmiş, cəmiyyətin yetkinləşməsinə təsir edən başlıca amillərdən biri olmuşdur. Xalqımızın tarixi kimi qədim olan dilimiz mənəviyyatımızın daşıyıcısıdır. Bu gün mükəmməl lüğət fondu, lüğət tərkibi, orfoqrafiyası, orfoepiyası, əlifbası olan Azərbaycan dili ahəngdar səslər sisteminə, zəngin və rəngarəng söz ehtiyatına malikdir. Xalqımızın iqtisadi, mədəni inkişafı ilə əlaqədar son dövrlərdə dilimizin inkişaf spektrləri daha da genişlənmiş, bu dildə diplomatik sənədlər, yüksək səviyyəli bədii, publisistik əsərlər yazılmışdır. Məhz bu dilin vasitəsilə Nizamilər, Füzulilər tanıdılmış, dünya klassiklərinin əsərləri xalqımızın mənəvi sərvətinə çevrilmişdir. Azərbaycan ədəbi dilinin formalaşması və inkişafında xüsusi rol oynamış Həsənoğlu, İmadəddin Nəsimi, Şah İsmayıl Xətai, Füzuli, Vaqif poeziyası Azərbaycan ədəbi dilinin sabitləşməsi uğrunda ciddi mübarizə aparan M.F.Axundovun yetişməsi üçün zəmin olmuş, XX əsrdə isə Azərbaycan ədəbi dilini, "Molla Nəsrəddin", C.Məmmədquluzadə, Sabir dilini formalaşdırmış, 70 illik sovet rejimi dövründə isə S.Vurğun, S.Rüstəm, R.Rza kimi şairlər, M.İbrahimov, M.Hüseyn, İ.Əfəndiyev kimi nəsr ustalarının zəhməti nəticəsində dilimiz bu günkü zirvəyə yüksəlmişdir. Müstəqillik illərində onun qol-qanad açması üçün şərait yaranmışdır. Azərbaycan dövləti dilimizin təkmilləşdirilməsi, onun zənginləşdirilməsi, mükəmməlləşdirilməsinə daim qayğı göstərmişdir.

"Azərbaycan Respublikasının Dövlət Dil Komissiyasının yeni tərkibinin təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı" ötən illər ərzində Azərbaycan dilinin rəsmi statusunun təminatı və tətbiqinin təkmilləşdirilməsinə dair müxtəlif qanun, fərman və sərəncamların davamı kimi bu böyük dövlət əhəmiyyətli məsələnin yüksək səviyyədə

həllinə təkan vermişdir. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin sədr olduğu Azərbaycan Respublikasında Dövlət Dil Komissiyasının yeni tərkibinə xalqımızın ən tanınmış ictimai və elm, mədəniyyət xadimləri, yazıçılar, jurnalistlər daxil edilmişdir. Komissiyanın tərkibində Azərbaycan Dövlət Pedaqoji Universitetinin professoru, filologiya üzrə elmlər doktoru Buludxan Xəlilov da vardır..

Danılmaz faktdır ki, Azərbaycan dilinin dövlət dili kimi qəbul edilməsi, qorunması və inkişafı ümummilli lider Heydər Əliyevin adı ilə bağlıdır. Məlumdur ki, 20-ci, 30-cu, 40-cı, 50-ci, həmçinin 60-cı illərdə respublikamızda Azərbaycan dili hakim dil olmamışdır. 50-ci illərdə Mirzə İbrahimovun təşəbbüsü ilə bu məsələ qaldırılsa da, təəssüf ki, öz həllini tapa bilməmişdir. Bununla yanaşı 70-ci illərin ortalarında o vaxt Azərbaycan Respublikasının rəhbəri olan Heydər Əliyev dil məsələsində öz mövqeyini açıq bildirmiş, çox böyük çətinliklə 1978-ci ildə Azərbaycan Respublikasının Konstitusiyasına “Azərbaycan Sovet Sosialist Respublikasının dövlət dili Azərbaycan dilidir” - maddəsinin daxil edilməsinə nail olmuşdir.

Müstəqillik illərində ana dilimizin inkişafı və qorunması sahəsində daha mühüm tədbirlər həyata keçirilmiş, ildən-ilə ana dilimizə göstərilən dövlət qayğısı nəticəsində xalqımızın milli ruhu yüksəlmiş, müstəqillik düşüncələri güclənərək dilimizin yeni inkişaf mərhələsinə qədəm qoyması kimi bir proses başlanmışdır. 1995-ci il 12 noyabrda qəbul edilmiş Konstitusiyamızın 21-ci maddəsində Azərbaycan dilinin dövlət dili statusu təsbit edilmiş, dilimiz öz statusunu bir daha təsdiq etmişdir. Ulu öndərin “Dilimiz çox zəngin və ahəngdar dildir, dərin tarixi köklərə malikdir. Şəxsən mən öz ana dilimi çox sevirəm və bu dildə danışmağımla fəxr edirəm”, - kimi müdrik kəlamı xalqımızın milli inam və əqidəsinə çevrilmişdir.

Məlumdur ki, müstəqilliyimizin ilk ilində latın qrafikalı Azərbaycan əlifbası qəbul olunsa da yalnız xeyli sonra ümummilli liderimiz Heydər Əliyevin fərmanından sonra ölkəmizdə bütün yazılı sənədləşmələrin latın qrafikası ilə aparılması üçün ciddi dövlət tədbirləri həyata keçirilmişdir.

Məlumat üçün xatırlatmağı lazım bilirəm ki, Qazaxıstanda latın əlifbasına keçməklə əlaqədar plan hələ indi hazırlanır. Qazaxıstan vətəndaşı olan şəxslərə məxsus şəxsiyyət vəsiqələri və digər sənədlərin latın qrafikası əsasında tərtibi 2021-2023-cü illərdə nəzərdə tutulur, çap nəşrləri latın qrafikasına isə 2024-2025-ci illərdə keçiləcəkdir. Artıq bu barədə Qazaxıstan Prezidentinin sərəncamı vardır.

Türkdilli xalqların latın qrafikalı əlifbaya keçməsində öndə gedən müstəqil Azərbaycan dövləti bütün sahələrdə olduğu kimi, dil siyasətində, əlifba sahəsində də ulu öndərin strateji kursuna sadiq qalaraq, onun siyasi xəttinin dönmədən və uğurla həyata keçirilməsinə ardıcıl diqqət yetirmişdir. Azərbaycan latın qrafikalı əlifbaya keçməklə əlaqədar 1926-cı ildə də ilk təşəbbüskar olmuşdur. Azərbaycan dilinin gözəlliyi, onun zənginliyi və digər xüsusiyyətləri tarixən də həmişə görkəmli şəxsiyyətlərinin diqqətini cəlb etmiş və Azərbaycan dili haqqında yadda qalan fikirlər söylənmişdir.

Böyük rus şairi M.Y.Lermontov demişdir: “...Mən bir çox dağlar aşdım, Şuşa, Quba və Şamaxı şəhərlərində oldum, azərbaycanca öyrənməyə başladım, həmin dil burada və ümumiyyətlə, Asiyada fransız dilinin Avropada olduğu qədər zəruri bir dildir”.

Dilimizin inkişaf səviyyəsinin bariz ifadəsi olan Azərbaycan dilinin orfoqrafiyası bu günkü səviyyəyə yüksələnədək uzun bir

inkişaf yolu keçmişdir. XX əsrin əvvəllərində orfoqrafiya məsələsi prinsipial məsələlərdən biri kimi sayılsa da, Azərbaycanda birinci orfoqrafiya ilk dəfə 1929-cu ildə, ikinci orfoqrafiya 1936-cı ildə təsdiq edilib çap olunmuşdur. Orfoqrafiya qaydalarının geniş müzakirəsindən sonra yeni qaydalar 1938-ci ildə təsdiq olunmuş, yeni hazırlanmış orfoqrafiya qaydaları Xalq Komissarları Soveti tərəfindən təsdiq edilərək 1940-cı ildə "Azərbaycan dilinin orfoqrafiyası" adı altında çap olunmuşdur. Növbəti orfoqrafiya 1954-cü ildə nəşr edilmişdir. 1958-ci ildə çap olunmuş "Azərbaycan dilinin orfoqrafiya qaydaları" isə yeddi ilə qədər qüvvədə qalmış və 1975-ci ildə "Azərbaycan dilinin orfoqrafiya lüğəti" çapdan çıxmışdır.

Azərbaycan dilinin orfoqrafiyası hər dəfə təsdiq olunanda geniş müzakirədən keçirilmiş, təkmilləşdirilmiş və vahid yazı normalarına doğru inkişaf etdirilmişdir.

Azərbaycan Prezidentinin sərəncamı əsasında indi dilimizin orfoqrafiyası ilə bağlı ölkəmizdə geniş fikir mübadiləsi aparılır, təkliflər səslənir, hər sözə, ifadəyə yeni və yaradıcı münasibət bildirilir. Bu da ana dilimizə dövlət səviyyəsində çox yüksək diqqət və əhəmiyyətinin ifadəsidir. Çox əlamətdar hadisədir ki, ali məktəblərimizdə "Nitq mədəniyyəti" fənni tədris edilir. İxtisasından asılı olmayaraq, hamının gözəl nitqə sahib olması qayğısına qalınnır. Xalqımız unutmur ki, Əli Sultanlı, Mikayıl Rəfili, Şıxəli Qurbanov, İsmayıl Şıxlı nümunəvi və məharətli nitqləri ilə xalqımızın yaddaşında əbədi həkk olunmuşdur. Milli sərvətimiz olan ana dilimiz öz incəliyi ilə, məna çalarları ilə ürəkləri fəth edir, qəlblərdə işıqlı fikirlər oyadır.

Aydındır ki, bütün xalqlar öz dilini sevir, onun gözəlliyini dəyərləndirir. Qədim Yunan, Roma natiqləri dilin gözəlliyindən məharətlə istifadə etmişlər. Vaxtilə Böyük Karl demişdir ki, dostla fransız dilində, qadınla italyan dilində, düşmənlə alman dilində, Allahla ispan dilində danışasan. Öz dilini sevən M.Y.Lomonosov isə demişdir: "əgər o, rus dilini bilsəydi, deyərdi ki, hamı ilə rusca danışasan". Bizim S.M.Qənizadə isə demişdir: "Həqiqətdə Azərbaycan dili öz təbiətinə görə çox elastikdir və asanlıqla zərif üslubi formalara düşmə bacarığına malik olmaqla öz xüsusiyyətləri ilə fəxr edə bilər. Buna hər hansı bir başqa dildə az təsadüf etmək olar".

Azərbaycan dili yeni və yüksək inkişaf mərhələsindədir. Onu bu səviyyədə saxlamaq, daha ucalara qaldırmaq ziyalılarımızdan, ali məktəb partasında oxuyan tələbələrimizdən çox asılıdır.

Azərbaycan dilinin özünəməxsus gözəlliyi və ahəngi həmişə öz xalqına baş ucalığı gətirmişdir. Azərbaycan dilində dünya mədəniyyətini zənginləşdirən sənət abidələri yaradılmışdır.

Azərbaycan dili hazırki inkişaf səviyyəsinə çatmaq üçün böyük mübarizədən keçmiş, onun tarix meydanından çıxarılmasına qarşı sinə gərmiş, öz varlığını qorumuşdur. Hələ 1971-ci ildə "Наука и жизнь" jurnalında, sovet dövründə çap olunmuş bir məqalədə deyilirdi: "Azərbaycanlılar - Qafqazın antropoloji cəhətcə xüsusi bir xalqı, Azərbaycan sakinləri və Cənubi Dağıstanın etnik qrupları üçün xarakterik spesifik bir qrupun nümayəndələridir".

Bu gün də türkologiya elmi Azərbaycan xalqının qədimliyini inkar etmir.

Ulu öndər "dilimiz dərin tarixi köklərə malikdir" - deyəndə də məhz bunları nəzərdə tutmuşdur. Müstəqillik illərində ulu öndər Heydər Əliyev və Azərbaycan Respublikası Prezidenti İlham Əliyev tərəfindən imzalanmış qanunlar, qərarlar və sərəncamlar da bu tarixi ənənələrin yaşadılmasına xidmət edir.

"Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun

istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı haqqında” Azərbaycan Respublikası Prezidentinin 23 may 2012-ci il tarixli Sərəncamı dövlətimizin və onun rəhbərinin ana dilinə dövlət qayğısının ən bariz ifadəsidir. Hazırda Azərbaycan dilinin orfoqrafiya qaydalarına yenidən baxılır, ona çox həssas məsələ kimi yanaşılır. Qloballaşan dünyada milli dillərin qorunması və inkişafı olduqca vacib problemlərdən biridir. Dünya dilləri içərisində doğma dilin əriməsinə imkan verilməməlidir. Təsadüfi deyildir ki, müstəqillik illərində “Azərbaycan dilinin orfoqrafiyası lüğəti” iki dəfə: 2004 və 2013-cü illərdə nəşr olunmuşdur. Hər iki lüğət dilimiz üçün yeni hadisə olsa da, yenə də təkmilləşdirilməsi lazım sayılır. Ona görə də, bütün xalqımızın iştirakı ilə dilimizin orfoqrafiya qaydalarının tənzimlənməsi sahəsində qızğın iş gedir. “Azərbaycan dilinin Orfoqrafiya Qaydaları”nın hazırlanması üçün işçi qrupu mütəxəssislərin təklifləri toplanılır, ümumiləşdirilir.

Dilimizin saflığına dövlət qayğısı ali məktəb müəllimləri və tələbələrin də üzərinə böyük və məsuliyyətli vəzifələr qoyur. Mühazirə oxuyan hər bir müəllimin nitqi aydın olmalı və sözlərin səlisliyinə, orfoepiya qaydalarına düzgün riayət edilməlidir. Tələbələr şifahi nitqində hər sözün orfoepik qaydada tələffüzünə alışmalı və nitqin gözəlliyinə səy etməlidir. Mütaliə biliyi zənginləşdirdiyi, dili səlisləşdirdiyi üçün kitab mədəniyyəti tələbinə riayət olunmalıdır. A.A.Çexov “İnsanda hər şey gözəl olmalıdır” dedikdə, həm də insanın nitqinin gözəlliyini nəzərdə tutmuşdur. XXI əsr vətəndaşının dili də onun intellekti ilə ayaqlaşmalıdır.

Sonda bir arzumuz və tövsiyəmiz qalır ki, o da dilimizi sevmək, onu qorumaq, dövlət səviyyəsində göstərilən qayğıya, əməli işlə layiqli cavab verməkdir.

*Rəyçi: f.e.d. dos. M.Hüseynov*

## İstifadə edilmiş ədəbiyyat


1. Azərbaycan Respublikasının Dövlət dil komissiyasının yeni tərkibinin təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı. //Azərbaycan məktəbi, 2017, № 6.
2. Qurbanov A. Müasir Azərbaycan ədəbi dili. Bakı, 1987.
3. Azərbaycan Dilinin Orfoqrafiya lüğəti. Bakı, 2012.
4. Xəlilov B. Müasir Azərbaycan dili. Bakı, 2013.



**П.Пашаева**

**Забота государства о чистоте языка**

**Резюме**

В статье рассматривается тот факт, что азербайджанский язык является одним из самых богатых языков в семье тюркских языков. Также уделено внимание вопросам развития азербайджанского языка и его статуса, как государственного языка. Кроме этого подчеркиваются заслуги общенационального лидера Гейдара Алиева в этой области.



**P.Pashayeva**

**Care of the state about the purity of language**

**Summary**

The article considers the fact that the Azerbaijani language is one of the richest languages in the family of Turkic languages. Attention is also paid to the development of the Azerbaijani language and its status as a state language. In addition, the merits of the national leader Heydar Aliyev in this area are underlined.

*Seçkilər ərəfəsində*



# NAİLİYYƏTLƏRİMİZİ QORUMALIYIQ

**Səbinə Ağayeva,**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti, fizika-riyaziyyat elmləri üzrə fəlsəfə doktoru***

Azərbaycan xalqı müstəqilliyini bərpa etdikdən sonra ümummilli lider Heydər Əliyevin liderliyi ilə bütün dünyada öz yerini tanıtdıra bilmiş, BMT-nin, Avropa Şurasının üzvü olmuş, dünyanın ən mötəbər təşkilatları ilə əlaqə yarada bilmişdir. Artıq azərbaycan iqtisadiyyatı ilə güclü ölkələr sırasına daxil olduğu kimi, özünün mədəni irsinə də sahib çıxmışdır. Bütün bunlar ulu öndər Heydər Əliyev və onun layiqli davamçısı İlham Əliyevin böyük təşkilatçılıq fəaliyyətinin nəticəsidir. Azərbaycan xalqı öz Prezidentini sevir və ona böyük ümid bəsləyir. Ölkəmizdə yaradılmış stabillik vəziyyəti, əmin-amanlığın təmin edilməsi xalqımızın fikir və məqsədini gələcəyə istiqamətləndirmişdir.

Təhsil işçisi kimi, təhsilimizə göstərilən dövlət qayğısını hər an hiss edirik. İndi ölkəmizin hər yerində məktəblər tikilir, abadlıq işləri aparılır, kəndlər, şəhərlər gözəlləşir. Azərbaycana gələn turistlər Bakıya, Naxçıvana, Gəncəyə, Qəbələyə heyran olurlar. Təsadüfi deyildir ki, ildən-ilə ölkəmizə gələn turistlərin sayı artır. Onlar qonaqpərvərliklə qarşılandıqlarını dönə-dönə qeyd edirlər. Dünya bizi tanıyandan, düzgün anlayandan sonra Qarabağ məsələsi də sülh yolu ilə öz həllini tapacaqdır.

Mən ali məktəb müəllimiyəm. Gözümüzün qarşısında fəaliyyət göstərdiyim Azərbaycan Dövlət Pedaqoji Universitetində də əsaslı dəyişikliklər olur. Bunları görüb, sevinirəm. Bütün ölkəmizdə son illərdə qazanılmış nailiyyətlərimiz hamımızı ürəkdən sevindirir. Gənclər üçün geniş perspektivlər açılmışdır. Dünyanın ən tanınmış universitetlərinin tələbələri içərisində azərbaycanlılar da vardır. Bizim ali məktəblərimizdə də xaricdən gələn gənclərin sayı az deyildir. Bütün bunlar, ilk növbədə, Azərbaycanın dünya miqyasında tanınması ilə əlaqədardır. Bunlar isə, ilk növbədə, Prezidentimiz İlham Əliyevin düzgün siyasəti nəticəsində mümkün olmuşdur. Ona görə də, qədirbilən Azərbaycan xalqı öz nailiyyətlərini qorumaq, onu möhkəmləndirmək, müstəqilliyimizi əbədi, dönməz etmək məqsədilə aprelin 11-də Prezident seçkilərində İlham Heydər oğlu Əliyevə səs verəcəkdir.

Mən, müəllim ailəsində doğulmuş, tərbiyə almışam. Anam da müəllimdir. Atam universitetimizin kafedra müdiridir. Bizim ailədə hamı belə düşünür. Tələbələrimizi də belə tərbiyə edirik. Bütün həmkarlarımı və tələbələrimi nailiyyətlərimizi qorumağa çağırıram.

# ŞUŞANIN YOLLARI APRELDƏN KEÇİR



**Naibə Səmədova,**
***R.Qəmbərov adına 5 nömrəli Şuşa tam orta məktəbinin direktor müavini***

2016-cı ilin aprel döyüşləri şuşalıların qəlbindəki ümid çıraqlarını bir daha alovlandırdı, 25 ildən bəri həsrətini çəkdiyimiz yollara işıq saçdı. Cocuq-Mərcanlı kəndinin abadlaşdırılması, orada Şuşa məscidinə bənzər məscidin ucaldılması ümidimizi, fərəhimizi birə yüz artırdı. Deməli, qələbə bizə yaxındır, o binalar, o xəstəxana, o məktəb, o məscid tezliklə Şuşada da inşa ediləcəkdir. Qaçqınlar, məcburi köçkünlər bilir ki, Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev onların himayədarıdır, ərazi bütövlüyünün keşiyində duran sərkərdədir. Azərbaycanın üçrəngli bayrağı məhz onun rəhbərliyi ilə Şuşada da dalğalanacaqdır. O gün bütün Azərbaycan üçün bayram olacaqdır. Şuşaya qovuşmaq, onu görmək milyonlarla azərbaycanlının arzusudur.

İlham Əliyev prezidentliyi dövründə bir gün də düşmən tapdağında olan torpaqlarımız diqqətdən kənarda qalmamışdır. Ümidvarıq ki, yaxın vaxtlarda ərazi bütövlüyümüz bərpa olunacaqdır. Ona görə də, şuşalılar bütün xalqımız kimi aprelin 11-də cənab İlham Əliyevə səs verəcək, onun prezident seçilməsini bayram edəcəkdir.

Biz, prezidentimiz İlham Əliyevin xarici və daxili siyasətini tam bəyənir, onun dövlət başçıları arasındakı nüfuzuna sevinirik. Azərbaycanın günü-gündən yeniləşməsinə məhz onun zəhməti, bəhrəsi kimi baxırıq. Şuşalı müəllimlər bütün məktəblərdə seçkilərlə əlaqədar hazırlıq işlərində fəal iştirak edir, səsvermə gününü səbirsizliklə gözləyirlər.

Respublikamızın müxtəlif rayonlarında təhsil alan şuşalılar Azərbaycanın musiqi beşiyi olan  Şuşanın həsrətində yaşayırlar. Onlar qəti inanırlar ki, şuşalıları Şuşaya ulu öndərin davamçısı İlham Əliyev qovuşduracaqdır.

Taleyin bizə verdiklərinə şükür edirik və onu qorumağa, möhkəmləndirməyə səylə çalışırıq.

Prezidentliyə yeganə namizədimiz cənab İlham Əliyevdir. 2018-ci ilin apreli bizi Şuşamıza yaxınlaşdırır.



# O BİZİM YEGANƏ NAMİZƏDİMİZDİR

**Ülkər Səmədova,**
***Ağdam rayonu, 1 nömrəli köçkün tam orta məktəbinin müəllimi***

Bu gün sosial-iqtisadi, ictimai-siyasi və mədəni həyatın bütün səhifələrində beynəlxalq miqyaslı uğurlar əldə edən Azərbaycan Respublikası seçkilərə mühüm nailiyyətlərlə gedir. Qətiyyətlə demək olar ki, son 15-20 ildə ölkəmizdə keçirilən Prezident seçkilərində bütün Azərbaycan zəhmətkeşləri kimi, təhsil işçiləri də insan hüquq və fədakarlığının yüksək səviyyədə təmsil olunması məsələsinin şahidi və iştirakçısı olmuşdur.

Ölkəmizin hər yerində olduğu kimi sərhəd zonasının məcburi köçkün məktəblərində də seçki prosesinin şəffaflıq və demokratiklik prinsiplər əsasında keçirilməsinə böyük hazırlıq görülür. Azərbaycan ziyalılarının ən böyük dəstəsini təşkil edən təhsil içşiləri bu günü səbirsizliklə gözləyirlər. Azərbaycan Respublikası Prezidenti İlham Əliyevin diqqət və qayğısı nəticəsində sərhəd bölgələrində yaşayan əhalinin sosial rifah məsələlərinə ardıcıl qayğı göstərilir, bu bölgələrdə müasir tələblərə cavab verən məktəblər, xəstəxanalar tikilir, onların təhlükəsizliyinin təminatı üçün hər cür şərait yaradılır. Prezidentimizin tez-tez sərhəd bölgələrinə səfəri, yerli əhali ilə səmimi görüşləri, hamıda böyük inam yaratmışdır ki, tezliklə ərazi bütövlüyümüz təmin olunacaq, torpaqlarımız qaytarılacaq və Azərbaycan bayrağı buradan çox da uzaq olmayan Xankəndində dalğalanacaqdır. Biz buna tam əminik və bu əminliyin bizdə yaranmasında cənab İlham Əliyevin siyasi iradəsi böyük rol oynayıb, onun beynəlxalq qurumlardakı çıxışları bizdə qürur hissi oyadır. Seçkilərə lap az qalmışdır. Hamımızın hər gün dediyimiz sözləri Aprelin 11-də rəsmi şəkildə deyəcəyik. Bizim yeganə namizədimiz qaçqınların və məcburi köçkünlərin böyük himayədarı İlham Heydər oğlu Əliyevdir. Bütün təhsil işçiləri kimi biz də öz səsimizi möhtərəm prezidentimizə verəcəyik.

Təhsil işçiləri tam əmindir ki, insan hüquqlarının daha sivil həyata keçirilməsi vasitələrindən biri kimi, yenə də seçkilər demokratik, azad, ədalətli, şəffaf və beynəlxalq standartlara uyğun keçiriləcək və uğurla başa çatdırılacaqdır.

Seçkilər bizdə bir də o inamı yaradır ki, hamımızın ürəkdən dəstəklədiyimiz Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev seçkidə qalib gələcəkdir.

Ağdamlılar qarabağın qayıdacağına tam əmindirlər. Onlar inanır ki, müstəqil Azərbaycan gündən-günə güclənir, qələbəyə də yaxınlaşırlar. Artıq dünya ölkələri də vəziyyətin belə qalması ilə razılaşmırlar.

# M.T.SİDQİNİN PEDAQOJİ FİKİRLƏRİ

**Mir Abbas Aslanov,**
*pedaqoji elmlər namizədi*

Mənalı ömrünü xalq maarifinə, gənc nəslin təlim-tərbiyəsinə sərf edən Məhəmməd Tağı Səfərov (Sidqi) Azərbaycanda pedaqoji fikir tarixində mühüm yer tutur. Müəllimlik fəaliyyəti, çap olunmuş və əlyazması şəklində qalmış əsərləri, maraqlı dərslikləri M.T.Sidqinin görkəmli pedaqoq olduğunu sübut edir.

M.T.Sidqi (1854-1903) pedaqoji fəaliyyətə 1892-ci ildə Ordubad şəhərində yeni üsullu “Əxtər” (“Ulduz”) məktəbində başlamışdır. O, 1894-cü ilin payızında Naxçıvana gələrək, “Tərbiyə” məktəbini yaratmış və müəllimlik fəaliyyətini davam etdirmişdir.

“Tərbiyə” məktəbi necə məktəb idi?” sualına Sidqinin yaxın dostu, inqilabçı-demokrat yazıçı Cəlil Məmmədquluzadə öz “Tərcümeyi-hal”ında belə cavab vermişdir: “Danabaş kəndində müəllim olduğum vaxtlar, Naxçıvanda doxsan dörd və doxsan beşinci ildə böyük türk (Azərbaycan – M.A.) məktəbi açıldığına təsadüf edir. Həmin məktəbi idarə etməyə doxsan dördüncü ildə Ordubaddan məşhur müdərris və şairimiz Məşədi Tağı Sidqi dəvət olunur... Həmin məktəb biz yeniyetmə müəllim və ədiblər üçün də darülürfan hesab olunur”.

Müasirləri üçün “darülürfan” hesab edilən “tərbiyə məktəbi mollaxana və mədrəsələrdən əsaslı şəkildə fərqlənirdi: mollaxana və mədrəsələrdə dini elmlər “Tərbiyə” məktəbində isə dünyəvi elmlər tədris edilirdi. Mollaxana və mədrəsələrdə tədris azərbaycanlı uşaqlara yad olan fars və ərəb dillərində , “Tərbiyə” məktəbində isə doğma ana dilində aparılırdı. Burada ana dili, rus dili, tarix, coğrafiya, hesab fənləri tədris edilirdi, əməli məşğələlər keçirilirdi. Mollaxanada uşaqlara ağır fiziki cəza verilirdi, onlar həsir üstündə oturub “dərs oxuyurdular”. “Tərbiyə” məktəbində şagirdlər skamyalarda otururdular, sinif-dərs sistemi tətbiq edilirdi. Fiziki cəza yox idi. Lakin burada da cəzalandırma, xüsusən “tovfiq cəzası” (ayaq üstə saxlama) tətbiq edilirdi. Məktəbdə eyni zamanda rəğbətləndirmə üsulundan da geniş istifadə olunurdu. Məsələn, hər sinifdə hər gün dərslərini yaxşı oxuyan, səy və çalışqanlığı ilə seçilən şagirdə “Təhsil və afərin vərəqi” (təşəkkürnamə) verilir, sabah isə həmin uşaq başqalarına nümunə göstərilirdi. “Tərbiyə” məktəbində dərs ilinin axırında keçirilən imtahanlarda dərin biliyə və nümunəvi əxlaqa görə şagirdlər “İmtiyaz vərəqi” (fərqlənmə vərəqi) alırdılar. “Tərbiyə” məktəbi belə məktəb idi. Onu köhnə üsullu məktəblərlə eyniləşdirmək olmaz. “Tərbiyə” məktəbinin tədris planında özünə möhkəm yer tutan etika dərsləri (III sinifdə həftədə 2 saat) ona böyük şöhrət qazandırmışdı.

M.T.Sidqinin “Tərbiyə” məktəbinin şagirdləri üçün öz əli ilə yazdığı “Ədəb qaydaları” indiyədək mühafizə edilib qalmışdır. Həmin ədəb qaydalarından bir neçəsini ilk dəfə olduğu üçün göstərməyi lazım bilirik:

1. Şagirdlərdən hər birisi dərs günlərində əmri-zəruri və kari-vacibi

cəhətdən məktəbə gəlməsə, gərəkdir, həmin gün ya onun sabahı öz atasının tərəfindən məktub ilə müəllimə məlum eyləsin.

2. Yer palçıq olan günlərdə başqalarına mülahizə edib və çəkmələrini təmizləyib, sonra məktəb otağına daxil olsunlar.

3. Kitab və dəftərləri pırtlamış, cırılmış və qaralanmış olmasın, o cümlədən sair təlim şeyləri öz qaydasında olmalıdır.

4. Məktəbə gələn vaxtda əl-ayağı, üst-başı təmiz və dırnaqları tutulmuş, xüsusən, libasları pakizə olmalıdır.

5. Müəllimlərdən və sair vacibülehtiram şəxslərdən hər birisi məktəbə daxil olanda və məktəbdən çıxanda ayaq üstə durub təzim etmək lazımdır.

6. Dərs əsnasında bir-birinin kitabına və dəftərinə baxmaq və yoldaşı ilə danışmaq, yoldaşının qələtini məxvi demək möcibitənbeh və tovfiqdir.

7. Məktəbin divarlarını yazmaq, cızmaq, qaralamaq və stul və skamyaları bıçaq ilə kəsmək və sair bu günə biqandə hərəkətlərə hər bir şagird iqdam eyləsə layiqincə tənbeh olunacaqdır.

8. Məktəb dairəsində dəsmal, kəmər və sair təlim və oyun şeylərindən nə tapılsa, dərhal müəllimə təslim ediləcəkdir.

9. Tənəffüs vaxtlarında təğyri-havadan ümum şagirdlər məktəb həyətinə çıxmalıdır. Belə ki, məktəb otağında heç bir kəs qalmayacaqdır.

10. Oyun vaxtlarında hər kəs bir-biri ilə vuruşub, döyüşüb dava eləsə və ya küsülü qalsa, o gün tovfiq veriləcəkdir və s.

Bunlarla bərabər, "tərbiyə" məktəbinə nöqsanlardan uzaq, eyibsiz məktəb kimi baxmaq, onu ideallaşdırmaq olmaz. Məsələn, məktəbin tədris planında, habelə mühafizə olunmuş başqa sənədlərin də təbiiyyat elmlərinin tədrisindən bir nişanə görmədik.

XIX əsrdəki bütün məktəblərdə olduğu kimi, "Tərbiyə" məktəbində də şəriət dərsləri keçilirdi, şagirdlər hər gün birinci dərsə dua oxumaqla başlayırdılar. "Tərbiyə" məktəbinin bu cəhətini o zamanın mühitini izah etmək olar.

M.T.Sidqinin təlim və tərbiyə haqqında fikirləri mətbu əsərlərində ("Heykəli insana bir nəzər", "Puşkin"), "Nəsihətnamə", "Həkimanə sözlər" kimi əlyazmalarında, dərsliklərində, dostlarına yazdığı məktublarında şərh edilmişdir. Sidqi Səfərov həmin əsərlərində öz dövrünün mütərəqqi fikirli ictimai xadimi və ən görkəmli pedaqoqu kimi çıxış edərək, bu gün də böyük əhəmiyyət kəsb edən mülahizələr irəli sürmüş, onları əməli şəkildə həyata keçirmişdir.

Məlumdur ki, xalqımızın görkəmli maarifçiləri keçən əsrin ikinci yarısından dünyəvi təhsil və yeni məktəb uğrunda fədakarlıqla çalışırdılar. M.F.Axundov "Əkinçi" qəzetinin 1877-ci il 2-ci nömrəsində dərc etdirdiyi bir məqaləsində üç mühüm məsələ qaldırmışdı.

1. Elmləri harda öyrənmək?

Bu sualla M.F.Axundov ana dilində məktəbin olmamasına işarə edirdi.

2. Kimdən öyrənmək?

Başqa sözlə desək, müəllim hazırlığı məsələsi irəli sürülürdü.

3. Hansı dildə öyrənmək?

Təhsilin ana dilində olması tələbi qarşıya qoyurdu.

M.F.Axundov, H.Zərdabi, S.Ə.Şirvani və dövrün başqa maarifçiləri həmin problem məsələləri həm nəzəri, həm də əməli şəkildə həyata keçirirdilər. M.T.Sidqi də öz sələflərinin yolu ilə gedərək, təlimin ana dilində aparılmasına xüsusi əhəmiyyət vermişdir.

Dövrünün istedadlı şairlərindən biri olan Sidqi rus dili və mədəniyyətinə dərin rəğbət bəsləyir, bu dili öyrənməyi gənclərə məsləhət görürdü. Şairin, oğlu

Məhəmmədəliyə şeirlə yazdığı nəsihət çox maraqlıdır. Həmin şeiri, ilk dəfə çap olunması imkanından istifadə edərək, kiçik ixtisarla veririk:

“...Nə qədər ki, var əlində fürsət
Dərsinə eylə hər zaman diqqət.
Yetişibdir zəmani-elmü ədəb,
Mənzilin eylə güşeyi-məktəb.
Dəmbədəm məktəb ilə ol dəmsaz,
Qış, həm yaz, həm oxu, həm yaz.
Dərsini yaz, oxu, elə əzbər,
Sənə verrəm qələm, kağız, dəftər.
Küllü dünyanı elm edər abad,
Özünü eylə cəhldən azad.
Ruzigarın keçirmə qəflətdə,
Elm, təhsil eylə diqqətlə.
Ömrünü məsrəf eylə bir neçə il,
Ta ki, təhsil eylə bir neçə dil.
Urusi, farsi, türki, həm ərəbi,
Bunları bilmək artırar ədəbi.
Sən də öyrən ki, əhli-lal olasan,
Bəlkə, filcümlə bakamal olasan...”

Digər maarifçilər kimi, M.T.Sidqi də elmin əhəmiyyətindən, əqli tərbiyədən çox danışmışdır. Onun fikrincə, “İnsanı müəzzəz və müşərrəf edən və zülməti-cəhalətdən çıxarıb, nuri-mərifət və təriqi-səadətə yetirən elm və ədəbdir”.

Görkəmli pedaqoq elmsiz insan ilə barsız ağac və ədəbsiz adamla cansız cisim arasında bir fərq görməyərək yazırdı: “Elmsiz insan ilə yemişsiz ağacın və ədəbsiz adamla ruhsuz cismin bir təfavütü yoxdur”.

Bir cəhət də maraqlıdır ki, M.T.Sidqi elmi tərbiyəsiz, tərbiyəni isə elmsiz götürmürdü, onların ikisini də vəhdət halında qəbul edirdi. Sidqi ədəbsiz və mərifətsiz alimi, ədəbli və mərifətli nadanı yarımçıq adam hesab edirdi. XIX əsrin digər maarifçiləri də bu fikirdə olmuşlar. Məsələn, S.Ə.Şirvani elmin ədəbdən ayrılıqda, ədəbin isə elmsiz səmərəsi olmadığını belə ifadə etmişdir:

Elmsiz kimsənə hünərsizdir,
Elm bitərbiyət səmərəsizdir.

Onu da qeyd etməyi vacib bilirik ki, M.T.Sidqi bəzən ədəbi, əxlaq tərbiyəsinin elmdən, əqli tərbiyədən üstün tuturdu və birinci plana çəkirdi. “Tənviri-əfkar” əsərindən götürdüyümüz aşağıdakı parça bu cəhətdən diqqəti cəlb edir: “İnsanın qədr və şərafətini artıran dörd şeydir: birinci ədəb, ikinci elm, üçüncü sədaqət, dördüncü əmanət və siyanətdir.

Ədəbi olmayan aqil və əməli bilinməyən alim fəqət şücaətli silahsız qoşuna bənzər. Buna görə də insan daima elm və ədəb təhsilinə çalışmalıdır. Elm bir ağacdır ki, onun səmərəsi əmək və ədəbdir. İnsanın qiyməti-həqiqiyyəsi az-çox elmi və əməli ilə bilinir. Yəni insanın bildiyi şeylərdən və məğbul əməllərindən sivay bir qiyməti yoxdur. Elmi və əməli nə mərtəbədə olsa, dəyəri və qiyməti o qədərdir. Bəs, insanın həqiqi qiyməti bu vəchlə bilinməkdən, gərək, həmişə elmini və əməlini və ədəb və əxlaqını artırmağa çalışsın”.

Azərbaycan maarifçiləri belə bir fikri qəbul etmiş və əsaslandırmışlar ki, insan şəxsiyyətinin formalaşmasında, bütün mənəvi keyfiyyətlərin qazanılmasında ictimai mühitin, tərbiyənin həlledici rolu vardır. A.Bakıxanov “Təhzibül əxlaq” əsərində yazırdı ki: “Hər kəs hər hansı bir cəmiyyət içərisində yaşarsa, o cəmiyyətin əxlaqını mənimsər”. M.F.Axundov, H.Zərdabi, N.Vəzirov və başqa maarifçilər də öz əsərlərində bu fikri təsdiq etmiş və tərbiyə məsələləri üzərində dönə-dönə dayanmışlar. Fəlsəfə elmləri doktoru Z.Göyüşov doğru deyir ki, M.T.Sidqi də “İnsanın bütün əxlaq keyfiyyətlərini ictimai mühitin və tərbiyənin məhsulu hesab etmişdir”.

M.T.Sidqi bu fikrində həmişə israr edirdi ki, heç kəs anadan şair, alim, fəhlə

kimi doğulmur. Heç kəs dünyaya düha gəlmir. Əgər indi onların biri həkimdir, müəllimdir, o biri isə bu rütbəyə çata bilməmişşə, bu, ancaq ictimai mühitin, tərbiyənin nəticəsidir. 1899-cu ildə dahi şair A.S.Puşkinin anadan olmasının 100 illiyi münasibəti ilə "Tərbiyə" məktəbində etdiyi məruzəsində Sidqi bu fikrini çox aydın ifadə etmişdir: "Şair daşdan yaranmaz. Ədib ağacdan olmaz! Şair və ədib millət, millət balalarından əmələ gəlir. Demək olar ki, bir kəndin guşəsində, bir alacığın bucağında yırtıq libas və köhnə qundağa bürünmüş bir uşaq elm və tərbiyə sayəsində axırda şairi-kamil olur.

Bir müəzzəm şəhərdə, bir ali imarətdə iftixar ilə nazpərvər bir uşaq neməti-elmdən və ləzzəti maarifdən məhrum olduğuna görə axırda bir muzi cahil olur...".

Bir halda ki, şəxsiyyətin formalaşmasında tərbiyənin, təlimin belə həlledici təsiri vardır, bəs, insana elm və ədəb nə zamandan etibarən , harada verilməlidir? Bu suallar M.T.Sidqini düşündürmüşdür. İstedadlı müəllim onları cavbsız da qoymamışdır.

İnsanın "hər halının nəticəsi uşaq vaxtında verilən təlim və tərbiyəsinin səməri və əsəridir" – deyən M.T.Sidqi uşağın təlim və tərbiyəsinə kiçik yaşlarından başlamağı məsləhət görürdü. Onun fikrincə, uşaq "ağ və qaranı, istini və soyuğu anlamağa başladığı vaxtda gözəl xasiyyətləri onlara anlatmaq, təlim və tərbiyəsinə qeyrət və diqqət etmək lazım, bəlkə vacibdir. Çünki uşaqlıq yaş ağaca bənzəyir. Təzə, yaş ağac hər nə qədər əyri olsa, düzəltmək asandır. İnsanın da kiçiklikdə tərbiyə qəbul etməyi vazeh mətləblərdəndir".

M.T.Sidqi bu fikrini bir qədər obrazlı və təsirli formada təkrar edərək, uşağın təbiətini əkin yerinə bənzədir. Əkin yerinin becərilməyə ehtiyacı olduğu kimi, uşağın da təbiəti elm təhsil etməyə, tərbiyə almağa möhtacdır. Sidqi belə bir qəti qərara gəlir ki, uşağa elm və tərbiyə kiçik yaşlarından verilməlidir. Onun fikrincə, "Ziraəti-ərziyyə zəruri olduğu kimi, ziraəti-zehniyyə və fikriyyə də uşaqlar üçün ibtidai – kiçiklikdən lazımdır". Ona görə ki, "ikinci tərbiyə" çətin başa gəlir, uşağın "bəd xasiyyətlər vücudunda təbiəti – saniyyə olduqca islahı müşkül və düşvardır". Bəs uşağa kiçiklikdə tərbiyəni kim verməlidir? Sidqinin fikrincə, bu, hər kəsdən əvvəl, ailənin, özü də əvvəl ananın, sonra da atanın vəzifəsidir. O deyirdi:

"Bir halda ki, elmin qədr və qiyməti məlum və təlim-tərbiyənin zamanı balacalar üçün ibtidai tifulliyyətdə müşəxxəs oldu, indi uşağın əvvəlinci müəllimi bitəbii (təbii olaraq – M.A.) validəsidir. Ondan sonra aqil və xirədmənd atalar balalarının təlim və tərbiyələri xüsusunda nə qədər səy və iqdamatda bulunsalar və hər növ fədakarlıq etsələr səzavardır".

İnsan şəxsiyyətinin formalaşmasında əsas amillərdən biri olan ailə uşağın tərbiyəsində mühüm rol oynayır. Burada ananın (çünki uşağa birinci "tərbiyə və təlim verən anadır") öhdəsinə daha çox məsuliyyət düşür. Qızların təhsil və tərbiyə alması, elmli və yüksək əxlaqlı olmaları zəruri şərtdir. Ona görə ki, analar elmli və ədəbli olsalar, "elm və ədəbi məhəbbət südü ilə şirü şəkər kimi qarışdırıb, övlada yedirərlər".

Qızların təhsili və tərbiyəsi məsələlərini M.T.Sidqi "Qızlara hədiyyə" dərsliyində irəli sürmüşdür. Bu gözəl əsər bir neçə cəhətdən maraqlıdır. Birincisi, o – dərslikdir. İkincisi, məktəb şəbəkəsinin genişləndirilməsi "həbsxanaları söküb, yerinə "övlad məhəbbəti" ünvanlı bir nişangah (abidə. Heykəl – M.A.) bina eyləmək" arzusunu müəllif bu əsərində ifadə etmişdir. Üçüncüsü, "Qızlara hədiyyə" əsərində ailə

tərbiyəsi məsələləri çox geniş və əhəmiyyətli şəkildə qoyulmuşdur.

Bu əsərdən iki kiçik hekayənin ideya məzmunu ilə oxucuları müxtəsər tanış etmək, faydasız olmaz.

Birinci heykayəni müəllif özü “Tərbiyənin təfavütü” adlandırmışdır: “İki bacının hər birisinin vir oğlu var idi. Onlar oğlanlarına bir-birindən fərqli tərbiyə verirdilər. Birisi adabi-tərbiyətə aşina olmadığı üçün, oğlunun məcazına görə hərəkət edir və onun nazı ilə oynayırdı. Bu ərköyün uşağın libasının əndazəsi və xörəyinin vaxtı-vədəsi yox idi. Ağlına gələn hər cür şey istədiyi vaxtda hazır olmasa idi çağırıb, bağırıb, özünü yerdən yerə vururdu. Tərbiyət aləmindən bixəbər olan anası da istər zərərli, istər faydalı olsun, balasının hər bir istəyini və arzusunu əmələ gətirməkdən müzayiqə etməzdi. Amma o biri bacı oğlunu ağuşi-tərbiyədə saxlayıb pərvəriş verdikcə və analıq məhəbbətini əmələ gətirdikcə, yenə balasına nəsihət və tənbəh etməkdən geri durmazdı. Əvvəlincinin oğlu çox yeməkdən zəif olub. Çox yatmaqdan tənbəl, tərbiyəsiz və elmsiz qaldı. Amma ikinci bir çalışqan və zəhmətsevən uşaq oldu ki. Böyüdükcə elm və tərbiyə sayəsində ata və anasına, vətənə, millətə və dövlətə böyük xidmətlər etdi”.

İkinci hekayəni biz “Analar bəzəyi” adlandırmaq istərdik. Hekayənin məzmunu belədir: dövlətli bir xanım qonşuluqda yaşayan kasıb qadının evinə gedir. Dövlətli xanımın bu gəlişdən iki məqsədi var: həm qiymətli paltarlarını: üzüyünü, özünə yüklədiyi daş-qaşı, zərü-zibanı nümayiş etdirsin, həm də qonşu qadının bəzək şeylərinə baxsın.

Dövlətli xanım evə girən kimi kasıb arvada:

-Bəs sənin bəzəyin yoxdur? – deyə müraciət edir. Ev sahibi “bir az səbr ediniz” – deyir. Dövlətli xanım elə güman edir ki, indi sandıqlar açılacaq, qızıl bilərziklər, parıltısından göz qamaşan daş-qaş,ağır boyunbağılar, qat-qat mirvarilər, ortalığa qoyulacaqdır.

Bu zaman ev yiyəsinin məktəbdən gələn iki uşağı otağa daxil olub, mərifətlə salam verir, ədəblə oturur.

Kasıb qadın balalarını göstərib fəxrlə deyir:

- Mənim bəzəyim bunlardır.

Müəllif burada “qadının ziynəti cəvahirat deyil” ideyasını təbliğ edir və belə bir nəticə çıxarır: “Hüsi əxlaqə, ədəb və tərbiyəyə vaqif olan validələr balalarının təlim və tərbiyəsinin özünün bəzənməsindən vacib bilərlər”.

Zahiri bəzək ilə daxili gözəlliyin müqayisəsi, “anaların bəzəyi” XX əsrin əvvəllərində pedaqoji fikri məşğul edən mühüm problemlərdən birinə çevrilmişdi. R.Əfəndiyev, F.Köçərli, M.Ə.Sabir və dövrün digər ziyalıları bu haqda öz fikirlərinin dövri mətbuatda az-çox ifadə etmişlər. İnqilabçı şair M.Ə.Sabir “Analar bəzəyi” adlı şeir də yazmışdır. Şair bu lirik əsərində belə nəticəyə gəlmişdir ki, anaların bəzəyi cəvahirat yox, ədəbli, tərbiyəli uşaqlarıdır.

“Bəzək, bəzək ki, deyirlər – cəvahirat deyil.
Cəvahirat bu gün zinəti-həyat deyil.
Həqiqi validənin ən şərəfli bir bəzəyi –
Ədəbli, uslu cocuqdur, təcəmmülat deyil”.

İnsan şəxsiyyətinin formalaşmasında əsas amillərdən biri də məktəbdir. M.T.Sidqi məktəbə çox yüksək qiymət verirdi. O, əsl pedaqoq kimi məktəbin şərafətinin başqa bir əsərində belə təsvir edir: “Məktəb nədir? Məktəb bizim elm və maarifimizin vasitəsidir... Məktəb cəhalət

dərdinin dərmanı və mərifət bağının xiyabanıdır ki, həmişə cahilləri alim və divanələri aqil eylər. İllərcə məktəbə gedib tərbiyə və ədəb kəsb etməyən kimsələr və məktəbdə ömür keçirib elmlərdən və fənlərdən bəhrəmənd olmayan şagirdlər rəngarəng güllər və çiçəklər ilə dolu bir bağçada gəzib dolanan kora bənzərlər...

Məktəb bir cismə bənzər ki, onun ruhu müəllimdir".

Məktəbdə təlim və tərbiyə işində müəllimin rolunu yüksək qiymətləndirən Sidqi eyni zamanda müəllimin də qraşısında ciddi tələblər qoyurdu. Onun fikrincə, müəllim, birincisi, "ülum və fününə dara" (dərin elmi biliyə malik), ikincisi, "adabi-elm və tərbiyəyə sahibi-vuquf" (elmi təlim etməyin və tərbiyə və tərbiyə verməyin üsullarından xəbərdar) olmalıdır.

Məsələnin bu şəkildə qoyuluşu ilə Sidqi öz dövrünün mədəni həyatında ciddi problemə - "Uşağın təlim və tərbiyəsini kimə tapşırmaq olar?" məsələsinə toxunurdu.

XIX əsrin sonu və XX əsrin əvvəllərində dərin mənalı və çox qiymətli əsərləri ilə azərbaycanlı gənclərin diqqətini cəlb edən Mirzə Əbdürrəhim Talıbov da bu məsələyə toxunmuş, "Məsalikel möhsinin" əsərində "Savadsız müəllimdən uşaqların təlim və tərbiyəsini gözləmək – dəmirçidən saatsazlıq tələb etmək kimidir" demişdir.

XX əsrin əvvəllərində Azərbaycanın digər görkəmli pedaqoqları da bu fikri təkrar etmişlər. Maraqlıdır ki, "Gənc nəslin tərbiyəsi ən bacarıqlı tərbiyəçilərə həvalə edilməlidir" qənaətində olan S.M.Qənizadə də 1906-cı ildə məqalələrindən birində M.Ə.Talıbovun fikrini, demək olar ki, həm təkrar, həm də inkişaf etdirmişdir: "Tərbiyə işi ən çətin işlərdən biridir ki, onu doğruca yol ilə icra etmək üçün elm və təcrübə lazımdır... zərif, girənbaha saat əgər nasaz olarsa, saatsaz yanına aparmaq gərək və illa belə saatı dəmirçi və ya nalbənd yanına aparan olarsa, ona axmaq və səfeh deyərlər" (bax: "Azərbaycan maarifçilərinin əsərlərində əxlaq məsələləri", Bakı, 1964, səh.13).

Məhəmməd Tağı Sidqi XIX əsrin 90-cı illərində xalqımızın mədəni həyatında mühüm rol oynamışdır. Sevimli sənəti müəllimlik olan Sidqinin ədəbi və pedaqoji irsi indiyədək layiqincə öyrənilməmişdir. Sidqinin "Tərbiyə" məktəbinin tarixini, pedaqoji fikirlərini dərindən tədqiq etmək, əlyazma dərsliklərini və tədris vəsaitlərini əsaslı şəkildə öyrənmək işi hələ irəlidədir. Bu pedaqoji elmimizin əsas vəzifələrindən biri olmalıdır.

Böyük müəllimə həsr olunan bu kiçik məqaləni onun dahi şair A.S.Puşkin haqqında dediyi sözlərlə tamamlamaq istəyirik: "Elm və ədəb rövnəqinə ömür sərf edənləri və insaniyyət aləminə xismət göstərənləri və ülum və maarifin rəvac və intişarına çalışanları mədəni xalqlar heç vaxt unutmazlar".

**"Azərbaycan məktəbi" jurnalı,**
**1965, № 5.**



# XOCALI ŞƏHİDLƏRİ ANILDI

**Röya Qəniyeva,**
*Bakı şəhəri, Yasamal rayonu,*
*153 nömrəli tam orta məktəbin müəllimi*

Dağlıq Qarabağ separatizm və terror yuvasına çevriləndən sonra strateji cəhətdən ən əhəmiyyətli ərazi Şuşa və Xocalı sayılırdı. Onları ələ keçirmək ermənilərin mənfur planlarının əsasını təşkil edirdi. Şuşa işğal olunduqdan sonra Xocalı tək qaldı. Ona görə də, separatçılar bütün güclərini Xocalıya yönəltdilər və nəhayət 1992-ci il fevralın 25-dən 26-na keçən gecə Xocalı faciəsini törətməyə nail oldular. Bu faciə nəticəsində 613 nəfər günahsız adam qətlə yetirilmişdi, onların 63-ü uşaq, 106-sı qadın, 70-i qoca və qarı olmuşdur. Düşmən gülləsindən 76-sı uşaq olan, 487 nəfər yaralanmış, 1275 nəfər əsir götürülmüşdür.

Xocalı saoyqırımını çox çətin şəraitdə mətbuatda ilk dəfə Azərbaycanın Milli Qəhrəmanı Çingiz Mustafayev işıqlandırmışdır. İndi bütün dünyada onun çəkdiyi video-lentlərdən istifadə olunur. Çingiz əsl qəhrəmanlıq göstərmişdir.

Fevralın 26-da Yasamal rayonu 153 nömrəli tam orta məktəbdəki anım tədbirinə yığışanlar o dəhşətli gecə haqqında az şey bilmirdilər. Çünki indi bütün dünya Xocalı qətliamı ilə yaxşı tanışdır. Bir anlıq sükutdan sonra iştirakçılara Xocalı haqqında ətraflı məlumat verən məktəb direktoru Təranə Paşayeva dedi: “O illərdə Qarabağın taleyi Xocalıdan asılı idi. Xocalı, yalnız hərbi strateji mövqeyinə görə deyil, həm də tarixi əhəmiyyətinə görə Azərbaycanın mədəni həyatında mühüm yer tuturdu. Azərbaycan Respublikası Ali Sovetinin 26 noyabr 1991-ci il tarixli, 279 – XII nömrəli Qanununa əsasən DQMV ləğv edilərək Xocalı şəhəri



və Əskəran rayonunun bazası əsasında Xocalı rayonu yaradılmışdı. Xocalı rayonu şimaldan Ağdam, şimal-şərqdən Kəlbəcər və Laçın cənubdan Şuşa, cənub –qərbdən isə Xocavənd rayonları ilə həmsərhəddir. Müharibə zamanı Xocalı üzük qaşı kimi dairəyə alınmışdı, hər tərəfdən yollar bağlanmışdı. Oraya yalnız helikopterlərlə gedib-gəlmək olurdu.

Xocalı şəhəri Xankəndindən 10 km aralıdadır. O, Ağdam-Şuşa və Əskəran-Xankəndi yollarının arasında yerləşir. Xocalı rayonunun ərazisi 926 kv. km-dir. Bakıdan Xocalıya qədər olan məsafə 372 km-dir. Xocalı rayonunun tərkibinə 1 şəhər, 2 qəsəbə, 51 kənd daxil idi.

Xocalıya basqından sonra şəhərə od

vurulmuşdu. İşğal nəticəsində 800 ədəd 1 mərtəbəli, 830 ədəd 2 mərtəbəli fərdi yaşayış evi, eləcə də yardımçı binalar, meyvə anbarları yandırılmış, talan olunmuşdur. Yenicə binası qoyulmuş Xocalı tam orta məktəbinin tikintisi yerlə yeksan edilmişdir.

Onlar abidələri də vəhşicəsinə dağıtdılar. Xocalı rayonu ərazisində XVIII əsrdə Qarabağ xanı Pənahalı Xan tərəfindən tikilən Əskəran qalası ermənilər üçün göz dağı idi. 1810-cu ildə Rusiya ilə İran arasında sülh danışıqları bu tarixi qalada aparılmışdı. Əskəran sözünün mənası da "Qədim Aran" deməkdir. Bu o deməkdir ki, onun da binasını türklər qoymuşdu.

Azərbaycan Prezidenti İlham Əliyev dünyanın ən mötəbər məclislərində Xocalı soyqırımı haqqında məlumat vermişdir. Hazırda Xocalı soyqırımının tanınması Azərbaycanın xarici siyasətinin əsas istiqamətlərindən biri kimi müəyyənləşdirilmişdir. Azərbaycandan başqa, Xocalını faciəsini tam səviyyədə qətliam kimi Pakistan və Sudan parlament səviyyəsində Meksika, Kolumbiya, Çexiya, Bosniya və Herseqovina, Cibuti, Peru, Honduras, Panama, İordaniya, Rumıniya və Şotlandiya tanıyır. İndiyədək ABŞ-ın 22 ştatı Xocalını qətliam kimi tanıyan sənəd qəbul edib. Bu hadisə Azərbaycanda "Xocalı soyqırımı" və "Xocalı faciəsi" kimi, digər ölkələrdə isə "Xocalı qətliamı" kimi anılır.

Dünya bilməlidir ki, bu cinayət təkcə Azərbaycan xalqına qarşı deyil, həm də bütün sivilizasiyaya, dünyaya, bəşəriyyətə qarşı yönəldilmişdir. Tam əminik ki, 1948-ci il 9 dekabr "Soyqırım cinayətinin xəbərdarlıq edilməsi və cəzalandırılması" konvensiyasına uyğun olaraq qatillər layiqli cəzasını alacaqlar.

Çox mənalı, təsirli və lüzumlu keçən



tədbiri yekunlaşdıran T.Paşayeva tədbirə qatıldıqlarına görə "Azərbaycan məktəbi" jurnalının əməkdaşlarının tədbirdə iştirakından razı qaldığını bildirdi. O, çıxışını belə yekunlaşdırdı: "Azərbaycan xalqı son 200 il ərzində erməni millətçi – şovinistlərinin soyqırım siyasətinə məruz qalır. XX əsrin faciəsi olan Xocalı soyqırımı bu aqressiv siyasətin ən kuliminasiya nöqtəsidir. Cinayət cəzasız qalmayacaqdır. Azərbaycan xalqı gec-tez erməni faşistlərindən qisasını alacaqdır. Xocalı soyqırımını heç vaxt unutmaq olmaz".

İştirakçılar Xocalı faciəsinin günahsız qurbanlarının əziz xatirəsini bir daha ehtiramla yad etdilər, bütün şəhidlərimizə allahdan rəhmət dilədilər.

Estetik təsirə malik tədbir şagirdlərin hazırladıqları bədii kompozisiya ilə başa çatmışdır.